**«Gülüstani-İrəm» əsərinin ön sözü**

Azərbaycan ədəbiyyatının görkəmli simalarından biri olan A. Bakıxanov istedadlı alim, filosof və şairdir. O, qiymətli elmi əsərlərilə Yaxın Şərq və o cümlədən Azərbaycan elminə çox mühüm yeniliklər gətirmişdir. A. Bakıxanov elmi və fəlsəfi əsərlərində öz vətəninə və xalqına xidmət etmək məqsədini izləmişdir.

A. Bakıxanov 1841-ci ildə özünün məşhur «Gülüstani-İrəm» əsərini yazıb qurtarır. Bu əsər zəngin tarixi mənbələrə istinadən yazılmışdır. - «Gülüstani-İrəm» A. Bakıxanovun tarix elminə baxımını göstərən qısa, dolğun məzmunlu bir müqəddimə ilə başlanır. Burada müəllif keçmiş tarixi dövləri bəşəriyyət üçün zəngin həyat təcrübəsi kimi qiymətləndirir, indiki və gələcək həyatı yaxşı qura bilmək məqsədilə bu təcrübədən istifadə etməyi lazım görür. Müqəddimədə habelə Azərbaycanın və Dağıstanın qısa coğrafi təsviri, bu ölkələrin xalqlarının mənşəyi, dili və dinləri haqqında məlumat verir ki, əsərlə tanış olanlar bu hissəni əsərin ən qiymətli cəhətlərindən biri hesab edirlər. Azərbaycan və Dağıstan xalqlarının tarixini A. Bakıxanov mühüm tarixi hadisələrə əsasən beş dövrə ayırır və buna uyğun olaraq əsərini də beş fəslə bölür.

Birinci fəsildə «Tarixi-təbəri», «Tarixi-Güzidə», «Nizamüt-təvarix» kimi qədim Şərq mənbələrinə əsasən Nuhun tufanı, onun övladları, Yasəf, Yəcuc və Məcuc, skiflər, massagetlər, xəzərlər, Sasani hökmdarlarının Azərbaycandakı hakimiyyəti və sair haqqında məlumat verilir.

İkinci fəsil Azərbaycan və Dağıstanın ərəblər tərəfindən istila olunması, ərəblərin bu ölkələrdə hakimiyyəti, vətənin istiqlaliyyəti uğrunda Babəkin üsyanı kimi məsələlərə həsr olunmuşdur. Lakin Babək üsyanı haqqında verilən məlumat səthidir.

Üçüncü fəsil hülakülərin və teymurilərin hakimiyyəti dövrünü işıqlandırır və şirvanşahlar haqqında məlumat verir. Bu fəsildə, eyni zamanda, ağqoyunlular və qaraqoyunlular haqqında, məşhur alim Xacə Nəsirrəddin Tusinin fəaliyyəti haqqında maraqlı məlumata da rast gəlirik.

Dördüncü fəsil Səfəvi padşahlarının və onların süqutundan sonra taxta çıxan Nadir şah Əfşarın hökmranlıq illərinə həsr edilmişdir. Bu fəsildə Türkiyə və Rusiya qoşunlarının Dağıstan və Azərbaycana hücumları, Təbrizin yaxınlığında gedən məşhur «Çaldıran» döyüşü haqqında zəngin məlumat verir.

Beşinci fəsil Nadir şahın ölümündən «Gülüstan» sülhünə qədər 60 illik bir dövrü əhatə edir. Bu fəsildə Azərbaycan xalqlarının təşəkkülü və onların qısa tarixi, xanlıqlar arasında gedən aramsız çəkişmələr və ayrı-ayrı xanların siyasi fəaliyyəti, Ağa Məhəmməd şah Qacarın Azərbaycana hücumu, xanlıqların Rusiya hökuməti tərəfindən istilası təsvir olunur.

«Gülüstani-İrəm» Azərbaycanın məşhur alim və şairləri haqqında qısa məlumat verən və təzkirə xarakteri daşıyan kiçik bir əlavə ilə bitir.

50 ildən artıq bir müddətdə işıq üzü görməyən belə bir qiymətli əsərin yenidən nəşr olunmasında zəhməti olanların əməyi böyük bir təqdirə layiqdir.

**Hörmətlə: Ramiz Ağayev**

# MÜQƏDDİMƏ

## *ŞİRVAN VƏ DAĞISTAN VİLAYƏTLƏRİNİN HÜDUD VƏ ƏRAZİSİ, ADLANMALARININ SƏBƏBİ, ƏHALİSİNİN MƏNŞƏİ, DİLLƏRİ VƏ DİNLƏRİ HAQQINDA*

Şirvan vilayəti, şərq tərəfdən Xəzər dənizi ilə, cənub-qərbdən onu Muğan və Ermənistan vilayətlərindən ayıran Kür çayı ilə, şimal-qərbdən Qanıq (Alazan) çayı ilə, İlisu nahiyəsindən keçən qeyri-müəyyən xətlə, Qafqaz sıra dağları, Kürə və Təbərsəran nahiyələrini Qaziqumuq və Qaytaq məmləkətlərindən ayıran dağ silsiləsi ilə və oradan da Dərvaq çayı yatağından onun Xəzər dənizinə qovuşduğu yerə qədər uzanan sahə ilə məhduddur. (Şirvan) Kür dəhnəsindən Dərvaq dəhnəsinə qədər təqribən 39°-42°-yə qədər şimal en dairəsi, Qanıq çayı dəhnəsindən Əfşəran burnuna qədər 64°-68°-yə qədər şərq uzunluq dairəsi üzərində vaqedir. Düz xətlə hər bir dərəcənin məsafəsi təqribən 15 coğrafi mil - yeddi rus vesti qədər və ya bir ağac yarımdır. Hər ağac - üç islami mil uzunluqdadır. İslami mil - doxsan altı min barmaq boydadır. Bir barmaq da orta boylu altı arpa uzunluqdadır (arpaların birinin arxası o birinin qarnına bitişik surətdə düzülmək şərtilə).

Beləliklə, indiki Şirvan məmləkəti Səlyan, Şəki, Bakı, Quba, Dərbənd, Təbərsəran, Kürə, Samur nahiyəsi və İlisunun aşağı bir qismindən ibarətdir. Bunlar, ölkənin ən gözəl və ən geniş vilayətlərindəndir.

Qafqaz dağlarının böyük bir silsiləsi onun arasından üzü cənub-şərqə düşübdür ki, xoş havalı yaylaqları, otlaqları, şirin bulaqları və hər iki tərəfə axan çoxlu çayları vardır.

Əksəriyyət üzrə, dəniz və Kür çayı sahillərində geniş və məhsuldar çöllərdə bol taxıl zəmiləri, meşələr, bağlar və sair vardır. Dəniz kənarında olan bu ölkə, Rusiya və İran dövlətləri və müxtəlif Dağıstan tayfaları arasında olduğundan, ticarət işlərində də mükəmməl tərəqqi edə bilər.

Təqvimülbüldan[1] müəllifi deyir ki, Şirvanı Sasani sülaləsindən olan Ənuşirəvani-Adil bina etmişdir, bu cəhətdən onun adı ilə tanınmışdır. ”Ənu” ləfzi çox işlənmək nəticəsində atılmışdır. Bəziləri deyirlər ki, Şirvanın əsli Şirvand, yəni şir olan yer olub, sonra Şirvan olmuşdur. Moisey Xorenskinin[2] tarixində və

---

[1] Məşhur ərəb tarixçisi Əbülfidanın əsəridir. Hicri 672-ci (=1273) ildə anadan olmuş və 732-ci (=1331) ildə vəfat etmişdir. Onun ən məşhur kitabları ”Əlmüxtəsər fi-tarixülbəşər” ilə” Təqvimülbüldan” adlı əsəridir.

[2] Moisey Xorenski – V əsr tarixçisidir. Qədim dövr tarixi yazan erməni müəlliflərindən ən görkəmlisi hesab olunur. Üç hissədən ibarət olan əsərində ən qədim dövrlərdən başlayaraq V əsrin birinci yarısına qədər ermənilərin tarixini sistematik surətdə yazmışdır. Onun bu tarix kitabı bir çox xarici dillərə, o cümlədən rus dilinə də tərcümə olunmuşdur.

Zendavesta kitabında Şerovaner deyə adlanır. Əmin-Əhməd[3] ”Həft-iqlim” adlı əsərində deyir ki, Şirvan, əvvəllərdə bir şəhərin, sonra isə bir ölkənin adı olmuşdur.

Çamçiyan[4] ”Ermənistan tarixində” Şirvan vilayətini Əğvan adlandırır və deyir ki, onunla Alan, yəni Dağıstan arasındakı sərhəd əvvəl Alğon səddi və sonra da, Dərbənd səddi olmuşdur.

Türkmən Həsən padişahın oğlu Sultan Yaqub hicri 892-ci (=1487) ildə ermənilərin xəlifəsi (baş keşişi) Simeona verdiyi fərmanda, Şirvanı Əğvan deyə adlandırmışdır.

Dağıstan vilayəti 42°-dən 44°-yə qədər şimal en dairəsi və 63°-dən 66°-yə qədər şərq uzunluq dairəsindədir. Şərq tərəfdən Xəzər dənizi ilə, şimaldan Terek çayı ilə, qərbdən Çərkəz və Os (Osetin) mülkü ilə, cənub-qərb tərəfdən Gürcüstanla və cənub-şərqdən Şirvanla məhduddur. Bu ölkənin şimal-şərq qismi gözəl yerlərə malik olub, yaşayış vasitəsinin bolluğu ilə məşhurdur Bu hissə, xüsusilə dəniz və Terek sahillərində, çayların bolluğu və gediş-gəlişin çoxluğu üzündən, əkinçilik məhsulatının zənginliyi və ticarət vasitəsinin genişliyi ilə tanınır. Buranın o biri dağlıq qismi, bəzi məhsuldar vadi və yaylaqlara malik olsada, ümumiyyətlə yaşamaq üçün çox çətin və məşəqqətlidir.

Bu vilayət Məsudinin[5] rəvayətinə görə, hicri 332-ci (=944) ildə aşağıdakı üç ölkədən ibarət olmuşdur:

1) **Qaytaq** - bura Dərbəndin şimal tərəfindədir. Hökumət mərkəzi Səməndər, yəni Tarxudur ki, onu Nuşirəvan bina etdirib. Səməndər Xəzər xaqanının paytaxtı olmuş idi. Lakin Səlman ibni Rəbiə buranı aldıqdan sonra, xaqan öz paytaxtını Atilə köçürdü. Səməndər əhalisinin çoxu xəzərlər, müsəlmanlar və yəhudilərdən ibarət olmuşdur...

2) **Sərir (taxt)** - Dərbəndin şimal-qərbində, üç mənzillik məsafədədir. On iki min ailədən ibarət olmuşdur. Sərir padişahı Filanşah adlanıb, nəsara (xristian) dinində idi. Bəzilərinin dediyinə görə, Sasani sülaləsindən olan Yəzdicird, ərəblər tərəfindən məğlub edildikdən sonra Xorasana getdi. O, öz qızıl taxtını başqa qiymətli şeylərlə bərabər Bəhram-Çubin nəslindən olan bir mənsəb sahibinə verərək, Cibali-Fəthə, yəni Qafqaza göndərdi. O da indi Sərir adlanan mülkü ələ keçirib öz nəslini tərk etdi. Nizaminin dediyinə görə, buranın Sərir adlanması

---

[3] Əmin-Əhməd Razi - ”Həft-iqlim” adlı məşhur əsərin müəllifidir. Bu əsər köhnə üzrə yeddi iqlimin (qitənin) məşhur şəhər və qəsəbələrini və hər iqlimdə yetişmiş olan adlı-sanlı adamları bildirir. Kitab, hicri 1002-ci (=1593) ildə yazılmışdır.

[4] Çamçiyan – XVIII əsr erməni istorioqrafiyasının görkəmli nümayəndəsidir. Erməni və əcnəbi mənbələrdən istifadə edərək, erməni tarixini ta ilk dövrlərdən başlayaraq XVIII əsrin axırına qədər yazmışdır. Çamçiyanın ”Ermənistan tarixi” bu əsəri, üç cilddən ibarət olaraq 1785-1787-ci illərdə Venesiya şəhərində çap olunmuşdur.

[5] Məsudi - ərəb tarixçilərinin ən böyüklərindən biridir, hicri III əsrin axırlarında Bağdad şəhərində anadan olmuş və 346-cı (=957/8)ildə Misirdə vəfat etmişdir. Əsərlərindən ən məşhuru ”Mürucüzzəhhəb”adlı kitabdır.

Keyxosrovun taxt və tacından nəşət etmişdir; çünki bu taxt və tac burada bir mağaranın içində idi. Bəzilərinin dediyinə görə, bu ölkənin hakimləri qızıl taxt üzərində oturub hökm verdikləri üçün bu ölkəyə Sərir adı verilmişdir. Sərir hökmdarı rəiyyətini öz qulu hesab edərdi və dağlılar çöllülərə nisbətən daha şücaətli olduqlarından xəzərlər üzərinə basqın edərək onları qarət edərdilər. Səririn yaxınlığında Zirihgəran mülkü olub, hazırda Köbəçi adlanır. Əhalisi müsəlman, nəsara (xristian) və yəhudidir.

3) **Dağlıq Qumuq** - Səririn şimalında və Qaytağın qərbindədir. Əhalisi nəsaradır (xristiandır). Padişahları olmadığından öz rəislərinə itaət edərdilər. Çox məhsuldar və abad olan Alan ölkəsinə buradan gedərdilər. Kəndlər bir-birinə yaxın olduğundan, bir xoruz banlayanda bütün kəndlərin xoruzları banlardı. Alan padişahının ləqəbi Kərkərandac və ya Kərkəndac, arvadının adı isə Məğəs idi. Otuz min atlı qoşunu var idi. Babalarından biri Abbasilər xilafətinin birinci əsrində nəsara (xristian) dinini qəbul etdi. O vaxta qədər onlar atəşpərəst idilər. Hicri 320-ci (=932) ildə onlar nəsara (xristian) dinini tərk edib, Rum imperatorunun onlara göndərdiyi keşişləri ölkələrindən çıxarıb qovdular. Alan ilə Cibali-Fəth (Qafqaz) arasında, körpülü bir çay kənarında olan dağın başında bir qala vardır ki, Hisni-Babi-Alan (Alan qapısının qalası) adlanır. Dağdan keçmək ancaq buradan mümkün idi. Bu qala qalaların ən möhkəmi idi. Fars şairləri bunu çox tərif etmişlər. O, İsfəndiyarın əmrilə tikilmişdir.

Müslimə ibni-Əbdülməlik Qafqazın bir çox yerini itaəti altına aldıqdan sonra ərəb mühafizlərini bu qalada qoydu. Onlara Sərhəd boyunda olan Tiflis şəhərindən maaş və ərzaq göndərilirdi. Baba-Laziqə də Gürcüstan nahiyəsində olub, padişahı müsəlman idi. Alanın qərb tərəfində Kəşək mülkü Cibali-Fəthdən Pont dənizinə, yəni Qara dənizə qədər uzanıb gedir. Buranın əhalisi yaraşıqlı bir tayfadır. Burada tala adlanan və Misir qumaşından daha qiymətli olan bir qumaş toxuyurlar. Buradan Trabizona tacirlər dəniz vasitəsilə gedib-gəlirlər. Alanların hücumundan qorunmaq üçün dəniz kənarında qalaları vardır. Kəşək tayfası çox, lakin dağınıqdır. Əgər bunlar ittifaq etsəydilər hamıya qalib gələrdilər. Onların ölkəsinin o biri tərəfi Səbbüldan (yeddişəhər) ölkəsidir...

Kəşək tayfası çərkəzlərdir, onları qədim rus tarixçiləri Kasoq, Os (Osetin) tayfasını isə, Kasaq adlandırırlar.

Məhəmməd Rəfi Əbrürrəhim oğlu Şirvaninin[6] öz tarix kitabında qeyd etdiyinə görə də, burada üç məmləkət vardır: 1) Dəşt; 2) Zirihgəran və 3) Avar. Avar yaşayış və nəqliyyat yolları etibarilə ölkələrin ən çətini hesab edilir. Çamçiyan öz tarixində bu vilayətdə dörd ölkə olduğunu göstərir: 1) Alan, 2) Basalas, 3) Haptaq və 4) Hun. Dərbəndnamə müəllifi, İsfəndiyar və Nuşirəvanın

[6] Məhəmməd Rəfi Əbdürrəhim oğlu Şirvani – XVI əsrin ikinci və XVII əsrin birinci yarısında yaşamış Azərbaycan alimidir. Azərbaycan və Dağıstan tarixinə aid bəzi əsərləri vardır. ”Risaleyi-Rüstəm xaniyyə” adlı kitabını Dağıstan xanlarından Rüstəm xanın adına yazmışdır.

təqsimatına görə, buranı dörd məmləkətə bölmüşdür: 1) Gəlbax; 2) Tumanşah mülkü; 3) Qaytaq və 4) Dağlıq Qumuq.

Bu təqsimatın hamısı indiki vəziyyətlə də uyğundur.

*Birinci məmləkət* - Alan və ya Sulağın o tərəfindəki Qumuq Gəlbaxı, Mıçıqıç və Kiçik Qabardıdan ibarət olmuşdur.

*İkinci məmləkət* - Tumanşah mülkü, ya Haptaq, ya da, birinci bölgüyə görə, Qaytaq ölkəsidir ki, Şamxal və Üsmi mülklərinin aşağı qismini təşkil edir.

*Üçüncü məmləkət* - Dağlıq Qumuq, ya Hun, ya da, Avar ölkəsidir ki, Qaziqumuq və Avarıstan mülkünü təşkil etmişdir.

*Dördüncü məmləkət* - Baslas, ya Zirihgəran, ya Sərir, ya da, axırıncı bölgüyə görə, Qaytaq ölkəsidir ki, Qaytağın yuxarı hissəsindən, Aqquşa və Sürhi mahallarından ibarətdir.

Başlı şəhərinin adı Baslas sözündən dəyişmədir. Qumuq, Bətləmyusun[7] dediyinə görə, Kam və ya Kamak tayfasının qalıqlarıdır. Bu mülk onların adı ilə adlanmışdır. Rözətüssəfa[8] müəllifinin və başqa tarixçilərin dediyinə görə, onlar Yafəsin oğlu Kamak və ya Kamarı nəslindəndirlər. Bunlar Yafəsin Bulğar adlı oğlunun adını daşıyan yerdə sakin idilər. Ehtimala görə, o yer Kiçik Qabardı ölkəsində olan Balğar adlı yerdir. Balğar və onun ətrafında olan Çəgəm, Baxsan, Bizəngi əhalisi və başqaları indi də türk dilində qumuq ləhcəsində danışırlar. Məlum olur ki, bunlar bir tayfadırlar. Bu məsələni Həbibüssiyər[9] və sair kitablar da təsdiq edir.

Bu mənbələrin yazdığına görə, Əmir Teymur Toxtamış xanı məğlub etdikdən sonra öz qoşununun başçılarına Qumari çayının kənarında ənam vermiş və Qum boğazında qışlamışdır. Qumari adlanan bu çay Terek çayı yaxınlığında olub, indi türkcə Kumi və rusca Kuma adlanır. Əlifin vava və kaf, qaf və ğəyn hərflərinin bir-birinə çevrilməsi uzaq deyildir. Təsəvvür etmək olar ki, Qaytaq və Həptaq ya bir mənada olub, ya da bir-birindən dəyişmədir, ya da ki, Tağ mütləq Dağıstanın adı imiş. Şamxal mülkünə ”həp” - yəni hamı - sözü əlavəsilə ”həptaq”, Üsmi mülkünə də, Keyxosrov və sair Kəyan padişahlarına nisbətilə, ya da böyük və uca mənasına gələn ”key” sözü əlavəsilə Keytaq demişlər. Sözlərin işlənməsində ta dala, kaf və ğəyn hərfləri də qafa və biləks dəyişilmişdir.

---

[7] Bətləmyus (Ptolomey) məşhur Yunan riyaziyyatçısı və astronomlarındandır, II əsrin birinci yarısında anadan olmuşdur. ”Coğrafiya” adlı əsərində Albaniya və Ermənistan haqqında da məlumat vardır.

[8] Şərqdə yetişən ən məşhur tarixçilərindən Mirxondun əsəridir. 1433-cü ildə Bəlxdə anadan olmuş və 1498-ci ildə Heratda vəfat etmişdir. Mirxondun 7 cilddən ibarət olan ”Rövzətüssəfa” adlı əsəri, teymurilər dövrünün sonlarında yazılmış ən mühüm tarix kitabıdır. ”Rövzətüssəfa” kitabı, bir hesabla, Şərq tarixinin bir ensiklopediyasıdır.

[9] ”Rövzətüssəfa” müəllifi Mirxondun nəvəsi Xandəmirin əsəridir. Xandəmir özü də məşhur tarixçilərdəndir. 1475-ci Heratda anadan olmuş və 1535-ci ildə Gücəranda vəfat etmişdir. Xandəmir bir sıra tarixi əsərlər yazmışdır ki, bunlardan ən böyük və ən qiymətlisi ”Həbibüssiyər” adlı kitabıdır. Xandəmir ”Həbibüssiyər”də dünyanın yaradılışından Şah İsmayıl Səfəvinin vəfatı tarixinə qədər olan hadisələri təsvir edir.

Hun tayfası haman Ğun adlanan tayfadır. Moisey Xorenskinin yazdığına görə, miladi tarixin V əsrində Xəzər dənizinin qərb sahilində sakin imişlər. İndi yeri məlum olmayan Varçan, bunların ən böyük şəhəri olmuşdur. Simaca kifir, qaniçən, talançı və cəsur olan bu tayfa, qədim zamanlarda Çin hüdudundan Qıpçaq çölünə və Xəzər dənizi ilə Qara dəniz arasındakı sahəyə gələrək, hədsiz zülmlər etmişlər. Bunların padişahı Atilla... müxtəlif tayfaları, hətta Macarıstanı da, özünə tabe etmişdi. Qostəntiniyyədən xərac alırdı. Hicri 454-cü ildə vəfat etdikdən sonra, övladı arasında gedən çəkişmələr nəticəsində Ğun dövləti dağıldı.

Miladi IV əsr tarixçilərindən Ammian Martsellinin[10] yazdığına görə, ğunlar öz üzlərini bıçaqla çərtirdilər ki, saqqalları çıxmasın. Onların əksəri bədşəkil, boynu yoğun olub, heyvana bənzəyirdilər. Bitkilərin yarpaq və köklərini və çiy əti yəhər altında qızdırıb yeyərdilər. Evləri yox idi, hətta onu istəmirdilər. Çöllərdə, meşələrdə və dağlarda keçinirdilər. Onların paltarı kətandan və heyvanat dərisindən olub, bədənlərində çürüyərdi. Özlərini isti-soyuğa, aclıq və susuzluğa vərdiş etdirərdilər. Ancaq camaat müşavirəsi olan zaman atdan enərdilər. Həya və əxlaq sahibi deyildilər. Talançı, qaniçən, qanun bilməyən, yalançı və dinsiz idilər. Atillanın yanında olan Rum səfirlərindən Prist belə nağıl edir: Biz onunla orduda görüşdük. Rum qeysərinin hədiyyələrini son dərəcə kibr və qürurla qəbul etdi. Bizə buyurdu ki, istirahət zamanı onunla bərabər yaşadığı yerə gedək. Qızlar uzun və ağ paltarlarda onu qarşılayıb, skif dilində şeirlər oxuyurdular. Hündür və uca bir yerdə çubuq hasarla əhatə edilmiş və ağacdan qayrılmış bir imarət var idi. O hər gün səhər çağı evinin qapısında oturub, xalqın divan işlərilə məşğul olurdu. Gündüz müxtəlif tayfaların elçilərini qəbul edib, gecə onlar ilə bərabər yemək yeyərdi. Qonaqlar üçün gümüş qablarda və qızıl camlarda, özü üçün isə ağac qablarda yemək-içmək gətirdərdi. Yeməkdən sonra Ğun şairləri gəlib onun zəfər və fütuhatından bəhs edən şerlər oxuyardılar. Bu zaman onun qoşunu şadlanar, qocalar isə davadan geri qaldıqları üçün həsrətlə ağlardılar...

Rum səfirlərindən bir nəfər onu (Atillanı) öldürmək istədi. Atilla bunu bilib, özü üçün təhqir hesab edərək, ona cəza vermədi. Ola bilsin ki, Atil çayı Atilla adından və ya Atillanın adı bu çayın adından alınmışdır.

Dağlılara ləzgi adının verilməsi, Laz qovmilə qarışmaları münasibətilə ola bilər. Lazlar miladın III əsri sonunda Kolxidada yaşayırdılar. Sərmat padişahı Qıpçaq çölündən gəlib, onları məğlub etdi. Lazlar V əsrdə albanlar və iverlər ilə bərabər Rum və İran arasında uzun müddət davam edən müharibələrə qarışırdılar. VI və VII əsrlərdə də bunların dövləti mövcud idi. Bunların padişahlarından Qubaz və Xoryan şöhrət sahibi olmuşlar. Bu tayfanın qalıqları indi də Qara dənizin cənub-şərqində sakin olub, yazılarında öz adlarını layiqi deyə yazırlar.

[10] Ammian Martsellin – Roma tarixçilərindəndir, 330-cu ildə anadan olmuşdur. ”Roma dövlətinin tarixi” adlı məşhur əsəri 96-378-ci illərin hadisələrini təsvir edir. Ammian Martselinin bu əsərində Azərbaycan haqqında da qiymətli qeydlər vardır.

Bir çox tarixçilər Ermənistan, İveriya, Kolxida və Albaniyanı bir-birindən ayıra bilməmişlər. Bu cəhətdən bəzi ixtilaflar meydana çıxmışdır...

Həbibüssiyər sahibinin yazdığına görə, Ermənistan ölkəsinə daxil olan Tiflis şəhərini, Həbib ibni-Səlma Osmanın xilafəti zamanında ələ keçirdi. Bura həmişə xəlifələrin ixtiyarında olmuşdur. Bunu, Tiflisdə ərəblər tərəfində zərb edilən dirhəmlər də göstərir.

İveriya dağlıq yerdə olub, Dağıstanın qərb tərəfindədir. Başaçıq (İmeretiya) da onun şərq hissəsindədir. Erməni tarixçiləri qədim gürcüləri ivros, yəni dağlı adlandırırlar.

Yaqutun[11] yazdığına görə, gürcülər hicri V əsrin sonlarına doğru, İrandakı iğtişaşdan istifadə edərək, Kürün sağ sahilində qətl və qarətə başladılar; daha sonralar, səlcuqi Sultan Məhəmmədin oğlanları, Sultan Mahmud ilə Sultan Məsud arasında gedən müharibə zamanı Tiflis şəhərini ələ keçirdilər.

Başaçıq (İmeretiya) düzlərini, Minqreliya və Quriyanı Kolxida hesab etmək olar. Şirvan və Dağıstan isə, birgə olaraq Albaniya olmuşdur.

Alan tayfası xüsusunda bu qədər məlumdur ki, onlar bu ölkənin sakinləridir və xüsusi padişahları olmuşdur. Alan və alban sözlərinin bir-birinə bənzəməsindən zənn etmək olar ki, biri o birindən alınmışdır. Albaniya rum dilində ağlıq mənasında olaraq azadlığa işarədir. Şirvan və Dağıstan ”Azadlar ölkəsi” adı ilə məşhurdur. Ammian Martsellinin yazdığına görə, Alan tayfası qədim Masaget nəslindən olmuşdur. Bunlar əvvəlcə Tatarıstandan gəlib Skif tayfasını Xəzər dənizinin şərq sahillərindən qovaraq buralarda yerləşmişlər. Skif tayfası Atil çayından keçib, Don ilə Tuna çayları arasında yerləri tutmuşlar. Onlar cəsarətlə, vəhşi xasiyyətlə və köçəri olan müxtəlif qəbilələrdən ibarət idilər. Cənub tarixçiləri o tərəflərin bütün qədim sakinlərini Skif adlandırırlar. Herodot[12] deyir ki, Skif gəncləri və Amazon qızlarının qarışmasından Sərmat tayfası meydana çıxmışdır. Lakin Qatterer[13] isbat edir ki, Sərmat tayfası İsanın anadan olmasından 80 il əvvəl, Asiyadan Avropaya gəlib, Don çayı ətrafında Skif tayfası ilə qarışmışdır; get-gedə Skif adı aradan çıxıb Sərmat adı məşhur olmuşdur. Alan tayfası da gəlib Sərmat tayfasını məğlub edərək onların yerlərinə sahib olmuşdu.

---

[11] Yaqut Həməvi – 1178 və ya 1179-cu ildə anadan olmuş və 1229-cu ildə Hələbdə vəfat etmişdir. Yaqut, şərqin ən məşhur müəlliflərindən biridir. O, tarix və coğrafiyaya aid bir sıra qiymətli əsərlər yazmışdır. Bu əsərlərdən biri də ”Möcəmülbüldan”dır. Səkkiz clddən ibarət olan bu kitab mükəmməl bir coğrafiya lüğətidir.

[12] Herodot - ən məşhur yunan tarixçisidir. Eramızdan əvvəl 480 və 425-ci illər arasında yaşamışdır. Herodotun kimmerilər və skiflərin şimaldan hərəkət etmələri, ticarət yolları, İran dövlətinin sərhədləri və satrapları, Azərbaycanda və onunla qonşu olan yerlərdə yaşayan qəbilələr haqqında verdiyi məlumat Azərbaycan tarixi üçün olduqca qiymətlidir.

[13] Qatterer – alman tarixçisidir. 1727-ci ildə anadan olmuş və 1799-cu ildə vəfat etmişdir. Məşhur əsərlərindən biri də ”Qədim dövrlərdən başlayan Ümumdünya tarixi” adlı kitabıdır.

Alan tayfası şəmşirpərəst dinində idilər. Qılıncı yerə sancıb ona səcdə edərdilər. Bir çox adət və ənənələri hun tayfası ilə bir idi. Prokopi[14] Alan tayfasını Masaget nəslindən və Böyük Get mənasında olan Masageti də Get və ya Qotf nəslindən hesab edir.

Həzəqil peyğəmbərin kitabında, 38-ci fəsildə, masoqlar Yafəsin oğlu Masoq nəslindən sayılır. Bunlar şimal-şərq tayfaları arasında məşhurdurlar. Ola bilsin ki, Masaget bu nəsldən və ya Maqos və Qət tayfalarının qarışmasından meydana çıxmışdır. Degin[15], alan sözünü alin, yəni dağlı sözündən sayır. Masagetlərdən bir tayfanı, qədim zamanda Altay dağlarında yaşadıqları üçün, belə adlandırmışlar.

Moisey Xorenski Alan tayfasını Qafqazın yaxınlığında göstərir. Alanlar, Bətləmyusun zamanından XIV əsrə qədər, Qafqaz dağlarının şimal-qərbində məşhur olmuşlar. Məsudinin yazdığına görə, Babi-Alan (Alan qapısı) gərək ki, Gürcüstanın Daryal adlı yerində olsun. Lakin Dərbəndnamə müəllifi deyir ki, Babi-Alan Alğon səddindədir. Bu səddi İsfəndiyar tikdirmiş, Nuşirəvan isə yenidən təmir etdirmişdir. Həmin səddin hasarı, darvazanın yeri və şəhərin xarabası Qubanın Şabran mahalında, Gilhinçayın sol kənarında, qalanın yeri isə həmin çayın sağ kənarındakı bir təpə üzərində indi də mövcuddur.

Bu sədd dənizdən başlayıb, adı çəkilən şəhərin yeri yaxınlığında olan Əlixanlı - ehtimala görə, əslən Alğonlı olmuş - kəndinin üst tərəfindən keçərək, Çıraq qalasına bitişir. Oradan da, üzərində böyük bir şəhərin xarabası olan Ata dağından keçərək, Qonaxkəndin üstündən Baba dağına doğru gedir.

Bu iki rəvayəti birləşdirərək demək olar ki, Babi-Alan (Alan qapısı) həm Gürcüstanda, həm də Şirvanda olmuşdur. Alan tayfası Qafqazın şimal tərəflərində yerləşdiyindən, onların cənuba hər iki tərəfdən hücum yolları var idi. Alan adı məşhur olduğu üçün, bir çox erməni kitablarında Qafqazın şərq tərəflərində yaşayan dağlıların hamısına bu ad verilir. Hətta Şirvan üstə olan Muğan səhrasının şimal qismi də, qədim kitablarda Alan səhrası adı ilə məşhurdur. Tarixçilərin yazdığına görə, Albanus və Qassı çayları arasında olan Alban şəhəri, yerin vəziyyəti və münasibətə görə, gərək Dərbənd şəhəri olsun. Albanus çayı Samur və Qassı çayı da Manas olub, Tarxu ilə Buynaq arasından axır.

Keçmiş uzun əsrlər belə, bu ölkədəki yer adlarının bəzisini hələ də, dəyişdirə bilməmişdir. Şamaxı şəhəri Kamaxı və ya Ksamaxı olmuşdur. Burada olan Qəbələ şəhəri Xabaladır ki, Bətləmyus da onların adını çəkir.

Quba ölkəsində Alpan adlı bir kənd vardır, alban sözündən dəyişmiş ola bilər. Bir dağın təpəsində çox qədim bir qala mövcuddur, onu Əşkəbus adlandırırlar. Firdovsinin "Şahnamə"dəki qeydinə görə, Əşkəbus türklərdən biri pəhlivan olub, xaqanın döyüşündə Rüstəm tərəfindən öldürülmüşdür. Həmdüllahın

[14] Prokopi – yunandır. V əsrin axırlarında anadan olmuşdur. İlk Bizans dövrünün ən məşhur tarixçisidir.
[15] Dekin – fransız şərqşünaslarındandır. 1721-ci ildə anadan olmuş və 1800-ci ildə vəfat etmişdir. Əsərlərindən ən məşhuru "Hunların. türklərin, moğolların və sair tatarların ümumi tarixi" adlı kitabıdır.

Məcməülbüldanda yazdığı əlamətlərə görə, Zərqubad kəndinin də, Firizqubad şəhəri olmasına ehtimal vardır. Sədan kəndi Sədani-Bakuyi adından alınmışdır. Xəzərgan adlı yer də İskəndərnamədə yazılan Xəzranguh ola bilər. Qubadakı Cağatay və Dağıstandakı Cənkutay kəndlərinin adları da moğol sözü olub, oraların qədim sakinlərinin adları ilə adlanmışdır. Mıçıqıçdakı Bayan kəndinin adı da Avarın məşhur xanı Bayanın adından götürülmüşdür. Nuxu şəhəri, adının münasibəti və yerinin vəziyyətinə görə, həmin Naxiya və ya Nağiya şəhəridir ki, qədim tarixlərdə Şirvan şəhərlərindən sayılırdı.

Qədim dövrlərdə Qaspi adlı tayfa dəniz kənarında və Kürün sağ sahilində sakin idi. Rumlular arasında bu dəniz həmin tayfanın adı ilə adlanmışdır. Sahilində olan vilayətlərə nisbətən, bu dəniz müsəlmanlar arasında da Bəhri-Xəzər, Bəhri-Cürcan, Bəhri-Gilan və Bəhri-Şirvan adı ilə şöhrət tapmışdır.

Qafqaz sözü də həmin qaspi adlı tayfanın adından və Quranda qeyd edilən Qaf dağından alınmışdır. Bu dağ əfsanə kitablarında divlərin və pərilərin yurdu hesab olunur. Həmin kitablarda pərilərin padişahına Şahbal deyirlər. Dərbəndnamə müəllifi ərəblərin Dağıstanda təyin etdikləri əmirin adını Şahbal və ya Şahi-Bəəl deyə qeyd edir. Şamxal ölkəsində, gözəlləri bütün Dağıstanda məşhur olan kəndlərdən birinin adı Pəravuldur. Bu da Pəri-avul, yəni pərilər kəndi deməkdir. Bu kənd indi də durur.

Gülüstani-İrəmi, Qaf dağının yaxınlığında, son dərəcə təravətli və axar-baxarlı, gözəl çeşməli və meyvəli ağacları olan bir yer kimi təsvir etmişlər. Ehtimal ki, bu da Qubanın Şabran adlı səfalı obasından ibarətdir; bu söz xalq arasında da çox məşhurdur. Bəziləri deyirlər, Gülüstani-İrəm Qarabağdakı Gülüstan adlı yerdir. Hicri 1228-ci (=1813) ildə Rusiya ilə İran dövlətləri arasında Gülüstan əhdnaməsi bağlanmışdır. Bunun yuxarısında, dağlıq bir yerdə, indi də, Gülüstani-İrəm adlı bir yaylaq vardır.

İslam tarixçilərinin çoxu Qafqaz dağlarını Əlbürz dağı deyə adlandırırlar. Bunlardan Katib Çələbi[16], ”Cahannüma” adlı əsərində deyir: Əlbürz dağı Babül-əbvabın, yəni Dərbəndin qərb tərəfindədir. Bu dağ Türküstandan Hicazə min mildən artıq məsafədə uzanan dağ silsiləsinə bitişir. Bu cəhətdən bəziləri onu Qaf dağı zənn etmişlər. Dərbənd yaxınlığında dağ iki qola ayrılır: birinə Böyük Qaf, digərinə isə Kiçik Qaf deyirlər.

Bu sıra dağlarda üz verən bir çox müharibə və fəthlərə görə, ərəblərin qədim coğrafiya kitablarında bu dağlar Cibalülfəth (Fəth dağları) adlanmışdır. Bu qeydlərdən başqa, yenə bir çox əlamət vardır ki, Qaf dağının Qafqaz dağları olmasına dəlalət edir. Bu dağ haqqında hədis və əxbar kitablarında və başqa mənbələrdə kinayə qəbilindən olaraq verilən yanlış məlumat bilməməzlikdəndir; çünki keçmiş insanlar, bu əcaiblə dolu dağların şimal tərəflərindən və daxili

[16] Katib Çələbi – məşhur şərq alimlərindəndir, hicri 1000-ci (=1591/92) ildə İstanbulda anadan olmuş və 1067-ci ildə vəfat etmişdir. Əsərlərindən ən məşhuru coğrafiyaya aid ”Kəşfüzzünun” adlı kitablarıdır.

vəziyyətlərindən düzgün xəbərdar deyildilər. Əgər onlar bu səbəbə, buranı dünyanın son nöqtəsi təsəvvür edərək, iri cüssəli, vəhşi xasiyyətli sakinlərini divə və aləmdə hüsn və nəzakətlə məşhur olan gözəllərini pərilərə bənzətsələr, münasibətsiz və yersiz olmaz.

İndiki halda bir çox səyyah, dünyanın hər tərəfini dəfələrlə tədqiq etmiş, şərq və qərb okyanuslarından keçərək yer kürəsinin o biri yarısında olan Amerikanı kəşf etmişlər; lakin onlar Qaf dağını, xəyalata qapılan sadə dillərin təsvir etdikləri tərzdə, heç yerdə rast gəlməmişlər.

Qədim və naməlum əsrlərdən bəri bir çox müxtəlif tayfalar, Qafqaz ölkəsində müharibə və fəthlər edərək, cənubdan şimala və şimaldan cənuba doğru hərəkət etmişlər. Onlar burada bir çox ölkələri istila edib sakin olmuşlar. Müxtəlif millətlərin məzlum və qaçqınları buranın çətin keçidlərində düşmənin zülmündən asudə olmuşlar. İranın qədim padişahları, xüsusilə Yəzdicird Bəhrami-Gur oğlu və Nuşirəvan Qubad oğlu başqa vilayətlərdən buraya bir çox qəbilə köçürərək, bu yerlərdə şəhər və kəndlər bina etdirmişlər. Bunların xarabaları indi də durur. Yunanlar, rumlular, ermənilər, ğunlar, avarlar, türklər, ruslar, xəzərlər, ərəblər, moğollar və tatarlardan olan müxtəlif tayfalar bu ölkənin bir çox yerlərini əllərində saxlamışlar. Xüsusilə Şirvan ölkəsi hamısından artıq iğtişaş yeri olmuşdur. Səfəvilər dövründə İran və Osmanlı qoşunları bir-birinin ardınca bu ölkəni dəfələrlə ələ keçirmişlər. Məlum olur ki, bu ölkə əhalisinin nəsli müxtəlif tayfalardan mürəkkəbdir. Buna onların hələ də mövcud olan bir çox müxtəlif abidələri, dilləri, adətləri və əhalinin əxlaq və istedad dərəcəsi aydın və aşkar bir şahiddir.

Lakin bunu ətraflı olaraq təyin etmək mümkün deyildir. Ancaq bu qədər demək olar ki, Təbərsəranın bir hissəsində, Qubanın qərb qismində, Samur və Kürə nahiyələrində yaşayan əhalinin əksəri müxtəlif tayfalara qarışmış qədim nəsildəndir. Dərbənd ətrafında, Təbərsəranın çox hissəsində, Quba vilayətinin şərq qismində, Şəki, Bakı, Şirvan və Səlyan vilayətlərində yaşayanlar, fars, ərəb, moğol və tatarlardan ibarətdir. Burada olan erməni və yəhudilərin çoxu da get-gedə müsəlmanlar ilə qarışmışlar. Onlar Təbərsəran, Dərbənd, Bakı, Quba və Kürə ölkələrində çox az, Şirvan və Şəki ölkələrində isə daha çox qalmışlar. Onlar öz din və dillərini saxlamışlar. Qarışıq nəsilli əhalinin varlığına, bir çox qəbilə və kəndlərin öz dilləri və adlarını saxlaması ən aydın bir dəlildir.

Bakı ölkəsində Zıx, Dağıstanda isə Miyatlu kəndlərinin əhalisi Zıx və Miyat tayfalarının qalıqlarıdır. Plini[17] və Strabon[18] onları bu ölkənin qədim sakinləri deyə

[17] Plini – məşhur Roma alimidir, eramızın 23-cü ilində anadan olmuşdur. Plininin ”Təbii tarix” adlı əsərində Azərbaycan Tarixi və coğrafiyası haqqında qiymətli məlumat vardır.

[18] Strabon – məşhur yunan coğrafiyaşünaslarındandır. Eramızdan təqribən 63 il əvvəl anadan olmuş və eramızdan 19 il əvvəl vəfat etmişdir. Onun ən məşhur əsəri ”Coğrafiya” adlı kitabıdır. Bu kitabda Azərbaycan haqqında gözəl məlumat vardır. Strabon əsərlərini Pompeyi Azərbaycana olan yürüşləri zamanında, romalıların topladıqları məlumat əsasən tərtib etmişdir.

göstərmişlər. Şəki, Şirvan və Qubada yaşayan Udilu tayfası Udi şəhəri əhalisindən olmalıdır. Bu şəhər miladi III əsrdə Ermənistan padişahlarının paytaxtı olmuşdur. İndiri kəndinin Tumanlar adlı bir məhəlləsi vardır. Əhalisi indi də Qoysunun sağ tərəfindən Temurquyuya qədər olan yerlərdəki mülklərə və arxlara sahibdirlər. Onlar əvvəldən buruda sakindilər.

Başlı yaxınlığında olan Tumanlar kəndi də, Tumanşah tayfasının qalığı olmalıdır. Onları burada Nuşirəvan yerləşdirmişdir. Köbəçi əhalisi öz babalarından eşitdikləri rəvayətə görə ticarət məqsədilə buralara gəlmiş Yunan və Cənəviz əhalisindən bir dəstədir. Onlar burada karxanalar bina edərək, get-gedə ayrıca bir camaat şəklinə düşmüşlər. Təbərsəran əhalisinin çoxunu Nuşirəvan Təbəristan və İsfahandan köçürmüşdür. Bu nahiyənin adı da Təbəristan sözündən dəyişmiş ola bilər.

Ərəb adı ilə Qubada iki kənd, Dərbənddə bir kənd, Şəkidə iki kənd və Şirvanda da böyük bir qəbilə vardır. Bu qəbilənin bir qismi indi də öz aralarında ərəbcə danışırlar. Təbərsərandakı Dərvaq kəndində də əhali son zamanlaradək ərəb dilində danışarmış; bu dili ancaq yaxın zamanlarda tərk etmişlər, kəndin qocaları indi də bu dili bilirlər. Bunlardan başqa Kürə, Təbərsəran məmləkətləri və Samur nahiyəsi, bütün Dağıstan kimi öz kitablarında və yazılarında ərəb xətti və ərəb dili işlədirlər.

Qubadakı Bərmək mahalı Harunərrəşidin vəziri Cəfər Bərməkinin qəbiləsindəndir. Onlar Cəfərin öldürülməsindən sonra, gəlib burada sığınmışlar. Quba və Şirvanda Zəngənə, Xəlilli və Kəngərli; Şirvanda Qaramanlı, Təkəli, Şamlı və Çakərli; Qubada Osallı, Ərşəli, Ustacallı və Qacar tayfaları; Quba, Dərbənd və Şirvanda Bayat qəbiləsi; Şəkidə, Şirvanda Qaraqoyunlu, Xələc və sair bir çox tayfalar vardır. Bunlar İran və Rum ölkələrində sakin olan tərəkəmə və sair elat kimi, türk tayfalarındandır. Samur nahiyəsindəki Miskincə kəndinin əhalisini, I Şah Təhmasib Səfəvi Astarabad hüdudundan buraya köçürmüşdür. Bu nahiyyədə yalnız Miskincə kəndi şiə məzhəbdir. Həzrət sözündən dəyişmiş olan Həzrə kəndinin əhalisini, həmin padişah İrandan Quba vilayətinə köçürüb, öz babası Şeyx Cüneydin qəbri ətrafında yerləşdirmişdir. Bunlar indi sünni məzhəbində olsalar da, bir məhəllələri hələ də, ”Şiələr məhəlləsi” adı ilə məşhurdur.

Samur nahiyəsindəki Mikrağ kəndinin və Qaziqumuq əhalisinin çoxu, məlum olduğu kimi, rus tayfasındandır. Onlar xəzərlərin istilası dövründə buraya gəlmişlər. Bundan əlavə onların zahiri qiyafəsi və bir çox adət ənənələri də buna şahiddir. Qaziqumuq əhalisi indi də salam əsnasında papaq götürüb bir-birinə ”izrov” deyirlər. Bu söz ola bilər ki, ”zdorov” sözündən alınmışdır. İndiki halda, Qaziqumuq şəhərində və bu böyük şəhərdən ayrılmış olan bəzi nahiyələrdə üç tayfa sakindir: Qaççi, Məçcə, və Qumuq. Ehtimal ki, Qaççi tayfası Hun, Slavyan, Avar və Xəzər nəslindən olsun; Məçcə - Məkkə sözündən dəyişmə olub, ərəblərin Qüreyş qəbiləsindən Qumuq da, qədim Kamak tayfasından olsun. Həmçinin bu ölkənin sair əhalisi və Sulağın sağ tərəfində olan Aqquşa, Qaytaq mahalları və

Şamxal mülkü əksəriyyətlə qədim nəsildən olub ermənilər, farslar, ərəblər və türklərlə qarışmışlar. Sulağın o tərəfindəki Qumuq əhalisi Mıçıqıç, Avar və əslində qədim nəsildən olan bir çox azadlıqsevən xalqlar, müxtəlif şimal tayfaları ilə qarışmışlar.

Xülasə, bu əzəmətli dağlarda (Qafqazda), dilləri az yayılmış olan naməlum xalqlar vardır ki, qədim tayfaların qalıqları hesab edilə bilər. Bunlar, əsrlər boyu dünyada qalibiyyət və qüdrətlə məşhur olmuşlar. İndi isə bunların bəzilərindən heç bir əsər qalmamışdır, yalnız tarix kitablarında adları çəkilməkdədir.

Karamzin[19] və başqa tarixçilərin yazdıqlarına görə, avarlar Türküstan çöllərində iqtidar və şöhrət sahibi bir tayfa olmuşlar. Çin tarixçilərinə görə, Avar tayfası çinlilərlə qonşu olan hun nəslindəndir. II əsrdə türk tayfaları tərəfindən məğlub edilən avarlar, cənub ölkələrinə gəlmiş və başqa tayfalarla qarışmışlar. Avar xanı Dizavul, Atilla kimi yüksək iqtidara malik olmuşdur. O, Altay dağları arasında ipək döşənəcək və qızıl qab-qacaqla bəzənmiş çadırda, Rum qeysəri Yustinianın elçilərini və hədiyyələrini qəbul edərək, onunla barışmış və iranlılarla müvəffəqiyyətlə müharibə etmişdir. Rum tarixçilərinin dediyinə görə, Dizavulun elçiləri qırxılmamış uzun saçlarından başqa, surət və əxlaqca da, tamamilə hun tayfasına bənzəyir və Atilla zamanını xatırlatmaqla tamaşaçıların heyrətini artırırdılar. Onlar 568-ci ildə sülh tələbi üçün Qostəntiniyyəyə gəlib, qeysər Yustiniana dedilər ki, Avarın cəsur və məğlub edilməz tayfası səninlə dost olmaq, səndən ənam, məvacib və yaşamaq üçün yararlı və gözəl bir yer istəyir. Qeysər onların tələblərindən heç birini rədd etməyə cəsarət etmədi. Avarın qaniçən xanı Bayan, bolqarları məğlub edərək, qətl və qarətdə əlindən gələni etdi. O, çex və sair slavyan xalqlarının sakin olduqları Moraviya və Bohemiyanı istila ilə Frank kralı Siqberti məğlub edərək bir baş Tuna çayına gəlib çıxdı. Burada Lonqbard tayfasilə ittifaq edərək Qəbidiyan dövlətini alt-üst etdi və Macarıstanı ələ keçirib İtaliyanı almaq xəyalına düşdü. 568-ci ildə avarların ölkəsi Elba çayından Atilə (Volqaya) qədər olan sahəni tuturdu.

Bayan xan 580-ci ildə Qara dənizin şimal-şərq sahillərini türklərin əlindən aldı. Ertəsi il, 60 min süvari ilə gəlib Tuna çayı kənarında o zamana qədər başlı-başına yaşayan Slavyan tayfasını qətl və qarətlə özünə tabe etdi. Tarixçi Nestorun yazdığına görə, Avar xanı 619-cu ildə Rum qeysəri Heraklini elə məğlub etdi ki, az qaldı onu əsir alsın və hicri 4-cü (=626) ildə Qostəntiniyyəni mühasirə etdisə də, məqsədə çatmadan geri qayıtdı. Bu tayfa sonralar müxtəlif zamanlarda cürbəcür qəbilələrlə şiddətli müharibə etmiş və get-gedə zəifləmişdir. IX əsrin əvvəllərində adlarını itirərək, başqa tayfalara qarışmışdır.

Qəbirlərindən tapılan qiymətli şeylərdən məlum olur ki, bunlar o qədər də vəhşi olmayıb İran, Çin və Rum ilə ticarət əlaqəsi saxlamışlar. Bunlardan bir

[19] Karamzin - Karamzin Nikolay Mixayloviç - məşhur rus tarixçisidir, 1766-cı ildə anadan olmuş və 1826-cı ildə vəfat etmişdir. ”Rusiya dövlətinin tarixi” adlı on iki ciddlik əsərin müəllifidir.

camaat, indi də Qafqaz dağlarında yaşamaqla bərabər, ayrıca dilə malik və xüsusi əmirlərə tabe olaraq adət və ənənələrini davam etdirməkdədirlər. Bu Avar xanına Avar Üsmisi də deyirlər. O, hicri 1140-cı (=1727) ildə rus ordugahına gələrək dedi ki, keçmişdə mülkü əlindən çıxmış əcdadından biri rus padişahının köməyilə öz yerinə təyin edilmiş və bu xüsusda rus padişahı tərəfindən verilən fərman indi də durur. Lakin baxılan vaxt məlum oldu ki, bu fərmanı hicri VII əsrdə rus ölkəsini ələ keçirmiş olan Çingiz xanın nəvəsi Batı Cüci oğlu vermişdir.

Qunib - kəndinin əhalisi (sözün axırından «b» hərfi atılaraq bəzən "Ğun" da oxunur) bədsurət və vəhşixasiyyət Ğun və ya Hun tayfasının qalıqlarındadır. Bu kənd, Əndələl nahiyyəsində tarlalı, otlaqlı, çaylara və ağaclara malik çox çətin keçilən bir dağ təpəsində olub, təqribən yüz evdən ibarətdir. Bu kəndin əhalisi pis xasiyyətlidir. Adamlar çox zaman bir-birilə vuruşurlar. Boyları qısa və surətcə bədtərkib olub, o ətrafın sair əhalisindən xüsusilə fərqlənirlər.

Təbərsəranda, Dərbənd səddi ilə əlaqədar olaraq Ənuşirəvan tərəfindən bina edilmiş bir şəhərin xarabaları ətrafında Calqan, Rukal, Məqatir, Kəmax, Zeydiyan, Hümeylərin əhalisi tat dilində danışırlar. Bu dil qədim fars dilinin ləhcələrindən biridir. Məlum olur ki, onlar farsdırlar, ancaq bu şəhər xaraba qaldıqdan sonra, həmin kəndlərdə yerləşmişlər. Bilhədi kəndinə yaxın olan bu şəhərdə sənətkaranə bir tərzdə işlənmiş qəribə bir darvaza vardır. Bu dərvaza indi də durur. Ehtimala görə, Babülhədid həmən budur, kəndin adı da, bundan alınaraq, çox işlənmək nəticəsində dəyişib Bilhədi olmuşdur.

Şamaxı ilə Qudyal (indiki Quba) şəhərləri arasında qalan mahalda, məsələn: Şirvanda Hovz, Lahıc və Qoşunlu; Qubada Bərmək, Şəmpara, Buduğun aşağı hissəsi və bütün Bakı ölkəsində - altı tərəkəmə kəndindən başqa -bütün əhali tat dilində danışır. Məlum olur ki, bunların da əsli farsdır. Quba ölkəsinin qərb qismi - xüsusi dilə malik olan Xınalıq kəndindən başqa - Samur və Kürə nahiyələri və Təbərsəranın Dərə və Əhmərli adlı iki mahalı müxtəlif ləhcəli xüsusi dilə malikdirlər. Bunlar türk dilində danışan əhalini moğol adlandırırlar. Dərbəndnamənin qeydinə və sair əlamətlərə görə məlum olur ki, bu tayfa Alan masagetlərinin nəslindəndir. Bakıdakı Məşqətə - "s" hərfi "ş" hərfinə təbdil edilmişdir - kəndinin əhalisi də həmin tayfadan olmalıdır. Bunlar Bakı əhalisinin dilini qəbul etmişlərsə də, yenə əxlaq və yaşayış tərzləri cəhətdən bu ölkə əhalisindən tamam fərqlidirlər. Sair Təbərsəran mahallarının da başqa dilləri vardır. Mağarti, Mərağə, Xoçni və Çıraq adlı dörd kənddə, Dərbənd şəhərində və onun hər iki tərəfində olan Ulus və Tərəkəmə mahalındakı kəndlərin hamısında, Tip, Müskür və Şabran mahallarında və Quba şəhərinin özündə, Səlyan ilə Şirvanın digər mahallarında, Bakının altı tərəkəmə kəndində və bütün Şəki ölkəsində əhalinin dili türkcədir. Bunlar əksəriyyətlə türkmən, moğol və tatar nəslindən olub, bəziləri də, Osmanlı - İran müharibələri zamanında, Səfəvilər dövründə və bundan sonra gəlmişlər. Bunların ləhcələri Ermənistan və Azərbaycanın bütün vilayətlərində də İranın bir çox yerlərində işlənən türk dilinə

mənsubdur. Bu ləhcə Osmanlı, Cağatay, Qumuq və Noğay ləhcələri arasında orta ləhcədir, lakin hər dil üçün lazım olan yazı qaydaları və qanunları (sərf-nəhv) bu dil üçün hələ təyin edilməmişdir.

Dağıstanda olan bir çox xalqların və əmirliklərin müxtəlif dilləri və hesabsız ləhcələri vardır. Bunlardan beş dil ümumiyyətlə daha çox işlənir.

1) Qumuq ləhcəsilə olan türkcədir. Bu dil Qaytağın aşağı hissəsində, Şamxal mülkündə və Qumuqda olan bütün düzlərdə işlənməkdədir. Bununla bərabər, başqa yerlərin əhalisindən bir çoxu da bu dili bilir.

2) Avar dilidir. Bu dil bütün Avarıstana yayılmış və bir çox xalqlar arasında işlənməkdədir. Sair qəbilələrdən bir çoxu da bu dili bilir.

3) Beş Aqquşa mahalının dilidir. Bu dil Sürhidə və Qaytağın yuxarı mahallarında müxtəlif ləhcələrdə danışılır.

4) Qaziqumuq dilidir. Bu dil həmin ölkəyə məxsusdur.

5) Mıçıqıç dilidir. Bu dil həmin ölkəyə və bu ölkənin yuxarı nahiyələri olan Şübut, Carili və sairə məxsusdur.

Zumtal, Baqtulal, Camalal, Əndib, Qapuçay, Ansux, Cəniq, Zaxur, Auvax, Qabalal camaatı və Qaziqumuğa mənsub olan Köbəçi, Ərçub kəndləri və bunlardan başqa bir çoxları müxtəlif dillərə və ləhcələrə malikdirlər. Bu xüsusda təfsilat vermək üçün ayrıca tədqiqat aparmaq lazımdır.

Ermənilər və yəhudilərdən başqa, Şirvanın bütün əhalisi islam dinində olub, bəzisi şiə və bəzisi sünnidir. Bakı ölkəsi tamamilə, Dərbənd əksəriyyətlə, Şirvanın yarısı, Səlyanın hamısı, Şəki və Qubanın bir hissəsi şiə məzhəbdir. Şirvanın yarısı, Şəki və Qubanın çoxu, Dərbəndin azacıq bir hissəsi, bütün Təbərsəran, Kürə, Miskincəni çıxdıqdan sonra Samur nahiyəsi və Dağıstanın hamısı sünnidir. Bu məzhəb buruda iki şöbədən olub, biri hənəfi və digəri şafiidir. Quba, Şəki və Şirvanda bunların hər ikisindən vardır. Samur, Kürə, Təbərsəran nahiyələri və Dərbəndin sünni hissəsi, bütün Dağıstan kimi şafii-məzhəbdirlər.

Əgər bu ölkənin qəbilələri, kəndləri, binaları və qədim asarı heniş bir surətdə tədqiq edilərsə əhalinin mənşəini təyin etmək mümkün olacaqdır. [26 - 27]

## BİRİNCİ FƏSİL

### *İSLAM DÖVLƏTİNİN ZÜHURUNDAN ƏRƏB QOŞUNUNUN GƏLMƏSİNƏ QƏDƏR ŞİRVAN VƏ DAĞISTAN ÖLKƏLƏRİNDƏ BAŞ VERƏN QƏDİM HADİSƏLƏR HAQQINDA*

Məlum olduğu üzrə, bütün tarixçilər yazırlar ki, insan nəslinin birinci yurdu Babil ölkəsi olmuşdur; Nuhun tufanı da, burada baş vermişdir.

Məhəmməd ibni-Cərir Təbəri[20] öz tarixində deyir: "Atəşpərəstlər ümumi tufana inanmırlar". İslam tarixçilərinin bəzisi isə ümumi tufanın Babildə, İraqda, Şamda və Yəmənə qədər olan ölkələrdə baş verməsi qənaətindədirlər. Həmdüllah[21] "Tarixi-güzidə" adlı əsərində yazır: "Bəzilərinin dediyinə görə, tufan ancaq Ərəbistan yarımadasında olmuşdur. Çin əhalisi və türklərdən bəzisi ümumi tufanı danırlar". Osmanlı sultanlarının nəsəblərindən bəhs edən bir Təbəqat kitabında onların nəsli türk xanlarına və buradan da Nuha, Adəmə gedir çatır.

Ümumiyyətlə, ya tufan səbəbinə, ya da başqa bir hadisəyə görə, yaxud törəyib artdıqlarından yaşayış vəsaiti artırmaq üçün, cənub hissəsində yaşayan bir cəmiyyət dünyanın hər yerinə dağılmışdır. Bununla əlaqədar olaraq Şərq və Şimal ölkələri Yafəs nəslinə, Afrika və Hindistanın isti tərəfləri Ham övladına, Ərəb, İran və Rum ölkələri də Sam silsiləsinə mənsub olmuşdur.

Hicri IX əsrin axırlarında yazılmış Rövzətüssəfa kitabına görə, cənub ərz dairəsinin 14-cü dərəcəsinə qədər, Okyanus dənizində abad cəzirələr vardır ki, onların sakinləri də Sam nəslindəndir.

Nuhun bu üç oğlu, bəzilərinin rəyincə, qəbilə rəisləri sayılırlar, əgər bunlar tək olsaydılar, bu qədər uzaq məsafəyə gedə bilməzdilər. Bəziləri də, Yafəsin İranın və bütün Sam nəslinin birinci padişahı olan Kəyumərsin müasiri və türklərin ilk hökmdarı kimi tanıyırlar.

Güzidə və Xülasətüləxbar[22] müəlliflərinin rəyinə görə, Yafəsin səkkiz və Rövzətüssəfa müəllifinin yazdığına görə, on bir oğlu olmuşdur:

1. **Türkdür**. Yafəsin böyük oğlu və vəliəhdi olub, ədalətli və rəiyyətpərvər bir padişah idi. Bütün Yafəsin qəbilələri bunun adı ilə - türk adlanırlar. Atasının

---

[20] Məhəmməd ibni Cərir Təbəri – IX əsrin ən məşhur tarixçisidir. Hicri 224-cü (=838/39) ildə Təbəristanın Amül şəhərində anadan olmuş və 310-cu (=923) ildə Bağdadda vəfat etmişdir. "Tarixülüməm vəlmülük" və eyni zamanda "Əxbarürrüsül vəlmülük", "Tarixi-Cəfəri" və "Tarixi-Təbəri" adı ilə də məşhur olan əsəri ən mühüm tarixi mənbələrdən sayılır.

[21] Həmdulla Mustovfi Qəzvini – elxanilər dövründə yetişən məşhur tarixçilərdən biridir. Təqribən hicri 680-ci (=1281/82) ildə anadan olmuş və 750-ci (=1349/50) ildə vəfat etmişdir. Həmdullah biri coğrafiyaya və ikisi tarixə aid olmaqla üç əsər yazmışdır. Bunlar da: "Nüzhətülqülub", "Tarixi-güzidə" və "Zəfərnamə" adlı əsərləridir. Onun ən mühüm əsəri "Tarixi-güzidə"sidir.

[22] "Xülasətüləxbar" – Xandəmirin əsəridir. O, babasının "Rövzətüssafa" adlı əsərini ixtisar edərək "Xülasətüləxbarı" yazmışdır.

vəfatından sonra, özü üçün Türküstanda isti və soyuq bulaqlı bir çox otlaqlar seçmişdir. Əvvəlcə ağac, qamış və otdan özü üçün qərargah və daha sonra heyvanat dərisindən çadır və otaq düzəltdirmişdir. Bu yer Suluq adlanır, Zəfərnamədə[23] isə Suluqay şəklində qeyd edilmişdir.

Karamzin və başqalarının yazdıqlarına görə, İrtış və Yayıq çaylarının kənarlarında yaşayan türklər güclü bir tayfa olmuşlar. Bunlar Çin və İran ölkələrinə basqın edirdilər. Miladi 580-cı ildə Qara dənizin şimal-şərq sahillərini Krım ölkəsinə qədər istila etmişdilər. Lakin o ildə, Avar tayfası ilə etdikləri müharibə nəticəsində, bu yerlər əllərindən çıxmışdır.

Rum qeysəri Tiberinin elçisi dost olduqlarını bildirmək üçün türk xanının yanına gəlmişdi. Xan ona dedi: "Siz o rumlular deyilsiniz ki, on dildə danışıb hamısı ilə də insanları eyni dərəcədə aldadırsınız? Biz türkük, yalan və aldatmaq bilmərik; bunu da bilməlisiniz ki, mən sizin padişahınızdan intiqam almaq üçün firsət axtarıram. O öz dostluğu ilə məni arxayın etmək istəyir, lakin bizdən qaçan avar qullarımızı himayə edir. Deyirsiniz, sizin məmləkətə ancaq Qafqazdan keçmək olar. Mən Don və Dnepr çaylarının yataqlarını öyrənərək, avarların Rum ölkəsinə haradan və necə keçmiş olduqlarını təyin edəcəyəm, eyni zamanda sizin gücünüzü də biləcəyəm. Bilməlisiniz ki, məşriqdən məğribə qədər bütün aləm mənim itaətimdədir.

Miladi 581-ci ildə, türk ölkəsi şərqi və qərbi deyə iki yerə bölündü. Bu ölkələrin hər ikisi müxtəlif tayfalarla olan müharibələr nəticəsində zəif düşdü. Sonralar yenə (qüvvət tapıb) hər tərəfdən baş qaldıraraq, bütün ətrafı fitnə və fəsad ilə doldurdular.

2. **Xəzərdir.** Bu da bir sıra səfər və köçərilikdən sonra öz qəbiləsilə Atil çayı kənarında yerləşib, bir şəhər salmış və balıq ovu ilə məşğul olmuşdur. Arıdan bal hasil etməyi buna nisbət verirlər. Deyirlər ki, Xəzərin bir oğlu ölür, onun cənazəsini qəbilə yığıncağında çalğı ilə - suyun ziddi olan odda - yandırır (Xəzər bununla sudan intiqam almaq istəyir), çünki atası Yafəs dənizdə batmışdı.

Xəzər tayfası türk cinsindəndir, erməni tarixləri üçüncü, Avropa tarixləri dördüncü əsrdən başlayaraq onlardan bəhs edir. Hacı Tərxan (Həştərxan) çöllərində hunların istilası zamanı, onlar Atillanın hökmü altında olmuşlar.

D'Anvil yazır: V əsrin əvvəllərində, tatarlardan Tulun və ya Turun adlı bir əmir, özünü Xəzər xaqanı adlandırdı. 626-cı ildə Rum qeysəri Herakli, Xəzər

---

[23] Şərəfəddin Əli Yəzdinin əsəridir. Teymur dövrünün tanınmış tarixçisidir. Yəzd şəhərində anadan olmuş və hicri 858-ci (=1454) ildə vəfat etmişdir. Onun yazmış olduğu "Zəfərnamə", Teymurun tarixi hadisələrini təsvir edən mənbələr içərisində mühüm yer tutur. Teymurun tarixinə aid "Zəfərnamə" adlı iki əsər daha vardır. Bunlardan biri Nizaməddin Şaminin "Zəfərnamə"sidir. Bu kitab Teymur zamanında və onun əmrilə yazılmışdır. İkinci də məşhur Əbdürrəhman Caminin bacısı oğlu Hatifinin mənzum "Zəfərnamə"sidir. Hatifi, "Teymurnamə" adı ilə də adlanan bu əsərini Şərəfəddin Yəzdinin tarixini əsas tutaraq nəzmə çəkmişdir.

tayfasını iranlılarla müharibəyə apardı və bu ildə xaqanı oğulluğa götürüb başına tac qoydu.

Rum qeysəri II Yustinian Tiberidən qaçıb xaqanın yanına getdi və onun qızı ilə evləndi. Qeysər Lev də xaqanın qızını öz oğlu Qostəntin üçün aldı. Qeysər Lev də (Xəzəri) bundan dünyaya gəldi.

Xəzərlər iki dəniz (Xəzər və Qara dəniz) arasındakı yerləri ələ keçirib, slavyanları və sair qəbilələrdən bir çoxunu özlərinə tabe etdilər; Rum sultanları ilə dost olub Qafqaz, Ermənistan və Azərbaycan ölkələrindən keçərək, fars və ərəb padişahları ilə müharibəyə girişdilər.

Karamzinin yazdığına görə, Atil şəhəri Atil çayı kənarında olub, xaqanın paytaxtı idi. Bu şəhəri Nuşirəvan bina etmişdir. Xəzərlər hunların və sair türk tayfalarının əksinə olaraq, tikinti işlərinə həvəskar imişlər. Don kazaklarının mülkündə olan Sarkel qalası, Xarkov şəhəri yaxınlığındakı Xaqan adlı şəhər xarabası və Voronej ətrafındakı Xəzəriyyə adlanan sair yerlər bunların məlum olmayan şəhərlərinin qalıqlarıdır.

Xəzərlər əvvəllərdə bütpərəst idilər. VIII əsrdə yəhudi dinini qəbul etdilər. Məsudinin rəvayətinə görə, bu dini əvvəlcə Xəzər xaqanlarından Bula adlı biri, hicri 121-ci ildə qəbul etmişdir. Hicri 243-cü (=858) ildə isə onlar xaçpərəst dininə keçmişlər.

Əbülfida yazır: Xaqan, sultanlar nəslindən olmalı idi. Mühüm və böyük iş olmadan, onu görmək hər kəsə mümkün olmazdı. Hüzuruna gedən zaman torpağa düşmək lazım idi. Ondan icazəsiz (torpaqdan) qalxmaq, yaxına getmək və söz söyləmək olmazdı. Xaqanların qəbirləri yanında keçərkən, atdan düşüb baş əymək lazım idi. Xaqan mənsəb sahiblərindən hər hansına: “Get öl” desəydi, o haman saat evə gedib, özünü öldürməli idi.

Bu nəsildən fəqir və yoxsul olanlar da növbə ilə hökmranlığa çatırdılar. Eşitdim ki, bir cavan dükanda xırdavatçılıq edirdi, xalq deyirdi ki, hazırkı xaqandan sonra taxta varis bu şəxsdir. Lakin həmin şəxs müsəlman idi, xaqan isə yəhudi olmalı idi.

Xaqan ilə bərabər on nəfər də məhkəmə və divanda hazır olub, xalqın işinə baxmalı idilər. Bunlar da, müsəlman, yəhudi, xaçpərəst və bütpərəst ola bilərdilər. Bu şəhər əhalisinin çoxu müsəlman və xaçpərəst, bir azı da yəhudidir. Bunların hörmətlisi müsəlmanlar və tacirlərdir. Çox yedikləri şey düyü və balıqdır. Şəhərin ətrafı on ağac məsafəyə qədər məhsuldar çöllərdən ibarətdir. Xarəzm malları ilə yüklü gəmilər, şəhərin ortasından axan çay ilə keçib gedir. Başqa gəmilər də Portas ölkəsi ətrafında qiymətli qara tülkü dərisi gətirir. Çöllü tayfaların padişahları, bu dəriləri kürk və papaq üçün baha qiymətə alırlar. Başqa ölkələrdən də qırmızı, boz və ağ rəngli tülkü dəriləri gətirilir. Bunlara “ərəbi” deyirlər. Bu dərilər daha ucuz olub yalnız Dərbəndə, Bərdəyə və Xorasana deyil, hətta Fransaya və İspaniyaya da aparılır.

Bu şəhərin evləri ağac və qamışdandır. Xaqanın sarayı isə, çayın qərb tərəfində tikilmişdir.

Xəzər ölkəsində gözəl bağları olan İsmid adlı bir şəhər vardır. Ehtimala görə, bu sözün əsli Səməndər, ya İsməndər olmuşdur. Ancaq yazarkən "y" hərfi ilə "n" hərfi qarışdırılmış və "r" hərfi də qələmdən düşmüşdür. Dərbənddən Sərirə qədər yol boyu bağlıqdır. Burada üzüm də əmələ gəlir.

3. **Rusdur**. Bu adam ... uzun zaman köçəri həyat sürdükdən sonra elçi göndərib, Xəzərdən oturaq yeri istədi. Xəzər o tərəflərdəki münbit torpaqlı və sağlam havalı adaların bəzisini ona verdi. Rus "yarğu", yəni qovğa salmağa və ədalət tələb etməyə başladı. Ruslarda belə bir adət vardır ki, atadan qalan malın hamısını qıza verərlər, oğula isə qılıncdan başqa bir şey verməzlər: "Sənin hissən ancaq budur" - deyərlər.

Karamzin və sair rus tarixçilərinin yazdıqlarına görə, hicri 247-ci (=862) ildə başsız və intizamsız olan şimali Slavyan tayfasının dəvəti ilə rus nəslindən üç qardaş - bunların əhvalatı hicri 235 (=850) ildə Avropa tarixinə də girmişdir - Baltik dənizinin o biri tərəfindən gəlib, slavyan torpaqlarında sakin oldular. Bunların böyüyü - Rurik əmirliyə başladı və rus dövləti o zamandan etibarən əsaslandı.

Tarixlərdən və yuxarıda qeyd olunan faktlardan əlavə, bir çox əfsanələrdə Rus tayfasının göstərdiyi hünərlər, təəccüblü işlər və Makedoniyalı İskəndərin onlara yazdığı dostluq məktubu məşhurdur.

Həzəqil peyğəmbərin kitabında 38-ci fəsildə və Ərəmya peyğəmbərin kitabında 25-ci fəsildə şərq tayfaları sırasında Rus tayfasının da adı çəkilir, bu da onların qədim bir nəslə mənsub olduqlarını göstərir.

4. **Qərrədir.** Hiyləgər bir adam idi. O öz tayfası ilə bərabər Bolqarıstan ətrafında yurd salmışdı.

Onunla Türk arasında şiddətli müharibə baş verdi. Bu müharibədə Qərrənin oğlu Beyğur öldürüldü. Deyirlər ki, bunların nəsli arasında indi də çəkişmə davam edir. Moisey Xorenskinin yazdığına görə, Bolqar tayfasının adı tarix kitablarında miladdan yüz il əvvəl söylənməkdədir.

5. **Kamaridir.** Buna Kamak da deyilir. Bu xoştəbiət və ovçuluğu sevən bir şəxs idi. O indi Bolqar adlanan yerə gəlib yurd saldı. Onun Bolqar və Pərtas adlı iki oğlu oldu. Bunlar da qəbilə sahibi oldular. Qumuq tayfası bu nəsildən ayrılmışdır və adları da, ehtimal ki, Kamak sözündən alınmışdır. Bətləmyus da bu tayfanı həmin yerlərdə Kam və Kamak adları ilə qeyd edir.

6. **Səqlabdır**. Bunun da böyük bir qəbiləsi var idi. Yer ələ keçirmək üçün səfərə çıxardı. Onun bir oğlu oldu, anası vəfat etdiyi üçün it südü ilə bəsləndi. Böyüdükdən sonra it kimi insanlara hücum edərdi. Atası öz qohumlarından ona bir qız aldı. Bundan Səqlab adlı bir oğlu oldu. Bu da böyüyüb qəbilə rəisi olduqda, elçilər göndərib, Rus və Xəzərdən oturaq yeri istədi. Səqlabın qəbiləsi çox olduğu üçün onun tələbini rədd etdilər. İş müharibə ilə nəticələndi. Səqlab basılıb şimala

doğru çəkildi və 64 ərz dərəcəsində yurd saldı. Buralar çox soyuq olduğundan yeraltı evlər düzəltdilər.

7. **Çindir**. Yafəs tərəfindən onun adına saldırılan bir şəhərdə sakin olurdu. Növbənöv sənətlər: ipəyin kəşfi, qumaş toxumaq, rəng düzəltmək, nəqqaşlıq, müşk əldə etmək və bir çox başqa şeyləri guya bu icad etmişdir.

8. **Baricdir**. Frənk tayfası və rumlardan bəziləri ona mənsubdur.

9. **Məsəkdir.** Moğol və Yəcuc nəsli ondandır. Yafəsin başqa övladı haqqında heç bir məlumat yoxdur.

Musanın "Tövrat"ına görə də, Yafəsin Kamir, Makuk, Madi, Yavan, Elisa, Fuvel, Mosoq və Firas adlı səkkiz övladı vardı.

Makuk ərəbcə həmin Məcucdur. Kamir, Mosoq həmin Kamari və Məsək ola bilər.

Müəllif deyir: Cənub və şimal tayfalarından bir çoxunun dilində bəzi fellər və əsli isimlərin uyğunluğu onların bir nəsldən olduğuna dəlalət edir. İnsan nəsli hər halda ilk dövrlərdə vəhşi, çılpaq və cənub tərəflərində sakin olmuşdur. Aşkar məsələdir ki, münasib libas, isti mənzil və azuqə olmadan onlar şimal tərəflərində yaşaya bilməzdilər. Tədriclə yaşayış vəsaiti düzəldi, qəbilələrin çoxluğu üzündən zəxirə tələbinə, heyvanat ovlamağa və mal-qara üçün geniş otlaqlara ehtiyac artdı. Bu zaman bunlar şimala doğru üz tutdular. Onların yolları da, əksəriyyətlə, Qafqaz ölkəsindən və xüsusilə, Şirvan və Dağıstan vilayətlərindən olmuşdur. O zaman gəmi olmadığı üçün dənizlərdən qərbə keçmək çətin idi. Şərq tərəfdən də Qıpçağın susuz və meşəsiz çöllərindən keçmək mümkün deyildi. Bu ölkənin bol çeşməli, çaylı və otlaqlı çölləri, meyvə ağacları və meşələri olan isti dərələri vardır. Bu hal o dövrlərdə yaşayan vəhşi xasiyyətli tayfaların bu yerlərdən keçib getmələri və yurd salmaları üçün daha əlverişli idi.

Tarixçilərin çoxunun qeydinə görə, çox qədim dövrlərdən bəri İran şahları və başqaları fəth və səyahət fikri, ya da düşməndən qaçıb qurtarmaq məqsədilə, bu əcaib ölkəsi olan Qafqaza pənah gətirərdilər. Xüsusilə, Şirvan vilayəti cənub və şimal tayfalarının ardı-arası kəsilməyən hücum və müharibələrindən xilas ola bilməmişdir. Qədim Suriyanın və Babilistan dövlətlərinin tarixlərində Qafqaz haqqında açıq və aydın məlumat yoxdur. Lakin İran tarixlərində söylənir ki, Pişdadiyan sülaləsindən Fərrux oğlu Fridun və Kəyan padişahlarının sülalə başçısı Keyqubad uşaqlıq zamanında düşmənlərindən gizlənib, Əlbürz - Qafqaz dağlarında və düzlərində yaşayırdılar.

Fridunu Dəmirçi Kavə və Keyqubadı da zabilistanlı Rüstəm gəlib aparmış və İranın səltənət taxtına oturtmuşlar.

Fars tarixçiləri deyirlər ki, Fridun bütün dünyanın padişahı idi və ölkəsini üç oğlu arasında bölmüşdü: qərb tərəflərini Səlmə, şərq ölkələrini Turə və orta tərəflərini də vəliəhdi olan İrəcə (İrək sözünün ərəbcələşmişidir) verilmişdir. Bir qədər keçdikdən sonra, Səlm ilə Tur İrəcə paxıllıq edərək, onu məşvərət və görüş bəhanəsilə dəvət edib Qarabağın yaxınlığında öldürdülər. O zamandan sonra nəsli

arasında ədavət düşmüşdü. Ölkənin şərq tərəfləri Turan və orta tərəfləri İran adlanmışdır. İstəxr-Farsın yaxınlığında indi də İrəc adlı bir yer vardır. Miladdan təqribən 700 il əvvəl, Qrek tayfası və xüsusilə miletlilər Qara dənizin şimal-şərq sahilində Tanais, Fanaqoriya, Hirmonas və Dioskuriya şəhərlərini bina edib, Qafqazın müxtəlif əhalisi ilə ticarət əlaqəsi saxlamağa başlamışdılar.

Miladdan təqribən 400 il əvvəl yaşamış yunan tarixçisi Herodotun yazdığına görə, Kimmeriyan tayfası skiflərdən qaçıb Asiyadakı Lidiya ölkəsini ələ keçirmişdi. Skiflər miladdan 633 il əvvəl onları təqib edib iyirmi səkkiz illik istiladan sonra Avropaya qayıtdılar. Məlumdur ki, bunlar Qafqaz ölkəsindən gəlib keçmişlər, ilk fəthləri və son istilaları da bu ölkədə olmuşdur. Bu cəhətdən Şirvan və Dağıstan vilayətlərində qrek və skiflərin qədim asarından bir çoxunun nişanələri indi də mövcuddur.

Herodotun yazdığına görə, Kəyan padişahlarından Keyxosrovun massaget skifləri və onların məlikəsi Tomirisə qarşı açdığı müharibə Albaniyada olmuşdur. O, (Herodot) belə deyir: Kirus Arazdan keçib, ona qovuşan Kür çayına maniəsiz olaraq gəlib çatdı. Oradan da cəsarətlə bir dar dərənin içərisinə soxuldu. Burada dağ əhalisi onu məğlub edib, bütün qoşunu ilə məhv etdilər. Avropa və Asiya tarixçiləri Keyxosrovun aqibəti və onun dağa çəkilib qeyb olması haqqında müxtəlif fikirlər yürüdürlər. Şeyx Nizami Gəncəvinin də mağara haqqında və Keyxosrovun Dərbənd yaxınlığındakı bir dağda saxlanan qızıl taxtı barədə yazıları vardır. Bunlar yuxarıda qeyd edilən iddialarla da uyğun gəlir. Xülasə, bəzilərinin zənn etdiyi kimi, əgər Keyxosrov Arazdan keçdikdən sonra Gürcüstana hərəkət etmək istəsəydi, o zaman iki çayın (Kür və Araz) qovşağı olan Cavad keçidinə gəlməzdi. Bundan anlaşılır ki, o, Albaniyaya səfər etmişdir. Bu hadisə, ehtimal ki, Rubas çayı dəhnəsindən başlayan, Təbərsərandan keçən, Dərvaq və Qaytağa gedən çox çətin keçidli bir dar dərədə vaqe olmuşdur. Qədim kitablarda məşhur olan “Sur dərəsi” ola bilsin ki, bu dərədir. Bunun belə adlanması da Dərbənddən uzanan sədd münasibətilə ola bilər, çünki “sur” ərəbcə “hasar” deməkdir. Ola bilsin ki, bu dərə “Sul qapısı”nın və yaxud Dərbəndin üç ağaclığında, bu dərənin dəhnəsinə yaxın bir yerdə, Nuşirəvanın bina etdirdiyi “Sul şəhəri”nin adı ilə adlanmış olsun. Zaman keçdikcə “l” dönüb “r” olmuşdur. Ola bilsin ki, Keyxosrov Sürhi mahalının dar dərələrindən birində, Qaytaq, Aqquşa və Qaziqumuqun bir çox tayfaları tərəfindən öldürülmüşdür; çünki “Sur” adı “hi” sözü əlavəsilə indi də bu mahalın adıdır. Bəzi tarixçilər yazırlar ki, guya Keyxosrov Gəncə qalası yaxınlığında məğlub edilmişdir; bu qeyd həqiqətdən uzaqdır; çünki burada yer düz və hamar olub heç bir dar dərə yoxdur.

Məhəmməd ibni-Xandşah (Mirxond) “Rövzətüssəfa” da, Xandəmir “Xülasətüləxbar” da və sair tarixçilər yazırlar ki, Güştasib Rum ölkəsindən qayıtdıqdan sonra, atasının yerində səltənət taxtına oturdu və İran paytaxtını Bəlxdən özü bina etdirdiyi İstəxr şəhərinə köçürtdü. O, İranda Zərdüşt dinini yaydı və bir adam göndərib, türklərin hakimi Ərcasibi də bu dinə dəvət etdi. Buna görə,

indiyə qədər bir dində olan iki tayfa arasında müxalifət və ziddiyyət törədi. Ərcasib hədsiz qoşunla İrana hərəkət etdi. Güştasib öz rəşadətli oğlu İsfəndiyar ilə qarşıya çıxdı, türklər məğlub oldular. (Güştasib) özü Farsistana döndü, İsfəndiyarı isə Ermənistan və Azərbaycanı zəbt etməyə göndərdi. Ərcasib ikinci dəfə olaraq İrana səfər etdi. İsfəndiyar yenə onu məğlub etdi və türk ölkələrinə soxularaq çoxlu qələbələrə nail oldu. Güştasib ömrünün axırlarında hökmranlığı İsfəndiyarın oğlu Bəhmənə tapşırdı, özü isə dünyadan əl çəkdi.

Ölkələr fəth etmək, Qafqaz üzərinə qoşun yürütmək, Ruma səyahət, Zərdüşt dinini qəbul etmək və İstəxr şəhərinin binasını qoymaq kimi hadisələrə baxılarsa, Kirus adının Keyxosrovdan ziyadə Güştasibə verilməsi daha münasib olar; lakin xəbərlərin dolaşıq olması və mənbələrin azlığı üzündən onu ayırd etmək çox çətindir.

Karamzinin yazdığına görə, İran padişahı Dara Ermənistanda, Azərbaycanda və bu ölkələr ətrafında qətl-qarətlə məşğul olan Skif tayfasını cəzalandırmaq üçün çoxlu qoşunla onların ucsuz-bucaqsız çöllərinə yeridi. Lakin o, heç bir iş görə bilmədi, hətta az qaldı ki, qoşunu da tamamilə məhv olsun.

İskəndərnamə adı ilə məşhur və tarixi bir əfsanədən ibarət olan farsca qədim bir kitabda yazılmışdır: İskəndər, səfəri əsnasında Bakıya gəlir. O əsrin qəhrəmanlarından sayılan bakılı Sədan şəhəri bəzəyib və əhali ilə onu qarşılayır. İskəndəri şəhərə gətirib ona lazımi xidmət göstərir. Sədan İskəndər qoşununun yaxşı atlara ehtiyacı olduğunu bilib bu tərəflərdə Xəzranguh adlanan yerdə Firuz adlı bir qocanın hədsiz ilxısı olduğuna ona xəbər verər. Bu ilxı keçmişdə Bəhmən şahın olmuşdur. İlxı Firuzun ixtiyarına keçdikdən sonra, Humay və Dara nə qədər istədilərsə də, o vermədi. İskəndər Badpay adlı bir nəfəri gizlicə göndərdi ki, Firuzun vəziyyətindən xəbər tutsun. Badpay gedib gördü ki, o dağın ətəklərində rəngbərəng çadırlar qurulmuşdur. Bunların arasında çin atlazından bir çadır qurulmuş və bir qədər camaat onun ətrafına toplanmışdır. Çadırda, turanlı qırmızısaqqal bir qoca oturmuşdu; onun əynində pələng dərisindən bir qaftan, başında isə, dövrəsi qızıl zəncirdə tikili bəbir dərisindən bir papaq və qarşısında da böyük bir əsa vardır.

Xülasə, ertəsi gün, Firuz topladığı qırx min qoşunla İskəndərlə müharibəyə çıxdı. O, İskəndərin şövkət və əzəmətindən xəbərdar olunca, təslim olaraq ilxını gətirdib təhvil verdi. Yenə o kitabda yazılmışdır ki, İskəndər böyük bir yunan şəhərinə çatdı. Əhali təslim olmaq istəmədiyindən, İskəndər bu şəhəri xarab etmək istədi. Şəhər dəniz səthindən aşağıda idi, lakin orada dağdan bir hail var idi. Ərəstu hikmət üzrə 700 batman miqdarında bir cüt yağ düzəltdi. Bu yağ, daşı əhəng kimi əritdi. Bu qayda ilə suyun yolunu açdılar və şəhəri batırdılar. Xilas olanların bəzisi Gilan şəhərinin binasını qoydu.

Müəllif deyir: Bu kitabın sözünə inanmaq olmasa da, ola bilər ki, bir zaman belə bir hadisə başqa bir şəkildə üz vermiş olsun. İran əhalisi bir çox böyük və mühüm hadisələri İskəndərə isnad etdiklərindən, bunu da ona isnad verirlər. İnkar

etmək olmaz ki, Bakı ölkəsində Bilgəh, Zirə, Bibiheybət və sair kəndlərdə və bəzi adalarda daşlar üzərində dənizə doğru gedən araba yolları görünür. Bakı şəhərində Hacı Ağa Hüseyn oğlu Hacı Babanın otağının yerində quyu qazdıqları zaman dəniz səthindən aşağıda daşla döşənmiş bir yol çıxmışdır. Bakı ilə Səlyan arasında da, dəniz sahilində təxminən səkkiz coğrafi mil aralı, suyun altında böyük bir şəhər vardır. Quba qəzasında olan Müskür mahalında, Samur çayından başlamış Şabran mahalına qədər, dəniz sahilindən təqribən iki ağac aralı, məşhur bir təpə uzanır. Xalqın dediyindən və dənizin əlamətlərindən aşkar görünür ki, bu yerlərdə bir zaman dəniz olmuşdur. Yuxarıda qeyd edildiyi kimi, şəhəri batırmaq üçün suyun buraxılması bu dənizin səthini aşağı salmış və onu Cürcan dənizi ilə birləşdirmişdir.

Belə bir hal (yəni təpə silsiləsi), Qumuq ölkəsinin dəniz sahilindəki bəzi yerlərində də müşahidə olunur. Atil çayı qolları və axmazlarının çoxluğu da bu ehtimala qüvvət verir. Məsalikülməmalik[24], Məcməülbüldan müəllifləri və sair tarixçilər yazırlar ki, quranda adı çəkilən Məcməülbəhreyn (iki dəniz qovşağı) Şirvan vilayətində olmuşdur. Musa və Xızır peyğəmbərlərin səxrəsi (qayası) də oradadır. Adına və əlamətlərinə görə bu qaya Xızır-zində[25] ola bilər.

Bakıdan türkmən sahillərinə quru yol getdiyi xalq arasında çox məşhurdur. Şərq sahillərində yaşayan əhali, at belində buraya (Bakıya) çapqına gələrmiş. Bakı şəhəri qarşısında, dəniz içərisində indi də görünən burclardan, hasarlardan, qəbir daşlarından və tarixçilər tərəfindən bu şəhərin keçmiş vəziyyəti haqqında yazılan təsvirlərdən məlum olur ki, dörd-beş yüz il bundan əvvəl abad olan yerlər indi su altında qalmışdır. Ehtimal ki, bir zamandan sonra bu yerlər yenə zahirə çıxsın.

Yadımdadır, qırx il bundan əvvəl Bakı qalasının divarı iki arşın qədər suyun içində idi; sonralar tədriclə, xüsusən bu dörd-beş ildə dənizin səthi təqribən üç şah arşını aşağı enmiş və yenə də enməkdədir. Lakin yuxarıda söylənən əlamətləri buna nisbət vermək və hər halda qəti hökm vermək müşküldür. Bu böyük məsələ ayrı tədqiqat və mülahizələrdən asılıdır.

Şeyx Nizami öz mənzum İskəndərnaməsində deyir: İskəndər, fütuhatı əsnasında Ermənistana gəlir. Bu yerin əhalisi atəşpərəst imiş. İskəndər şikar edərək Bərdə mülkünə keçir. Bərdə şəhərinin xarabaları Qarabağ ölkəsində, Kür çayı sahili yaxınlığında, indi də mövcuddur. Bu şəhəri Pişdadiyan sülaləsindən Fridun bina etdirmişdir. Nuşabə adlı bir qadın buranın hökmdarı imiş. Onun böyük şövkət və cəlalı varmış. O, qonaqpərəstlikdə səhlənkarlıq etməyib lazım gələn hər bir şeyi tədarük edər, ardı kəsilmədən İskəndərin ordusuna göndərərmiş. İskəndər Nuşabənin camal və kəmalının tərifini çox eşitmiş olduğundan, libasını

[24] "Kitabi-Məsalikülməmalik" – hicri III (IX) yetişən məşhur ərəb coğrafiyaçısı İstəxrinin əsəridir. Coğrafiyaya aid "Kitabülməsalik vəlməmalik" adlı iki kitab daha vardır ki, biri İbn-Xordadbeh, ikincisi də İbn-Hövqəl tərəfindən yazılmışdır.

[25] Xalq arasında "Xızır-zində"şəklində tələffüz olunur.

dəyişdirərək elçi sifətilə onun yanına gedir. Nuşabə işin təhərindən onu tanıyır, təzim və mehmannəvazlıq mərasimini yerinə yetirir. Aman və himayə barəsində ondan əhd-peyman alır. İskəndər öz ordugahına qayıtdıqdan sonra, Nuşabə gecə-gündüz onun barigahında qalır. İskəndərin Nuşabəyə olan məhəbbəti daha da möhkəmləşir. İskəndər oradan Əlbürz (Qafqaza) hərəkət edir. Şirvandan ötüb Dərbənd keçidinə çatır. Burada hələ şəhər yox idi. Dağ üzərində möhkəm və dar bir yerdə çox varlı və dövlətli bir qala vardı. Bu qalada bir neçə nəfər yaşayırdı, bunlar yoldan keçənlərə mane olurdular. İskəndər təslim olmağı onlara dəfələrlə təklif etdi, onlar rədd etdilər. Buna görə, hücum edərək oranı dağıtmağı hökm etdi. Bu yer o qədər möhkəm idi ki, bütün qoşun qırx gün qırx gecə çalışdı, bir iş görə bilmədi. Ancaq axırda qalanın əhli təngə gəlib təslim oldu. İskəndər onlara başqa yer verib qalanı təmir etdirdi və orada bir qədər qoşun qoydu.

Bu zaman o dağlıq yerlərin yaxınlığında yaşayan əhali İskəndərə şikayətə gəlib dedilər: Qıpçağın vəhşi xasiyyətli əhalisi bu yerləri xərabəzarə döndərir. Onlar xahiş etdilər ki, bu dağın gədiklərində bir sədd çəkilsin. İskəndər çoxlu işçi toplayıb, bu gədikləri bərkitmək üçün, o darısqal dağda daşdan bir sədd çəkməyə əmr verdi.

Qayıtdığı zaman birinci mənzildə ona dedilər ki, bu ətrafda Sərir adlı çox gözəl və mükəmməl bir qala vardır. Keyxosrovun taxtı, tacı və qəbri burada bir mağaranın içərisindədir. Onun nəslindən bir şahzadə bu yerin əmiridir. İskəndər Keyxosrovun taxtı olan qalaya getdi. Bu qalaya “dərvaza” da deyirlər. Səririn əmiri onu qarşıladı; İskəndər buradakı qızıl taxtı, mağaranı, dağları və bir çox qəribə şeylər gördü. Oradan çölə qayıdıb bir həftə ovla məşğul oldu. Sonra Rudbar yolu ilə Xalxala, oradan Gilana və daha sonra Rey mülkünə getdi.

Mavəraünnəhrdə şəhərləri bərpa etməkdə ikən, ona xəbər çatdı ki, Rus tayfası Qıpçaq əhalisilə bərabər, saysız-hesabsız bir miqdarda, Dərbənd və onun ətrafına yol tapmışlar... Bərdə şəhərini alıb Nuşabəni də, bütün qızlar ilə bir yerdə, əsir aparmışlar. İskəndər oradan külli qoşunla hərəkət edib Xarəzm yolu ilə Qıpçaq çölünə gəldi. Bu ölkənin gözəl qadınları naməhrəmdən üzlərini örtmürdülər. İskəndər geniş bir çöldə, böyük bir su kənarında düşdü.

Rus əmiri Kontal Rus, Aysu, Portas, Peçeneq, Alan, İlaq və Xəzərdən ibarət yeddi tayfadan topladığı 900.000 artıq bir qoşunla İskəndəri qarşıladı. Bir neçə gün çox şiddətli müharibə getdi, nəticədə İskəndər qalib gəldi. Kontal on bir nəfərlə əsir düşüb sülh etdi. Nuşabəni və sair əsirləri çoxlu şeylə bərabər geri qaytardı. İskəndər xərac qoyduqdan sonra Kontalı sair əsirlərlə bərabər azad edib geri qayıtdı.

Kvint Kurtsi[26], təqribən dörd yüz il İskəndərdən sonra yazdığı tarix kitabında bu hadisələrin çoxunu bir qədər dəyişdirərək başqa şəkildə göstərir:

[26] Kvint Kurtsi - Roma tarixçisidir, ehtimala görə, I əsrdə yaşamışdır. Yunan mənbələrinə əsasən Makedoniyalı İskəndərin tarixini yazmışdır.

Nuşabə, ehtimal ki, İskəndərə məhəbbət yetirən və onun ordusuna gələn Amazon məlikəsi imiş. Böyüksu Atil və ya Don çayıdır. Skif həmin yeddi tayfadan ibarət olmalıdır; çünki qədim tarixçilər bütün şimal əhalisini skif adlandırırdılar. Dərbənd qalası həmin qalaçadır ki, fəthi başqa bir şəkildə yazılmışdır.

Dərbəndnamə və sair kitablarda da İskəndərin Dərbənd səddini təmir etməsi haqqında izahat verilmişdir. Dərbənd, xalq arasında indi də "Səddi-İskəndər" adı ilə məşhurdur. Diqqətlə baxılsa Quranda da bu məsələ qeyd edilmişdir. Qurandakı ayələrin məzmunu belədir: "Zülqərneyn yola düşüb getdi, günəşin batdığı yerə çatdı. Gördü günəş isti bir bulağa batır; yenə yol alıb günəşin doğduğu yerə çatdı. Burada günəş bir xalqın üzərinə düşürdü, onların günəşə qarşı heç bir hailləri yox idi. Yenə yoluna davam etdi, iki sədd arasına çatdı. Onların (iki səddin) yaxınlığında söz qanmayan bir xalqa rast gəldi. Onlar dedilər: "Ey Zülqərneyn! Yəcuc və Məcuc bu ölkədə fitnə və fəsad törədirlər: sənə xərac versək, bizimlə onlar arasında bir sədd yaradarsanmı?" İskəndər cavab verdi: allahın mənə verdiyi dövlət kifayətdir. Sonra o, işçilər və dəmir parçaları tələb etdi. Bir-birinə müqabil iki nüqtənin arasında bir sədd çəkildi. Onlar (Yəcuc və Məcuc) bu səddin üzərinə çıxa bilmədilər və onu deşməyi də bacarmadılar.

Bir çox təfsirçilərin və məşhur tarixçilərin yazdıqlarına görə, Zülqərneyn Rum, İran və ya Məğrib və Məşriqin padişahı olan Makedoniyalı İskəndərdir. O, Afrikanı və Qıpçaq çölünü fəth etmişdi. Deyirlər ki, onun tacında iki buynuz vardır, bu da iki cıqqaya işarə ola bilər. Bulaq da, su axınından ibarət olub, qərbi Okyanus dənizinə işarədir, Mədari-sərətanə yaxın olduğundan burada hava isti və dənizin suyu axmaqdadır.

Yunan tarixçilərinin yazdıqları kimi, İskəndərin Məğrib-zəmində ucsuz-bucaqsız qumsal və isti çöllərdən keçərək Yupiter məbədinə getməsi də bu mətləbi təsdiq edir. Qıpcağın çılpaq çöllərində yaşayan vəhşi əhalinin həqiqətən günəşdən qorunmaq üçün heç bir imarət, meşə və bağları yox idi. Qərb ilə şərq arasında keçən üçüncü yol, şimala doğru getməlidir; çünki cənuba doğru gedərsə qarşıya okean çıxar. İki sədd - Ermənistan və Azərbaycanın iki sıra dağlarından və Xəzər ilə Qara dənizdən ibarətdir. Dil bilməyənlər isə Qafqazın cənub tərəflərində yaşayan xalqlardır. Dillərinin qəribəliyi, çoxluğu və ya inkişaf etməməsi üzündən onları anlamaq mümkün deyil. Yəcuc və Məcuc Yafəs nəslindən olub, şimalda yaşayan vəhşi və qarətkar tayfalardan ibarətdir. Deyirlər ki, Yəcuc türklərdən, Məcuc isə dağlılardandır.

Bu məsələni Tövratın təfsiri də təsdiq edib deyir: Skif tayfası, Yafəsin oğlu Məcuc nəslindən nəşət etmişdir, bunlar Qafqaz dağının ətəyində sakindirlər; skiflərin burada Məcuc adlı bir şəhəri də var imiş, ona Yaropol da deyərlərmiş. Yəcuc İsrail övladından birinin adıdır; cadugərlər padişahının adı da Yəcuc idi.

Eronim və başqalarının təfsirinə görə, Məcuc Kaspi, yəni Xəzər dənizinin sahilləri yaxınlığında, Yəcuc isə bunlardan daha uzaqda, şimalda yaşayırlarmış. Hər iki tayfa skif hesab olunur. Sədd də Dərbəndin həmin hasarıdır, ona külli

dəmir işlədilmişdir. İki müqabil olan nüqtə də Xəzər dənizi və Qaytaq dağlarıdır, yaxud da - Xəzər ilə Qara dənizdir...

Müəllif deyir: Madam ki, İskəndərin Ermənistana və Gilana gəlməsi, Venedik dənizindən Qanq çayına qədər və cənubi Okyanus dənizindən Qara dənizə və Xəzər dənizinə qədər ölkələri istila etməsi isbat edilmişdir, o zaman, bu yerlərə yaxın olub və keçmişdə bir çoxları tərəfindən dünyanın axırı sayılan və İskəndərin qəribəliklər yurdu adlanan Qafqaza gəlməsi, İranı, şimalın vəhşi tayfaları şərrindən qorumaq üçün bir sədd çəkdirməsi, ya da başqa tədbirlər görməsi təəccüblü və ağıldan uzaq bir məsələ deyildir. İslam və erməni tarixçilərindən bir çoxunun verdiyi məlumat... sədd xarabalarının varlığı və xalq arasındakı şöhrəti, başqa əlamətlər və Kvint Kurtsinin coğrafi cəhətdən rabitəsiz olsa da - İskəndərin Qafqaza gəlməsi haqqındakı bəyanatı, onun bu ölkəyə (Qafqaza) gəlməsini və səddin onun əmrilə tikilməsini aydın bir surətdə göstərir.

Bəzi tarixçilər və alimlər bu xüsusda şübhələnmişlər; onlar dünyanın vəziyyətindən lazımi dərəcədə xəbərdar olmadıqları və öz təsəvvürlərini başqalarının fikri ilə qarışdırdıqları üçün belə olmuşdur. Buna görə də, əxbar kitablarını və tarixi əsərləri qarışıq bir hala salmışlar. Misal olaraq bir neçə nümunə göstərmək olar: Katib Çələbi “Cahannüma” adlı əsərində deyir ki, aparılan tədqiqata görə, Makedoniyalı İskəndər Zülqərneyn deyildir. O, (Zülqərneyn) İbrahim (peyğəmbər) ilə müasir olub, Yəmən himyərilərindən bir padişah idi. Zülqərneyn dünyanın şərq və qərbini dolandı və səddi dünyanın sonunda bina etdi. Bu bina, ehtimala görə, şimal-şərq tərəfdə bəlli olmayan bir yerdədir. Dərbənd səddi haqqında da deyir: bu, İskəndərin səddi ola bilməz; çünki Nuşirəvan bu səddi Şirvan, Ermənistan və Azərbaycan vilayətlərində qətl və qarət ilə məşğul olan Xəzər tayfasının və sair türklərin qarşısını almaq üçün bina etdirmişdi. Fars padişahları daima onlarla müharibə edirdilər. Deyirlər ki, onu əvvəlcə Güştasib oğlu İsfəndiyar bina etmişdi. Nüzhətülqülub müəllifi səddin bina edilməsini Güştasibin atası Lührasibə nisbət verir və onun Nuşirəvan tərəfindən ancaq təzələndiyini bildirir. Katib Çələbi kimi bir alimin fikrinə təəccüb etməlidir. O öz iddiasının doğruluğuna heç bir dəlil və sübut gətirmədən bu məsələni açıq-açığına inkar edir; İmam Fəxrəddin Razi[27], Qazi Beyzavi[28] və başqaları Makedoniyalı İskəndərə Zülqərneyn və Dərbənd hasarına da Yəcuc və Məcuc səddi dedikləri üçün onların fikrini doğru hesab etmir. Bunu təsəvvür etmir ki, səddin binası

[27] Fəxrəddin Razi – Şərqdə yetişən böyük alim və filosoflardan biridir. Hicri 554-cü (=1159) ildə Rey şəhərində anadan olmuş və 606-cı (=1209/10) ildə Heratda vəfat etmişdir. Müxtəlif elmlərə aid bir çox əsərlər yazmışdır.

[28] Qazi Beyzavi – tarixçi olmaqdan artıq bir təfsirçi kimi şöhrət tapan Beyzavi, İranin Beyzavi şəhərində anadan olmuş və hicri 685-ci (=1286/87) və ya 691-ci (=1291/92) ildə vəfat etmişdir. Müxtəlif mövzularda yazmış bir çox əsəri vardır. Əsərlərini ərəb dilində yazan Beyzavi, yalnız “Nizamüttəvarix” adlı tarix kitabını fars dilində yazmışdır. Bu kitab, dünyanın yaradılışından hicri 674-cü (=1275) ilə qədər olan hadisələri təsvir edir.

Nuşirəvandan əvvəl İsfəndiyara nisbət verildiyi kimi, İskəndərə də nisbət verilə bilər. Fərz edək ki, onu Zülqərneyn himyəri bina etmiş və sonra dağılmışdır. İskəndərin yenə onu təmir etməsi ağıldan uzaq deyildir. Çünki İbrahimin peyğəmbərliyə çatması hicrətdən 2543 il əvvəl, İskəndərin taxta oturması isə hicrətdən 958 il əvvəl vaqe olmuşdur. Arada 1500 ildən artıq bir müddət vardır. Yenə ehtimal ki, bu padişahlardan hər biri, vadilərdə və dağlarda binalar tikdirmiş və ya xaraba qalanları təmir etdirmişdir. Nuşirəvan isə indiki hasarın (Dərbənd səddinin) hamısını sonradan tikdirmişdir.

O (Katib Çələbi), fəsadçı, soyğunçu və vəhşi türk tayfalarını Yəcuc və Məcuc adlandırmaq istəmir, çünki bəzi tarixçilərin isnad etdikləri əsassız nişanələr onlarda yoxdur. Ola bilər, onlar bunu yalnız kinayə yolu ilə söyləmişlər. Mövcud səddi burada qoyub, əsla olmayan bir mövhum səddi göstərir. Plutarx[29] və Strabonun yazdıqlarına görə, Albaniyadan Pompeyə qarşı göndərilən qoşunun miqdarını nəzərə aldıqda, təsəvvür etmək olar ki, Albaniya İsanın anadan olmasından təqribən 65 il əvvəl əzəmətli və qüvvətli bir dövlət imiş. Pompey Pont padişahı Mitridadı məğlub və Ermənistan padişahı Tiqranı özünə tabe edən Roma sərdarlarından birincisidir. Pompey öz qoşunu ilə Qafqaz dağlarından keçərək Qara dənizin şimal-şərq tərəflərinə gedən Mitridadı təqib etmək istəyir. O bu məqsədlə albanlardan və iveriyalılardan yol istədi, onlar da birinci dəfə onun tələbini qəbul etdilər. Lakin qış olduğundan Pompey Kürün kənarında qışladı. Bu zaman albanlar qırx min nəfərlə gözlənmədən onunla müharibəyə gəldilər. Pompey albanların çaydan keçməsinə mane ola bilərdi, lakin keçincəyə qədər onlara hücum etmədi. Albanlar Kür çayını keçdikdən sonra, Pompey müharibəyə başladı və onları yaman bir halda məğlub etdi. Bu əhvalatdan sonra, Albaniya padişahı Orizi çarəsiz qalıb, barışıq istədi və buna da nail oldu.

Pompey qarşısına qoyduğu səfərə davam etdi. Kolxidaya çatdıqda ona xəbər verdilər ki, albanlar birinci dəfə olaraq toplaşmışlar. O (Pompey), getdiyi yol ilə geri qayıtdı. Kürü və Kür ilə Araz çayı arasındakı susuz çölləri və çətin yolları keçdikdən sonra, Abaza çayı kənarında 60 min piyada və 12 min süvaridən ibarət Albaniya qoşununa rast gəldi. İkinci dəfə, onları məğlub etdi. Qoşun sərdarı olan Albaniya padişahının oğlu Kozisi də öz əlilə öldürdü. Pompey albanları oradan üç günlük məsafədə olan dəniz sahilinə qədər təqib etmək istəyirdi. Lakin bu nahiyədə olan çoxlu zəhərli ilan onun yürüşünə mane oldu. O, buradan Kiçik Ermənistana qayıtdı.

Qeysər ləqəbi daşıyan Roma imperatorlarının ilk hökmdarlıqları dövründə albanlar İveriya sultanlarilə müttəfiq idilər. Onlar Ermənistan vilayətləri uğrunda parfyanlarla - yəni Kürdüstan tayfası ilə - romalılar arasında gedən çəkişmələrə

[29] Plutarx – məşhur yunan tarixçisidir, 46-ci ildə anadan olmuş və 120-ci ildə vəfat etmişdir. Əsərlərindən ən məşhuru “Müqayisəli tərcümeyi-hallar” adlı kitabıdır.

müdaxilə edirdilər. O dövrün hadisələrini qeyd edən tarixçi Tatsitin[30] yazdıqlarından ən məşhuru budur: Qeysər Tiberi öz səltənəti zamanında İveriyada səltənət sürən Farazmanın qardaşı Mitridadı Ermənistan əyalətinə təyin etdi. Lakin Ermənistan səltənətinə göz tikmiş parfyan padişahı Artaban bu işə razı deyildi. Farazman, albanlarla bərabər Mitridada kömək edirdi. Dağıstan, Şirvan və indiki Gəncə mülkü adlanan Qarabağ dərəsi yolu ilə Sərmat tayfasından onun köməyinə qoşun gətirdilər, bu iş yaxşı nəticə verdi. İran vilayətlərindən bir çoxu Parfyan və Ermənistan sultanlarının əlində idi; Albaniya da ermənilərin ixtiyarında və istilası altında idi.

Erməni tarixçisi Çamçiyan deyir: Ermənistan padişahı Artaşes Sanatruk oğlu, miladın 88-ci ilində Alan, yəni Muğan səhrasında birləşmiş Alan, Dağıstan, Kuhistan iveriyalıların bəzisi ilə müharibəyə girişərək onlara qalib gəldi. Alan padişahının oğlu Saten əsir alındı. Erməni qoşunundan bir dəstə Kürün sol tərəfinə də keçmişdi. Alan padişahı sülh etmək istərdi. Onun qızı Satenek Kürün kənarına gəlib, çayın o biri kənarında olan Artaşes isə mütərcim vasitəsilə danışığa başladı və dedi: "Ey ağıllı və güclü padişah! Rəva deyildir ki, qardaşımın öldürülməsi üzündən iki şövkətli və əzəmətli padişah arasında daimi ədavət düşsün". Artaşes (bunu eşidib) Kürdən keçdi, üz-üzə onunla danışığa başladı, onun kamal və camalına aşiq oldu. Sonra öz qoşununun sərdarı Sumbatı, qızın atası Alan padişahının yanına elçiliyə göndərdi. Qohumluq baş tutdu, Saten azad edildi və hər iki padişah da öz hökumət mərkəzlərinə qayıtdılar.

Bir zaman keçdikdən sonra, Alan padişahı vəfat etdi və onun sərdarlarından biri səltənətə keçdi. Saten qaçıb Artaşesə pənah apardı, o da Sumbatı külli qoşunla onun köməyinə göndərdi. Böyük bir vuruşma oldu, səltənəti qəsb edən sərdar türk ölkəsinə qaçdı. Sumbat onu Dərbəndin o tərəfinə qədər təqib etdi. Fəth və zəfərə nail oldu. Onun qoşunlarından bir çoxunu öldürdü və bir çoxunu da əsir aldı. Onlar Ermənistan ölkəsində Ağrı dağının ətrafında yerləşmişdilər. Saten öz atasının mülkündə müstəqil oldu. Qaziqumuq şəhəri ətrafında bir kəndlə bir dağın indi də Sumbat adı ilə məşhur olması bu mətləbi təsdiq edir.

Ermənistan padişahı Xosrovu, miladi 258-ci ildə öz əmisi oğlu Anak, Udi şəhəri yaxınlığında hiylə ilə öldürüldü. Xosrovun vərəsələri də Anakı bir çox övlad və tabeləri ilə bərabər öldürdülər. Anakın iki kiçik yaşlı oğlunu lələlər götürdülər; böyüyü həzrət Corcisi Qeysəriyyəyə, kiçiyi Sureni də bibisinin - Haptaq padişahı Cavanşirin arvadının yanına gətirdilər. Sonra Suren 39 il Dərbənddə hökmranlıq etmişdir. Xosrovun qətlindən sonra, Ermənistan ölkəsində iğtişaş başlandı, Ərdəşir Sasani bu ölkəni istila etməyə və Xosrovun nəslini kəsməyə qalxışdı. Bu zaman Ermənistan əmirlərindən Artavazd Xosrovun oğlu Tiridatı götürüb Qeysəriyyəyə qaçdı.

---

[30] Tatsit – məşhur Roma tarixçilərindəndir, I əsrin ikinci yarısında anadan olmuş və II əsrin birinci rübündə vəfat etmişdir.

Tiridat çox qüvvətli və şücaətli idi, əsgəri xidmətə girərək yüksək şöhrətə malik oldu. Axırda Roma qoşunu ilə gəlib Ermənistan ölkəsini aldı. Daha sonra, 289 və 290-cı illərdə İveriya, Əğvan və Massageteni ələ keçirdi. Sumbat övladından Sumbat adlı birini göndərib, Alan padişahının qızı Əşkəni aldı. II Xosrov bundan olmuşdur. Əğvanlar ikinci dəfə iğtişaşa başladıqları üçün Tiridat yenə gəldi. Hər iki tərəfdən çoxlu qoşun toplandı; Muğan səhrasında çox şiddətli bir müharibə oldu. Ermənilərin böyük sərdarı qoca Artavazd öldürüldü. Tiridat bundan qəzəblənərək, özü müharibəyə girişdi. Alanda doğulmuş Baslas padişahı cəsur Katarhun, Tiridata bir kəmənd atdı. Tiridat kəməndi kəsib onu öldürdü. Xülasə, əğvanlar məğlub oldular. Tiridat onları təqib etdi. Nəsl və qaynayıb-qarışma səbəbilə bir tayfa hesab edilən alan, baslas, haptaq və hunları özünə tabe etdi. Onlardan girov alıb geri qayıtdı. Bundan sonra, sasanilərdən Hürmüzün oğlu Şapur ilə müharibəyə başladı. Azərbaycanı aldıqdan sonra, onunla barışdı...

Vaqarşapat şəhərini Ermənistan padişahı Vaqarş miladi II əsrin axırında bina etmişdi. Tiridatın vəfatına qədər bura Ermənistanın paytaxtı olmuşdur; indiyə qədər də ermənilərin böyük xəlifəsinin (patriarxının) oturduğu yerdir.

Məhəmməd Əvvabi Aqtaşi (Ağdaşlı), hicri XI əsrin əvvəllərində Şamxal Çoban bəy Gəray xan oğlunun xahişinə görə, İndiri kəndində ixtisarla farscadan türkcəyə tərcümə etdiyi Dərbəndnamədə deyir: Türklərlə iranlılar arasında daimi müharibə getdiyindən Şirvan, Ermənistan və Azərbaycan ölkələrinə onlardan zülm və təxribat yetişirdi. İran padişahı Qubad Firuz oğlu Sasani, paytaxtı Atil çayı kənarında olan Xəzər padişahı Xaqan ilə barışıb, onun qızını aldı. Xaqanın 400000 nəfər qoşunu var idi. Moskva, Noqrad - ehtimal ki, Novqorod olsun - və bütün ruslar ona (Xaqana) xərac verirdilər. Bundan sonra Qubad elçi göndərib, istədi ki, iki ölkənin arasında bir sədd çəkdirsin. Xaqan da buna razı oldu. Qubad tarixlərdə görmüşdü ki, müqəddəs hesab edilən Dərbənddə İskəndər Zülqərneynin səddi olmuşdur. Deyirlər ki, bu səddin bir mil qədəri Xəzər dənizinin içində olub, qalan hissəsi isə Qara dənizə qədər uzanıb getmişdir. Qubad əmr etdi ki, hasarı torpağın və qumun altından çıxarıb təmir etsinlər. Hasarı Təbərsəranın yuxarısına qədər çəkib, ona dəmir qapılar saldılar. Bundan sonra Dərbəndin cənub tərəfindəki divarı çəkdirdi və şəhərin binasını qoydu. Bu işlərin hamısı yeddi ildə tamam oldu. İş bitdikdən sonra, xəzərilərin çox qüvvətli olmasına baxmayaraq, onların bu möhkəm hasara əl tapa bilməyəcəklərinə arxayın oldu. Xaqanın qızını atasının evinə geri qaytardı ki, nəslin qarışması üzündən ölkənin işlərinə ixtilal yol tapmasın.

Deyirlər ki, bu səddi Qubaddan əvvəl Bəhrami-Gurun oğlu Yəzdicird də təmir etdirmişdir. Bu təmir Nuşirəvan dövründə tamam oldu. Qubad və Nuşirəvan - hər ikisi İran vilayətlərindən müxtəlif xalqları köçürüb bu ölkədə bir çox şəhər və kənd bina etdirmişdir. Nuşirəvan atasının səltənəti dövründə xeyli zaman bu ölkədə yaşamışdır. O, Dərbənd səddindən əvvəl (Xəzərlər səddi də adlanır) İsfəndiyar Güştasib oğlunun dənizdən dağa qədər çəkdirdiyi Alğon səddinin uçulan yerlərini

təmir etdirdi. Ona Babi-Alan adlı bir darvaza saldırdı. Nuşirəvan özü də burada sakin oldu. Sonra atasının icazəsilə Dərbənd ətrafında 360 qala və şəhər bina etdi. İran vilayətlərində bir çox əhalini köçürüb buralarda sakin etdirdi. Alğon səddindən Əhrana qədər olan yerləri yeddi vilayətə böldü və hər birinə ayrı-ayrı əmir təyin etdi:

1. **Gülbax.** Burada, Qoysu çayının sağ kənarında, indiki Çilyurd yerində Əhran şəhərini; İndiri kəndinin aşağı tərəfində, Qızılyarda Sürxab qalasını; İndiri kəndinin yuxarı tərəfində, Çumlu adlanan yerdə Kiçi-Macarı; indi Minarət və daha əvvəllər Tatartop adlanan Ulu-Macarı bina etdirdi.

2. **Tumanşah mülkü.** Burada, Tarxu şəhəri yerində, Səməndər qalasını; bunun üç ağaclığında, dəniz kənarında İnci qalasını (xarabaları indi də qalır); Tarxu ilə İndiri kəndi arasında Keyvan qalasını; Əhran, yəni Qoysu çayı kənarında Bəlx şəhərini və qoşun iqamətgahı olan bu şəhərin qalasını çayın sol kənarında bina etdirdi. Şəhərin şimal tərəfində də bir neçə qala tikdirdi. Nuşirəvan, Tuman qəbiləsinə yerləşdirmiş olduğu bu yerləri, Həmri hüduduna qədər, bu qəbilə əmirlərindən birinə tapşırdı. Ona Tumanşah adı verdi. İsfəndiyar Əhran şəhərində qızıl taxta oturduğundan, Əhranı bu ölkənin hamısı üçün mərkəz qəbul etdi. Terek çayı dəhnəsindəki gümüş və Əhrandakı mis mədənlərini Əhranın sərdarına verdi. Qoysunun sol kənarında, Çilyurdun üst tərəfində bir isti su vardır. İndi də ona Gülbax isti suyu deyirlər.

3. **Qaytaq**. Nuşirəvan buraya əmir təyin edərək qalalarını təmir etdirdi. Gilan və Kaşandan bir çox əhalini buraya köçürdü və onu nizama saldı. İndi Köbəçi adlanan Zirihgəran da buruya daxildir.

4. **Qumuq dağlarında və onun ətrafında olan yerlər**. İndi Qaziqumuq, Aqquşa mahalları, Avar və sair hissələrdən ibarətdir. O buraya Filanşah ləqəbli bir əmir təyin etdi.

5. **Təbərsəran.** Buranın əhalisi çərxçi və Dərbəndin ən yaxşı qoşunlarından olub, Təbəristan və İsfahandan gəlmədir. Bunların əmirinə Hicranşah deyirdilər.

6. **Massaget.** Bu yer Təbərsəran və Qumuq dağlarının aşağı tərəfindədir. Əhalisi alanlar olub, sayca başqalarından az idi. Əmirləri də Bütünşah adlanırdı.

7. **Şabran və Müskür**. Bu yerlərdə Şabran, Bağdad, Gərgər şəhərlərini və axırıncı şəhərin bir ağaclığında Abad şəhərini; Müskürdə Kəsran şəhərini, Dərbəndin üç ağaclığında Sul və ya Sur şəhərini və bunlardan başqa sair şəhər və kəndləri bina etdirdi; Fars əhalisindən bir qədərini köçürüb Müskür, Kürə və Axtıda yerləşdirdi. Öz sülaləsindən onlara bir əmir təyin etdi. Nuşirəvan bu qayda ilə ölkə işlərini və sərhədlərin mühafizəsini möhkəm bir surətdə nizama salıb geri qayıtdı. Bu zaman Xaqan, Gülbax vilayətini ələ keçirib öz sərdarını Əhranda oturtdu. Deyirlər ki, Nuşirəvandan əvvəl İsfəndiyar da həmin qala və kəndləri təmir etdirib yeddi vilayətə bölmüşdü. Əhran ətrafındakı qalaların əhalisini Xorasandan köçürtmüşdü və onun sərdarı Əhranda otururdu.

Axtınamədə deyilir ki, Sasanilər sülaləsindən Şah-Bani adlı bir əmir, Nuşirəvanın əmrilə fars əhlindən 60 ailə və 300 nəfər əsgərlə gəlib, Axtı adlanan yerdə bir qala tikdirdi və orada sakin oldu. Bu qalanın asarı dağın başında indi də durur. O, 1500 əşrəfi sərf edərək Axtı isti suyunun üzərində bir hamam tikdirdi və ona xərac qoydu. 560-cı ildə, Nuşirəvan otuz illik səltənətdən sonra, Adil ləqəbi aldı. Bu münasibətlə ətrafın rəisləri hamamın qabağında toplaşıb məşvərət etdilər. Şah-Banidən xahiş etdilər ki, Nuşirəvan hamam xəracını onların üzərindən götürsün. Şah-Bani bu məqsədlə, oğlu Şah-Asanı o zaman Azərbaycanda olan Nuşirəvanın hüzurinə göndərdi və onun xahişi qəbul edildi. Bundan sonra Şah-Bani 15 il daha hökmranlıq edib vəfat etdi. Oğlu Şah-Asan onun yerinə keçib 12 il hökmranlıq etdi.

Tarixi-güzidə sahibi hicri 730-cu (=1330) ildə yazır: Nuşirəvanın Dərbənd ətrafı əmirlərinə verdiyi ləqəblərin və təşrifatın bəziləri indi də söylənməkdədir: Filanşah və Şirvanşah kimi.

Ömər ibni-Vərdi[31], “Xəritətül`əcaib” adlı ərəbcə qədim coğrafiya kitabında yazır: Babül`əbvab İranın şimal tərəfində vaqedir. Çoxlu meyvə bağları olan bu şəhər, Nuşirəvan tərəfindən Xəzər dənizi kənarında bina edilmişdir. Bu Xəzər tayfası qarşısında bir haildir (səddir). Qapıları Qaytaq dağları keçidindəndir, məsələn, Babüssul, Babi-Alan, Babüssabran, Babi-Laziqə, Babüssəcəsi, Babi-Sahibüssərdir, Babi-Filanşah, Babi-Karumanşah, Babi-İranşah və Babi-Liyanşah. Dərbənd dərya kənarında, böyük yol üzərində vaqedir və buranın ən böyük qalalarından olduğuna görə, Babül`əbvab adı ilə şöhrət tapmışdır. Dərbənd hasarının silsiləsi uca bir dağa doğru uzanıb gedir. Bu hasar bir tərəfdən o biri tərəfə keçməyə mane olur. Bu dağda çoxlu qala da vardır.

Əbülhəsən Məsudi deyir: bu ölkədə 300 şəhər var və hər bir şəhərin də, bir-birinə oxşamayan, ayrı dili vardır. Hovqəli[32] deyir: Mən bunu inkar edirdim, lakin özüm təhqiq edib bildim. Bu ölkənin çox nüfuslu və abad məmləkətlərindən biri də Şirvanşah vilayətidir. Bu vilayət vüsətli olub çoxlu nahiyələri, kəndləri və imarətləri vardır. Bu yerin əhalisi dikbaş olub heç kəsə itaət etməzlər. Şirvanşahlar səltənətini Nuşirəvan qurmuşdur.

Rövzətüssəfa, Xülasətüləxbar müəllifləri və bir çox başqa tarixçilər yazırlar: xaqanın qızını Nuşirəvan almış və onu boşayıb atasının evinə geri qaytarmamışdı. Nuşirəvanın bundan Nuşizad və Hürmüz adlı iki oğlu oldu. Bu qadın Zərdüşt dinini qəbul etməmişdi. Onun böyük oğlu Nuşizad da, hədd-büluğa çatdıqdan sonra, atəşə sitayiş etmədi. Buna görə o, atasının hökmilə həbsə alındı. Nuşirəvan

---

[31] Ömər ibni-Vərdi – Hicri 690-cı (=1291) ildə Suriyada anadan olmuş və 749-cu (=1349)ildə Hələb şəhərində vəfat etmişdir. “Xəritətüləcaib”dən başqa dil, ədəbiyyat, hüquq tarix, fəlsəfə və təsəvvüfə aid bir çox əsər yazmışdır.

[32] İbn-Hovqəl olmalıdır. İbn Hovqəl – Hicri IV (=X) əsrin ən məşhur səyyahlarından biridir. “Kitabülməsəlik” adlı əsəri gəzdiyi və gördüyü yerləri təsvir edir.

Şam vilayətində fütuhat ilə məşğul ikən, onun şiddətli bir surətdə xəstələnməsi haqqında Nuşizad yalan bir xəbər aldı. O, həbsxanadan çıxıb, başına çoxlu adam yığdı. Atasının təyin etdiyi məmurları Farsdan, Ehvazdan qovdu və İraqı almaq məqsədilə o tərəfə hərəkət etdi. Nuşirəvan bu əhvalatdan xəbərdar olub, İran sərkərdələrindən Ranbərzinə bir hökm yazdı və onu oğlunun fitnəsini dəf etməyə təyin etdi. Ranbərzin şahzadəyə nə qədər nəsihət etdisə də fayda vermədi. Müharibə əsnasında Nuşizad bir oxla yaralanıb öldü.

Nuşirəvan 48 il səltənətdən sonra, miladi 578-ci ildə və hicrətdən 44 il əvvəl vəfat etdi. Nuşirəvanın xəzər xaqanı qızından olan ikinci oğlu Hürmüz İran taxtına oturdu. Bu münasibətlə ona türkzad deyirdilər.

Rövzətüssəfa sahibi deyir: Hürmüz dövründə Xəzər tayfası Dərbənddən keçib Ermənistan və Azərbaycan ölkələrini qarət etdilər. Bu çapqın hicri 4-cü (=626) ildə vaqe oldu. Rum qeysəri Herakli onları bu ildə İranla müharibəyə təşviq edirdi.

Tarixi-güzidə sahibi və sair tarixçilər deyirlər: Hürmüz zülm etməyə başlayınca, xalq ona qarşı üsyan qaldırıb sikkəni onun oğlu Xosrov Pərvizin adına vurdurdular. Buna görə Xosrov Pərviz atasından qorxub Azərbaycana gəldi. Muğan və Bacərvanda olduğu zaman, “Bərdə” hökmdarı Mihinbanu gəlib onu Bərdəyə apardı və ona mehmannəvazlıq etdi. Xosrov Mihinbanunun qardaşı qızı Şirini sevib axırda onu aldı. Şeyx Nizami bu əhvalatı məşhur “Xəmsə”sinin beş poemasından biri olan “Xosrov və Şirin” kitabında gözəl bir surətdə təsvir etmişdir.

Nuşirəvandan sonra Şirvan vilayəti haqqında ayrıca bir məlumat yoxdur. Ancaq bu qədər məlumdur ki, xəzərlərin istilası və İran səltənəti işlərinin qarışıqlığı nəticəsində Şirvan iğtişaş məhəlli olmuşdur. Bu hal ərəb qoşununun gəlib, ardı-arası kəsilməyən müharibələr ilə şimal tayfalarını məğlub və bu vilayəti ərəb ölkəsinə ilhaq edincəyə qədər davam etmişdir.

## İKİNCİ FƏSİL

### *ƏRƏB QOŞUNUNUN AZƏRBAYCANA GƏLMƏSİNDƏN BAŞLAYARAQ MOĞOLLARIN İSTİLASINA QƏDƏR*

Tarixi-Təbəri, Tarixi-güzidə və Rövzülmitar kitablarında deyilir: Ömər ibni-Xəttab[33] İran ölkəsini fəth etdiyi zaman, Süraqə ibni-Əmri Azərbaycanı almağa göndərdi. O, bu ölkəni fəth etdikdən sonra, hicri 22-ci (=644) ildə, Bəkr ibni-Əbdüllahı Şirvan səmtini mühafizə etməyə göndərdi. Sonra Əbdürrəhman ibni-Rəbiəni pişdar təyin edib, özü də onun ardınca o tərəfə hərəkət etdi. Əbdürrəhman Muğan, Bəkr isə Ermənistan tərəfindən hərəkətlə, bir çox yerləri aldılar. Bu yerlərin bəzisini hərb ilə, bəzisini də sülh ilə ələ keçirdilər. Araz üzərindəki Xudafərin körpüsünü Bəkr tikdirmişdir. O zaman ermənilər ərəb qoşununun zülmündən qaçıb, Qarabağın çətin gedilən yerlərinə sığınmışdılar. Onların çoxu indi də bu yerlərdə yaşamaqdadır. Bərdə şəhəri o zamandan xarabalığa üz qoydu. Xülasə, Bəkr və Əbdürrəhman Şirvanın yaxınlığına çatınca, o yerin padişahları nəslindən olan vilayət hökmdarı Şəhriyar aman istədi və sülh etdi, bu şərtlə ki, xərac və cizyə verməsin və bu vergilər, türkləri və sair müxtəlif din sahiblərini dəf etmək üçün saxlanacaq qoşuna sərf edilsin. Onlar Şəhriyarın bu təklifini Süraqə ibni-Əmrə yazdılar, o da bunu Ömər ibni-Xəttabın hüzuruna göndərdi. Xəlifə də bunu qəbul etdi. Ərəblərlə şirvanşahlar arasında bu qayda həmişə saxlanırdı. Süraqə qoşun başçılarından hər birini, bir dəstə qoşunla, keçidlərə və dağlıq yerlərdəki şəhərlərə göndərdi. Alan və Xəzər keçidlərinin hamısını möhkəmləndirib, müsəlmanları bu yerlərdə sakin etdi.

Süraqə vəfat edincə, Ömərin əmrilə Əbdürrəhman onun yerinə təyin edildi. O da qoşun götürüb 200 ağaclıq məsafəsi olan bir keçidə girdi. Bir çox şəhərin əhalisi müsəlman oldu, Gürcüstan əhalisi ilə də, cizyə vermək şərtilə, sülh bağlandı. Bəzi başqa xalqları da müsəlman edib, yenə Dərbəndə gəldi. Osmanın[34] xilafəti zamanında burada vəfat etdi...

Həbibüssiyərdə deyilir: Osman ibni-Üffanın əmrilə, Həbib ibni-Səlmə ərəb qoşunu ilə Ermənistana, Azərbaycana, Muğana və Şirvana gəldi, başlıca üsyançıları sülh ilə yola gətirdi. Ondan sonra - Osmanın vəfatına qədər - Hüzeyfə ibni-Yəman, Müğeyrə ibni-Şəbə və Əşəs ibni-Qeys bu hüdudda hökmran idilər.

Dərbəndnamə sahibi deyir:

... Hicri 41-ci (=662) ildə, səhabələrdən Səlman və Rəbiətülbahili, 4000 igid və döyüşkən qoşunla, xəzərlərin geri aldıqları Dərbəndə doğru hərəkət etdilər. İslam qoşunu gəlincə, Dərbənd Narınqalasının mühafizləri Həmri qalasına qaçdılar. Müsəlmanlar qalanı və Dərbənd şəhərini ələ keçirdilər. Xəzər padişahı

---

[33] Ömər ibni-Xəttab – xüləfayi-raşidindən ikinci xəlifədir (13-23=634-644).

[34] Osman ibni-Əbdülməlik - xüləfayi-raşidindən üçüncü xəlifədir. (23-35=644-656)

Xaqan, külli qoşunla onları dəf etməyə gəldi. Müsəlmanlar da onu qarşıladılar. Dərvaq çayı kənarında hər iki tərəf üz-üzə gəldi. Ərəblərin şücaəti haqqında çox şeylər eşitmiş olan Xaqan, müharibə etmək istəmirdi, zənn edirdi ki, silah onların bədənlərinə kar etmir. Bu halda, xəzərlərdən bir nəfər dəniz sahilinə getdi, orada tək başına çimməkdə olan bir müsəlmanı öldürdü, başını kəsib, Xaqanın hüzuruna gətirdi. Bu əhvalatdan sonra, müharibəyə cəsarət etdilər. 5 gün səhərdən axşama qədər hərb meydanı qızışdı, hər iki tərəfdən bir çox camaat qırıldı. 6-cı gün Xaqan öz qoşununu çox məzəmmət edib dedi: bu gün hər kim müharibədən üz çevirsə, mükafat olaraq məndən əzab görəcəkdir. Bu tərəfdən də, müsəlmanlar cəhad şövqilə ruhlanmışdılar. Səlman və Rəbiə öz qoşun dəstələrinin qarşısında, 40 nəfər könüllü ilə düşmənə həmlə etdilər. Çox şiddətli bir müharibə oldu, Xaqanın qoşunundan neçə min nəfər öldürüldü. Səlman ilə Rəbiə də bu 40 nəfər ilə birlikdə öldürüldü. Bunların qəbirləri, Dərbənd şəhərinin yanında, Qırxlar adı ilə ziyarətgahdır. İslamın qalan qoşunu məğlub oldu, yaralılar Dərbəndə və buradan da Şama qayıtdılar. Xaqan, Dərbənd şəhərini mühafizə etmək üçün 3000 nəfər əsgər təyin edib, öz paytaxtına qayıtdı.

Əməvilərdən Vəlid ibni-Əbdülməlik[35], hicri 86-cı (=705) ildə, xilafətə oturduğu zaman, öz qardaşı Müsliməni 40000 igid əsgərlə Dərbəndi almağa göndərdi. Müslimə əvvəlcə Naxçıvan ölkəsində, Araz çayı kənarında - indi də xarabaları məlum olan - Cülah şəhərini aldı. Sonra Lahıcan şəhərini alıb viran etdi. Bundan sonra Şirvana gəldi. Müskürə qədər ələ keçirdiyi yerlərdə hakimlər təyin etdi. Buradan da Dərbənd üzərinə yürüş edərək oranı mühasirəyə aldı. Lakin qalanı almaqdan məyus olub, qayıtmaq fikrində idi. Bir gecə qaladan bir nəfər gəlib dedi; əgər onu dünya malından təmin etsələr, bildiyi gizli bir yol ilə qoşunu qalaya daxil edər. Müslimə bu işə könüllü bir nəfər istədi, kimsə cəsarət etmədi. Bu halda, Əbdüləziz Bahili iki oğlu və qəbiləsindən yüz nəfər igidlə bu işi yerinə yetirməyi öhdəsinə aldı, bu şərtlə ki, Beytülmala çatacaq xümsdən başqa, qənimətlərin hamısı ona çatsın. Sonra dağ tərəfindən 6000 nəfər də onların ardınca getdi. Bələdçinin göstərişilə lağım atıb, Dərvaq tərəfindən yer altındakı dərvazanı açdılar. Qalaya elə daxil oldular ki, qarovulçulardan kimsə bunu bilmədi. Gecə yarısı müharibə başlandı. Xəzərlər öz can və əhli-əyallarını müdafiə edirdilər. Müharibə sülh açılıncaya qədər davam etdi. Sülh zamanı, müsəlmanlar qalanın dərvazasını tutdular, İslam qoşununun hamısı içəri daxil oldu. Xüms çıxıldıqdan sonra, bütün qənimətləri Əbdüləzizə verdilər. O da bu qənimətləri qalanı almaqda iştirak edən 6000 nəfər əsgər arasında bölüşdürdü. Bələdçilik edən kişiyə də çoxlu mal verib bir qulluğa qoydular.

Müslimə, özündən sonra xəzərlərin əlinə keçməsin deyə, qalanın dağıdılmasını məsləhət gördü. Qoşun sərkərdələri də onun rəyini təsdiq etdilər. Ancaq Əbdüləziz dedi: bu boş bir xəyaldır; çünki xəzər tayfası gəlib, onu

---

[35] Vəlid ibni-Əbdülməlik - əməvilərdən altıncı xəlifədir (86-96=705-715).

əvvəlkindən də yaxşı təmir edər. Nə qədər Dərbənd onların əlində olsa, Ermənistan və Azərbaycan ölkələri salamat qala bilməz. Müslimə onun sözünü qəbul etməyib, qala divarının hər iki tərəfdən dağıdılmasına əmr verdi. Əbdüləzizi də Ermənistan və Azərbaycan hakimi təyin edib Şama qayıtdı. Xəzər tayfası yenə Dərbəndə gəldi, lakin onlar qalanı təmir etmədilər. Hər il oradan keçib, Ermənistan və Azərbaycanı qətl və qarət edirdilər. Bu ölkə əhalisindən peydərpey gələn şikayətlərə görə, Müslimə ikinci dəfə 40000 qoşunla Dərbəndə gəldi. Qalanı təmir edərək, burada 5000 nəfər əsgər qoyub, Şama qayıtdı. Bundan bir neçə il keçdi. Dərbənd mühafizləri xəzərlərin qorxusundan qaladan bayıra çıxa bilmirdilər. Xəzərlər dərədən keçib Ermənistan və Azərbaycanı çapırdılar. Ermənistan və Şirvan hakimi Əbdüləziz Bahili, hərdənbir müdafiəyə qalxışırdısa da, onları dəf etməyə gücü çatmırdı...

Hicri 103-cü (=722) ildə Əbdüləziz vəfat etdi. O əsrin xəlifəsi Yəzid ibni-Əbdülməlik[36], Əbü Übeydeyi-Cərrahı 6000 nəfər əsgərlə Dərbənd mühafizlərinin köməyinə göndərdi. Xaqanın oğlu da öz qoşunu ilə Həmriyə gəldi. Əbu Übeydeyi-Cərrah Müskürə gəlib o ətrafın qalalarındakı qoşunları toplayaraq Rubas çayı kənarında dayandı. O, Təbərsəran və Qaytağın hələ də islam dinini qəbul etməmiş olan əmirləri ilə görüşüb dedi: "Mən Ərəbistandan xəzərlərin müharibəsinə gəlmişəm, sizin də bu xüsusda mənə kömək etmənizi arzu edərdim". Ləzgi rəislərindən Artanış adlı bir nəfər, bu əhvalatı gizlicə Xaqanın oğluna bildirdi. Əbu Übeydeyi-Cərrah bundan xəbər tutub, üzdə dedi ki, guya o, burada ancaq 3 gün dayanacaqdır. Lakin gecə, məşəllərin işığı ilə Rubas çayından və Dərbənd şəhəri içərisindən keçdi. O, Avayın çeşməsi yanında, sağ cinah əmirini 2000 atlı ilə Qaytaq tərəfinə və sol cinah əmirini də 2000 nəfərlə Təbərsəran tərəfinə çapqına göndərdi. Tapşırdı ki, günəş doğunca ordugaha qayıtsınlar. Sağ cinah əmiri 12000 qaramal, qoyun və 700 əsirlə, sol cinah əmiri də 40000 qaramal, at, qoyun və 2000 əsirlə geri qayıtdı. Onlar bunlardan əlavə bir çox başqa qənimətlər də gətirdilər. Xümsünü çıxdıqdan sonra, bu qənimətlərin hamısını qoşun arasında bölüşdürdülər. Xəzər şahzadəsi bu xəbəri eşidəndən sonra, müharibə qəsdilə Həmridən hərəkət etdi. Əbu Übeydə də qarşıya çıxdı. Dərvaq çayı kənarında iki qoşun bir-birilə üzləşdi... Hər iki tərəfdən dava təbili vuruldu, bayraqlar ucaldı, çox şiddətli bir müharibə başlandı. İki tərəfdən də çox adam qırıldı. Axırda xəzər qoşunu müqavimət göstərə bilmədi, bütün təchizatını buraxaraq, qaçıb qurtardı. Müsəlmanlar onları təqib edib qətl və qarət edirdilər. O gün xəzərlərdən 7000 nəfər və müsəlmanlardan 2000 nəfər öldürülmüşdü. Xaqanın oğlu çox çətinliklə özünü İnci şəhərinə yetirib dedi: "Gördüyüm düşmən çox güclüdür, əgər sizə kömək gəlməzsə, özünüzü qaçmaqla qurtarın". Oradan Bəlxə gedib Bəlx, Ulu Macar, Kiçik Macar, Qızılyar və sairin hakimlərini Əhran hakiminə tapşırdı. Ölkənin mühafizəsi üçün lazım gələn əsgəri tədbirləri görüb, özü paytaxta qayıtdı.

---

[36] II Yəzid ibni-Əbdülməlik - əməvilərdən doqquzuncu xəlifədir (101-105=720-724).

Əbu Übeydeyi-Cərrah Qayakənd yaxınlığında bir təpə üzərində vaqe olan Həsin qalasını alıb, indi Tarxu adlanan Səməndər şəhərinə getdi. Buranın əhalisi təslim oldu. Buradan İnci qalası üzərinə gəldi. Bu qala bir tərəfdən dağ, o biri tərəfdən dəniz ilə yanaşı idi, dağ ilə dəniz arasında da bir hasar vardı. Buranın əhalisi, yerin möhkəmliyinə, su və azuqənin bolluğuna arxalanıb, qalanı müdafiə etməyi qərarə aldılar... Müsəlmanlar ətrafdan 12000 araba toplayıb, üzərlərinə taxta yığdılar. Qoşun da bunların ardınca gedərək şəhərə daxil oldu. İncinin əmiri ərkə sığındı və gecə bir neçə nəfər rəis və əsgərlə İnci ilə Bəlx arasında olan Keyvan qalasına çatdı. Sübh zamanı müsəlmanlar İnci əhalisini islama dəvət etdilər, qəbul etməyəni öldürdülər və ya əsir aldılır. İnci qalasını da dağıtdılar.

Rövzətüssəfa və Güzidə kitablarında deyilir: Əbu Übeydeyi-Cərrah Xəzər mülkünü qətl və qarət edib, Azərbaycana qayıdandan sona, Xəzər Xaqanı türklərin müxtəlif qəbilələrindən kömək istəyib, 300 min qoşun topladı. Xaqanın oğlu Pəşənk, o cəmiyyətlə Dərbənddən keçərək, Kür və Araz çayları qovşağında düşdü. Qoşununu ətrafı çalıb-çapmağa göndərdi. Bu zaman Əbu Übeydənin qoşunu dağınıq bir halda idi. Özü də atəşgədəni dağıtmaq üçün Ocan səhrasına getmişdi. Yanında olan azacıq qoşunla xəzərlərin qarşısına çıxdı. Şiddətli bir müharibə oldu, müsəlmanlar məğlub olub çoxlu tələfat verdilər. Əbu Übeydeyi-Cərrahın özü də öldürüldü və ailəsi əsir düşdü. İslam qoşunu ilə bərabər olan və Azərbaycanın böyük adamlarından sayılan Mərdanşah da öldürüldü. Türk qoşunları Azərbaycan və Ermənistan ölkələrində qətl və qarətə başladılar. Ermənistanda zərb olunan dirhəmlərdən məlum olur ki, bu vilayət həmin iğtişaş zamanı xəlifələrin əlindən çıxmamışdır. Xülasə, bu xəbər, o dövrün xəlifəsi Hişam ibni-Əbdülməlikə[37] yetişdi. O, hicri 114-cü (=733) ildə Səid ibni-Əmri-Hərşini böyük bir qoşunla türklərin müharibəsinə göndərdi. O da, bir çox qələbələrdən sonra, Qarabağ Beyləqanına yetişdi. Eşitdi ki, Xaqanın oğlu müsəlman qalalarından birini mühasirəyə almışdır, az qalmışdır ki, qaladakılar təslim olsunlar. Bu zaman fars şahzadələrindən Xüdavəndi-əsbi-əbləğ adlı Xəzər dilini bilən bir nəfəri göndərdi ki, qaladakılara onun gəlməsini bildirsin. Şahzadə ertəsi gün oraya çatdı. Xəzərlər onu tutub soruşdular: - Sən kimsən və hara gedirsən? O dedi: - Ərəb sərkərdəsi məni göndərdi ki, qaladakılara onun gəlməsini xəbər verim. Xəzərlər ona dedilər: - Əgər qurtarmaq istəyirsən, qalanın yanına gedib de ki, ərəb qoşunu hələ çox uzaqdadır. Şahzadə dərvazaya yaxınlaşıb səsləndi: - Ey müsəlmanlar, tanıyırsınız? Sizə müjdə olsun! Səidi-Hərşi külli qoşunla Bəyləqandadır. İki üç gündən sonra, gəlib sizə çatar. Mərd və igid olun!

Müsəlmanlar təkbir dedilər. Xəzərlər şahzadəni oradaca parça-parça etdilər və özləri də köçüb Ərdəbilə tərəf getdilər. Bu zaman ağ atlı və ağ paltarlı bir şəxs Səidin yanına gəlib dedi: - 2000 nəfər xəzər 5000 islam əsiri ilə filan yerdədirlər. Əmir casus göndərib onun sözünü təhqiq etdi, söz doğru çıxdı. Əmir 40000 nəfər

---

[37] I Hişam ibni-Əbdülməlik - əməvilərdən onuncu xəlifədir (105-125=724-743).

götürüb, səhərə yaxın qəflətən onların üzərinə töküldü. Bir çoxunu öldürdü və əsirləri geri aldı. Qılıncdan qurtaranlar Xaqan oğlunun ordusuna qaçdılar. Səid külli qənimətlə geri qayıtdı. Ağ atlı yenə gəldi, Səid ona dedi: - Ey xoşxəbər kişi, sən harada qaldın, sənin üçün yaxşı hissə və pay saxlamışam. O, cavabında dedi: - O pay əmirin yanında daha yaxşı qalar, mən indi sənə başqa qənimət haqqında məlumat verəcəyəm. Budur, xəzərlərdən bir dəstə filan yerdə külli mal və əsirlə öz vilayətlərinə gedirlər. Müsəlmanlardan bir dəstə oraya gedib təkbir deyərək, düşmənə hücum etdi. Türklərdən bir çoxunu öldürüb, əsirləri azad etdilər, qənimətləri də ələ keçirildi. Səid, Əbu Übeydeyi-Cərraha mənsub olan adamları əzizləyib, onlara çoxlu mal bağışladı. Bu əhvalatdan sonra, Xaqanın oğlu kədərli bir halda vuruşmaya başladı. Səid də Bəyləqan, Bərdə və hökmü altında olan başqa şəhər və qəsəbələrə qasidlər göndərib qoşun toplamağa əmr verdi. Ağ atlı yenə gəldi və salam verdi. Səid çox şaddıqla onun salamını alıb: “Sən çox mübarək nəfəsli (xoşxəbər) adamsan. Sənin sayəndə iki dəfə düşmənə qalib gəldim, sənə çox pay və hissə ayırmışam, niyə almırsan?” - dedi. O: - “Lazım olanda istərəm, siz indi dava tədarükü görməklə məşğul olun. Xaqanın oğlu 40000 nəfərlə üstünüzə gəlir” - deyə cavab verdi. Səid öz qoşununu düzəltdi. İkindi çağı, iki qoşun bir-birinə yetişdi. Müharibə başlandı. Günbatan çağı türk qoşunu basıldı və onlardan bir çoxu qılıncdan keçirildi. Səid də öz ordugahına qayıtdı. Sübh olunca, ağ atlı yenə gəlib dedi: - “Ey əmir! Xaqanın oğlu öz dağınıq qoşununu toplayıb, yenə müharibə etmək fikrindədir”. Səid (qənimət alınmış) yükləri və malları qeyd və mühafizə etmək üçün bir dəstə adam təyin edib, qalan qoşunla yola düşdü. İki qoşun bir-birilə üz-üzə gəldikdə o: - “Kim bilir, Xaqanın oğlu Pəşənk harada durur?” - deyə soruşdu. Onun cavabında: - “Baş sancılmış ağacın olduğu yerdədir” - deyə cavab verdilər. O yenə: - “O kimin başıdır” - deyə soruşunca: - “Əbu Übeydeyi-Cərrahın başıdır” - deyə cavab verdilər. Səid igidlərlə oraya hücum edərək, Xaqan oğlunun tacına bir zərbə endirib onu atdan yerə saldı. Türklərdən bir dəstə, şahzadənin ətrafını alıb onu yenə ata mindirdilər. Müharibə atəşi şiddətli surətdə alovlandı. Axırda türklər döyüş meydanından üz çevirdilər. İslam əhlinin əlinə çoxlu qənimət keçdi. Səid bu qənimətin xümsünü Şama, Hişam ibni-Əbdülməlikə göndərdi, qalanını da 40000 əsgər arasında bölüşdürdü. Hər bir nəfərə 1700 dinar düşdü. Daha sonra, hicri 115-ci (=734) ildə Hişam Ermənistan, Azərbaycan və Şirvan əyalətlərini öz qardaşı Əbu Müslimə verdi. Ona Şam və Cəzirə qoşunlarından 24 min nəfər verib Dağıstan işlərini nizama salmağa göndərdi.

Müəllifə məlum olduğu vəchlə, Əbu Müslim haman Müslimə ibni-Əbdülməlikdir. Ehtimal ki, yazıda səhv olmuşdur və ərəb dilinin qanununa görə, Əbu Müslim onun küniyəsi və Müslimə isə adı olub, hər ikisilə də şöhrət tapmışdır. Hər halda, Əbu Müslim Dərbəndə gəlib onun hasar və burclarındakı xaraba yerləri təmir etdirmişdir. Narınqalada Nuşirəvan dövründən qalma Səhrinc adlı böyük bir imarəti sökdürüb yerində su, neft, sursat ambarları və cəbbəxana

tikdirdi. Narınqalanı çox möhkəm bir hala saldı. Qeyd adlı imarəti təmir edib, divarını yüz arşından artıq dəniz içərisinə çəkdirdi. Müəllif deyir: dörd-beş il bundan əvvəl, o Qeydin özülü bir yerindən sökülmüşdü. Bu sökükdən məlum oldu ki, böyük daşları dəmir millər ilə bir-birinə möhkəm bənd edib, aralarına da əridilmiş qurğuşun töküblər. Əbu Müslim əmr verdi ki, bütün Dağıstandan toplanan xəracı, - istər pul olsun, istərsə mal, - ehtiyac zamanı Dərbənd əhalisinə və mühafizlərinə paylamaq üçün ambarlarda saxlasınlar. Xülasə, Dərbənd əhalisinin çoxunu müsəlmanlardan təşkil edib, şəhəri yeddi məhəlləyə böldü. Hər məhəllə tayfası üçün bir məscid tikdirib, onun adı ilə adlandırdı: 1) Xəzər məscidi, 2) Fələstin məscidi, 3) Dimişq məscidi, 4) Həmməs məscidi, 5) Qeysəriyyə məscidi, 6) Cəzair məscidi, 7) Mosul məscidi. Bunlardan əlavə, cümə namazı üçün böyük bir məscid tikdirdi ki, indi də qalır. Şəhərə 6 dərvaza qoydurdu: 1) Babül-mühacir - indi Carpçı qapı adlanır, 2) Babülcəhad - indi Qırxlar qapı adlanır, 3) Babülxüms - indi Yeni qapı adlanır, 4) Babüssəğir - indi Türkmən qapı adlanır, 5) Babülməktub - indi Bayat qapı adlanır, 6) Babüləlqəmə - indi Narınqala qapı adlanır.

Əbu Müslim Dərbənd işlərini nizama saldıqdan sonra, Qumuq tərəfinə səfər bayrağını açdı. Oranın əmirləri və əhalisi, bir çox müharibədən sonra, aman istəyib müsəlman oldular. O, Qaziqumuq şəhərinin ortasına böyük bir came məscidi və bir neçə başqa bina tikdirdi. Onlar indi də durur. Şahbal və ya Şahi-Bəəl ibni-Əbdüllah ibni-Qasım ibni-Əbdüllah ibni-Abbas ibni-Əbdülmütəllibi onlara hakim təyin etdi, islam dininin şərtlərini əhaliyə təlim etmək üçün də onun yanında bir qazi qoydu. Oradan Qaytağa gəldi, buranın əhalisi şiddətli vuruşma və çoxlu tələfatdan sonra, islam dinini qəbul etdi. Qaytaq əhalisi islam dinini qəbul etdikdən sonra, Əbu Müslim öz qohumlarından Əmir Həmzə adlı bir nəfəri buraya hakim təyin etdi. Bundan sonra, əhalisinin çoxu yəhudi və dinsiz olan Təbərsəran üzərinə yürüdü. Bunlar da əvvəlcə müdafiəyə başladılar. Lakin, hakimlərinin öldürüldüyünü və bir çoxlarının tələf və əsir edildiyini görüncə, müsəlman oldular... Məhəmməd Məsum adlı bir nəfəri burada hakim qoydu. Şəriət əhkamını təlim etmək üçün də iki qazi təyin etdi. Əmr verdi ki, bütün Təbərsəran əhalisi Məsum və qazilərin hökmünə əməl etsinlər. Bu nahiyələrin mühüm işlərini yoluna qoyduqdan sonra, Tav (yəni dağ) və Avar əhalisi üzərinə hərəkət edib, onları qılınc gücü ilə müsəlman etdi. Onlar üçün məscidlər tikdirib, qazilər təyin etdi. İndiki halda, Aqquşə kəndi Tavın, Xumzaq şəhəri isə Avarın mühüm yerlərindəndir. Gürcüstan hüdudundan başlayıb, Qıpçaq çölünə qədər, Dağıstanın bütün hakimlərinə və qazilərinə, Şahbala tabe olmağı əmr etdi. Buyurdu ki, əgər Xəzər tayfası Dərbəndin üstünə gəlsə, onlar ona qarşı dursunlar. Xəzər tacirlərini şəhərin bir ağaclığında saxlayıb alver etdikdən sonra, geri qaytarsınlar. Dərbəndlilərdən ticarət qəsdilə Xəzər vilayətinə gedən olsa, onun malının üşrünü (onda birini) alsınlar. Elçi gələrsə, onu gözü bağlı şəhərə gətirsinlər, qayıtdığı zaman da bu cür yola salsınlar. Ta ki, onlar Dərbəndin vəziyyətindən xəbərdar olmasınlar. Bütün Dağıstan əhalisi üzərinə vergi təyin edib

buyurdu ki, Təbərsəran, Köbəçi və Qaytaq əhalisi hər il onu gətirib Dərbənd hakiminə versinlər. O da özünə və Əmir Həmzəyə düşən hissəni götürüb, qalanını Dərbəndin mühafizlərinə və füqərasına sərf etmək üçün ambarda saxlasın. Əgər hakim özü üçün müəyyən miqdardan artıq götürüb ədalətsizlik etmiş olsa, o zaman qoşun rəisləri onu vəzifədən xaric etsinlər. Həmri, Kürə, Quba, Qülhan, Qürah, Axtı, Xnav, Rütul, Zaxur, bütün Qumuq, Avar, Qərax, Hidat, Tarxu, Əhran və İndiri əhalisi öz xəraclarını Şahbala versinlər. Əgər Şahbalın üzərinə düşmən hücum etsə, yaxud o kafirlərlə müharibəyə getsə Qaytaq, Təbərsəran hakimləri öz qoşunları ilə onun köməyinə gəlsinlər. Dərbənd hakimi həmişə şəhəri mühafizə edib, heç bir yana getməməlidir, cümə günləri məscidi-camedə imam olaraq namaz qılmalıdır.

Katib Çələbi Cahannüma adlı əsərində Əbu Hamiddən belə nəql edir: “Dərbənd işləri nizama salındıqdan sonra, Hişam özü bu şəhərə gəlmişdir. Əhalinin xahişinə görə, öz qılıncını yadigar olaraq, Dərbəndin yaxınlığında bir yerdə qoydu. Bu yer indi də o ölkə əhalisinin ziyarətgahıdır”.

Müəllif deyir: Əhalidən mötəbər kimsələrin dediklərinə görə Xəraq mahalında, Yuxarı Təbərsəranda, Curdaf kəndi yanında mağara içərisində bir xəncər vardır. O ətrafın xalqı qurban və sədəqələr aparıb onu ziyarət edib və bu yerin ətrafını müqəddəs hesab edir. Buna görə burada, oğruya çal-çap etdiyi mal üçün cəza verilməz və qatildən də qisas alınmaz. Hətta bir adam cəsarət edib oranın meşələrindən bir ağac budağı belə kəsə bilməz. Demək olar ki, həmin xəncər Hişamın qılıncıdır. Lakin aradan uzun bir zamanın keçməsi və yerin uzaqlığı ilə əlaqədar olaraq, xəncər qılınc deyə məşhur olmuşdur.

Hicri 120-ci (=739) ildə Mərvan ibni-Məhəmməd, Hişam tərəfindən Dərbəndə hakim göndərildi. O, Əbu Müslimin qoyduğu qərarlar üzrə rəftar edirdi. Təbərsəran əhalisi hər il növbə ilə Dərbəndin küçə və məhəllələrini təmizləyirdi.

Hicri 132-ci (=751) ildə xilafət əməvilərdən abbasilərə keçdi, Əbül-Abbas Səffah[38] Dərbəndin vəziyyətini yaxşılaşdırmaq və hüdudunu mühafizə etmək barəsində son dərəcə səy edirdi. Hicri 136-cı (=755) ildə, Əbu Cəfər Mənsur[39] xilafətə oturunca, Yəzid ibni-Əsədi Dərbəndə hakim göndərdi. Bunun zamanında xəzərlər külli qoşunla gəlib Dərbəndi mühasirəyə aldılar. Onlar bir gecə hasarın dibinə xeyli ağac yığıb, bu vasitə ilə hasarın üzərinə çıxmaq istədilər, qaladakılar xəbərdar olub ağacların üzərinə neft tökərək yandırdılar. Xəzərlər məqsədlərinə nail olmadan geri qayıtdılar. Əbu Çəfər Mənsur, Yəzid ibni-Əsədi hüzuruna çağırıb soruşdu: - Dərbənd üzərindən xəzərlərin şərrini hansı tədbir ilə dəf etmək mümkündür? Yəzid ərz etdi: - Dərbəndin ətrafında xarab olmuş çoxlu qala vardı, əgər bunlar təmir edilib, hər birinə qarovulçular təyin edilərsə, o zaman Dərbəndin mühafizəsi asanlaşmış olar. Xəlifənin əmrilə Yəzid gəlib qalaların və yaşayış

[38] Əbül-Abbas Səffah – abbasilərdən birinci xəlifədir (132-136=750-754).
[39] Əbu Cəfər Mənsur - abbasilərdən ikinci xəlifədir (136-158=754-775).

məntəqələrinin təmirilə məşğul oldu. O cümlədən, Süvar, Müta, Kemax və indi Çerkəni adlanan Süfnan qalalarını təmir etdi. Bundan başqa Dərvaq, Ersi və Hümeydi kəndlərini abad etdirib Şam, Cəzirə və Mosuldan 7000 ailə gətirib buralarda yerləşdirdi. Yəzidiyyə və Sirməkiyyə adlı iki qala da bina etdirdi. Öz qəbiləsindən bir dəstə adam köçürüb buralarda yerləşdirdi. Məqatir və Mehraqəni abad edib hər yerdə qoşun qoydu. Bu qayda ilə Dərbəndi asayiş və rahatlıq içində mühafizə edirdi, xəzərlər Qoysu çayından keçə bilmirdilər.

Hicri 170-ci (=787) ildə, Harunərrəşid[40] Cəyun ibni-Nəcəmi Dərbəndə hakim göndərdi və ona tapşırdı ki, bu yerin intizamını keçmişdə olduğu kimi saxlasın. Cəyun, qala və hasarın möhkəmliyinə arxalanıb zülm və əxlaqsızlığa başladı, ölkənin idarə işlərinə göz yumdu. Dərbənd əhalisinin çoxu qaçıb-dağılmağa üz qoydu. Bu xəbər Harunə yetişdi. O, Rəbiətülbahilini Dərbəndə hakim təyin etdi. Rəbiə, Cəyunu həbsə alıb, Bağdada göndərdi. Hicri 173-cü (=790) ildə, Xüzeymə ibni-Cazim Harunərrəşid tərəfindən 12000 qoşunla Dərbənd əyalətinə gəlib, hasar və burcların xaraba yerlərini təmir etdi. Bir neçə müddətdən sonra, Harunərrəşid özü Dərbəndə gəlib oranın vəziyyətini yoxladı. Rubas çayından bir bənd çəkdirib şəhərin kənarına su gətirdi. Burada bağlar, bostanlar saldırdı və dəyirmanlar tikdirdi. Bunların mədaxilini Dərbənd yoxsullarına vəqf etdi. Həfəs ibni-Öməri Dərbəndə hakim təyin edərək, ona lazımi göstərişlər və nəsihətlər verib Bağdada qayıtdı. Deyirlər ki, Dərbəndin şimal tərəfində, Qırxlar dərvazası qarşısında bir daş günbəz vardır. Harunərrəşidin oğlu burada basdırılmışdır. Məşhur olduğu üzrə, Harunərrəşidin arvadı Zübeydə xatun bint-Əbucəfər Mənsur, uzun sürən bir qızdırma xəstəliyinə mübtəla idi. O, ab-havasının lətafətilə məşhur... olan Təbrizdə bundan səhhət tapdı. Buna görə, hicri 175-ci (=792) ildə, bu şəhəri yenidən bina etdirib adını da Təbriz qoydu. Bu əhvalatdan və Harunərrəşidin oğlunun Dərbənddə vəfat etməsindən anlaşılır ki, Zübeydə xatun da öz ərilə bu ölkəyə gəlibmiş.

Hicri 180-ci (=797) ildə, xəzərlər hücum edib bütün Dağıstanı, Dərbəndi və Şirvanı istila etdilər. Katib Çələbinin yazdığına görə, bu müharibədə 140000 nəfər müsəlman tələf oldu. Hələ bu vaxta qədər islam aləmində belə bir hadisə görünməmişdir. Əbu Müslimin əmirliyə təyin etdiyi Məsum, Şahbal və Əmir Həmzə övladının başına bu hadisələr zamanı nələr gəldiyi məlum deyildi. İslam dinini qəbul edən Dağıstan tayfaları da xəzərlərin istilası və müsəlmanların məhv edilməsi nəticəsində yenə bütpərəstliyə qayıtdılar. Hər guşədə bir əmir və hər nöqtədə bir şərir meydana gələrək, fitnə-fəsad törətməyə başladılar. Bu zaman Şirvan vilayətində Fərruxzad Əxşican oğlu[41] hökmran idi. Bakıda Bibiheybət kəndində, onun əmrilə bina edilmiş bir məscid üzərindəki kitabədə onun ləqəbi: - «əmirülmömininin yardımçısı böyük sultan» deyə yazılmışdır. Bundan məlum olur

[40] Harunərrəşid - abbasilərdən beşinci xəlifədir (170-193=786-809).
[41] Mətndə yanlışlıq var, Fərruxzad Əxsiman oğlu olmalıdır. Kəsrani şirvanşahlar sülaləsinə mənsubdur.

ki, o, müsəlman olub abbasi xəlifəsinə tabe imiş. Bundan sonra Filanşah hökmranlıq etmişdir.

Hicri 210-cu (=826) ildə, Bəyləqan tərəflərində, atəşpərəstlərdən Babək adlı bir nəfər meydana çıxdı. O, atəşpərəstlik məzhəblərindən Xürrəmgiş adlı bir məzhəbin əsasını qoydu. Bu məzhəb, ... Məzdək dininin əslini yeni bir şəklə salmaqdan başqa bir şey deyildi. Babək öz başına çoxlu tərəfdar topladı... Ardı-arası kəsilməyən müharibələrlə Azərbaycanı ələ keçirib Həmədan və İsfahanı da fəth etdi. Mötəsim[42] xəlifə İshaq ibni-Müsəəbi çoxlu qoşunla İraqi-Əcəm hüduduna göndərdi, İshaq onlardan 60000 nəfər qırdısa da yenə bir nəticə əldə edilmədi. Axırda, hicri 221-ci (=836) ildə, Mavəraünnəhr əyanlarından Aqşın ləqəbli Heydər ibni-Kavus, saysız bir qoşunla Babəki dəf etməyə təyin edildi. Müharibə iki il davam etdi. Babək məğlub olub, bir neçə nəfərlə Ermənistana, Səhəl Sunbat oğlunun yanına qaçdı. Aqşın etimad etdiyi bir nəfəri 4000 qoşunla Babəki tələb etmək üçün göndərdi. Səhəl Babəki qolu bağlı Aqşının yanına gətirdi. Səhəl təltif edildi. Babək də Bağdada göndərilib orada böyük bir əziyyətlə öldürüldü. Ehtimala görə, Azərbaycan sözü "Azər-Babəkan" sözünün ərəbcələşdirilmiş şəklidir. Azərbaycan bunun və ya başqa bir Babəkin adından alınmışdır. Məşhur olduğu üzrə, atəşpərəstlik dini bu ölkədə zühurə gəlmiş və yayılmışdır. Riyazüssəyahə[43] müəllifi Azərbaycanı Azərbayəganın ərəbcələşmişi sayır. Bu da qədim fars dilində atəşgah mənasındadır.

Xülasə, bu yol ilə Azərbaycan və Ermənistan ölkələri, yenə xəlifənin ixtiyarına keçdi. Muğanda xaraba qalmış Bərzən şəhərini Aqşın abad etdi, indi yenə viran bir haldadır. Hicri 230-cu (=845) ildə, Mötəsimin oğlu Vasiq-Billahın[44] xilafəti dovründə, Filanşahi Şirvani itaətə gəldi, Dərbənd də xəlifənin təsərrüfünə keçdi. Hicri 270-ci (=884) ildə Mötəmid[45] xəlifənin hökmü ilə Bakı Neft və duz mədənlərinin mədaxili, Dərbənd mühafiz və əhalisinə maaş təyin olundu. Məhəmməd ibni-Əmmar təhvildar idi, hər il mədənlərin mədaxilini təyin edilən miqdar ilə təqsim edirdi.

Hicri 290-cı (=903) ildə Haşim adlı bir nəfər Dərbəndə hakim gəldi. Müktəfi[46] xəlifə qəramitələr ilə hərb etməkdə idi, xilafət işlərində də bir çox qarışıqlıq hökm sürməkdə idi. Haşim istifadə edərək bütün təyin edilmiş maaşları, mədənlərin mədaxilini və Dərbənd əhalisinə yetişəsi olan kənd məhsullarını özü mənimsədi. Dərbənd əhalisi naçar qalıb, alver və qəsbkarlıqla məşğul oldu. Əxlaqsızlıq onların arasında yayıldı. Xəzərlər yenə gəlib, Dərbəndi almaq üçün çox çalışdılar. Müsəlmanlar xaricdən və daxildən hücum edərək onları məğlub etdilər.

---

[42] Mötəsim-Billah – abbasilərdən səkkizinci xəlifədir (218-227=833-842).

[43] Riyazüssəyahə - məşhur Azərbaycan alim və səyyahı Hacı Zeynalabdin Şirvaninin əsəridir. O, hicri 1194-cü (=1780) ildə Şamaxı şəhərində anadan olmuşdur.

[44] Vasiq-Billah – abbasilərdən doqquzuncu xəlifədir (227-232=842-847).

[45] Mötəmid - abbasilərdən on beşinci xəlifədir (256-279=870-892).

[46] Müktəfi-Billah - abbasilərdən on səkkizinci xəlifədir (289-295=902-908).

Bu zaman Rus tayfası, Xəzər padişahından icazə alıb, 500 gəmidə 50000 qoşunla Atil çayından Xəzər dənizinə girdi. Bu şərtlə ki, ələ keçirəcəkləri qənimətləri onunla bölsünlər. Onlar Mazandarandan başlayıb Dərbəndə qədər, dəniz sahillərində olan şəhər və qəsəbələrdən bir çox qənimətlər əldə etdilər. Dəniz sahilində yaşayan əhali isə xəzərlərin gəmiləri olmadığını bildiyindən, belə bir təhlükəni gözləmirdi.

Əbülqasim Yusif ibni-Əbüssac, xəlifə Müqtədir-Billah[47] tərəfindən, hicri 296-cı (=909) ildə 306-cı (=919) ilə qədər - on il - Ermənistan və Azərbaycan valisi idi. Şirvan da onun hökmü altında idi. O, öz cəmiyyətini toplayıb, Şirvan vilayətinə daxil olan Əli ibni-Heyşəm tərəfindən idarə edilən neft mənbəi sahilinə, yəni Bakıya gəldi.

Ruslar, bundan sonra, Bakıya yaxın adalarda sakin olmuşdular. Onların bu adalarda sakin olmasına aid bəzi izlər indi də mövcuddur...

Hicri 332-ci (=944) ildə, Məsudi bu əhvalatı yazdığı halda, İbn-əl-əsir[48] öz tarixində bundan bir kəlmə də olsun bəhs etməmişdir. Lakin İbn-əl-əsir deyir: Rus tayfası hicri 332-ci (=944) ildə, Ərranın paytaxtı olan Bərdə şəhərini almaq üçün qayıqlarla dənizdən və Kür çayından keçib gəldilər. Buranın hakimi 5000 nəfər qarşıya çıxdı və məğlub olaraq geri qayıtdı. Ruslar Bərdəni alıb, əhaliyə aman verdilər. Əhali müxalifət göstərdi, ruslar bir həftə içərisində şəhəri boşaltmağı onlara əmr etdilər... Mərzban ləqəbi ilə məşhur olan Azərbaycan valisi Məhəmməd ibni-Müsafir, 30000 nəfər qoşunla gəldi. Ruslar bir ildən artıq burada qaldılar, sonra Marağəyə səfər etdilər. Bu səfər əsnasında çoxlu meyvə yediklərindən, aralarına şiddətli xəstəlik düşür. Mərzban bu dəfə hiylə ilə müharibəyə başladı, azacıq müqavimətdən sonra qaçmağa üz qoydu. Ruslar da onları təqib etməyə başladılar. Mərzban qayıdıb hücum etdi və pusquda qoyduğu qoşun da, rusların arxasına keçdi... Bu hadisə münasibətilə qoşunla Səlmas nahiyəsinə gedən Mərzban, Şəhristanı mühasirə etmək üçün bir dəstə qoşun qoydu. Ruslar bir gecə dəyərli şeylərini çiyinlərinə alaraq, özlərini Kür çayı kənarına yetirdilər və qayıqlara minib vətənlərinə qayıtdılar.

Müəllif deyir: Ehtimala görə, bu iki hadisə haman bir səfər əsnasında vaqe olmuşdur. Lakin müəlliflərin aldıqları xəbərlər müxtəlif olduğundan, bir-birinə zidd olaraq yazılmışdır. Məsudinin yazdığına görə, hicri 332-ci (=944) ildə, Əbdülməlik adlı bir şəxs Dərbənddə, qardaşı oğlu da Təbərsəranda hökmran idi.

Bundan sonra, islam ölkələrində get-gedə qarışıqlıq və hərc-mərclik baş verdi. Bağdad xəlifələri öz qoşunlarının öhdəsindən gələ bilmədilər. Bu ölkənin işləri də nizamdan düşdü, Dərbəndə tabe olan qalalar və kəndlərdə də üsyan qalxdı. Dağıstan əmirləri isə bir-birilə müxalifətə və qovğaya başladılar.

---

[47] Müqtədir-Billah abbasilərdən on səkkizinci xəlifədir (295-320=908-932).

[48] İbnələsir-məşhur ərəb tarixçisidir, hicri 555-ci (=1160) ildə anadan olmuşdur. Onun adını Şərq və Qərb aləmində şöhrətləndirilən "Əl-kamil fittarix" adlı kitabıdır.

Mərdavic ibni-Ziyad sülaləsinə mənsub və Gilanın qədim hakimləri nəslindən olan Deyləm padişahları, hicri 315-ci (=927) ildə, Təbərsəranda xüruc etdilər. Bunlardan 6 nəfəri İran vilayətlərində bir çoxunda 150 il hökmran olmuşlar. Məlum olduğu üzrə, onlar bu tərəflərə də əl atmışdılar. Çünki bu sülalənin ikinci padişahı olan və hicri 323-cü (=935) ildən başlayaraq 33 il hökumət sürən Şəmkir ibni-Ziyad, Gəncə yaxınlığındakı Şəmkir şəhərini öz adına bina etdirmişdi. Şəhərin asarı: məscid güldəstəsi olan ikiqapılı uca bir minarə, körpü və qala xarabası indi də qalır. Bu şəhər Əmir Teymur Kürəkən dövründə və ondan sonrakı dövrlərdə də abad idi.

Axtınamədə deyilir: xəzərlər Şirvanı istila etdikləri zaman, öz əmirlərindən Səmsam adlı bir şəxsi, bir dəstə ilə indiki Mikrağ kəndinin yerində sakin etdilər. Şam əhlindən Əmir Kağı adlı bir şəxsi də ona vəzir təyin etdilər. Səmsama kömək olmaq üçün xəzərlər Samur çayının sol kənarında başqa bir şəhər də saldılar. Tərsa dedikləri bu şəhər əhalisini indiki Qızlardan gətirmişdilər. Səmsam, Şəhbani qalasını almaq və Şəhbani nəslindən olan bu yerin əmiri Dərvişaini tələf etmək istəyirdi. Dərvişai 3000 əşrəfi göndərib Tərsa əmirlərini özünə tərəf cəlb etdi. Səmsam üç dəfə bu qalanı mühasirə etdisə də, məqsədinə çatmadan qayıtdı. Birinci dəfə mühasirənin müddəti bir ay çəkdi. Qala əhli üçün Axta çayından su gətirmək çətin idi, buna görə də, onlar suyu çox əziyyətlə Samur çayından gətirirdilər. Səmsam qayıdandan sonra, Dərvişai üç ayın müddətində qaladan Axtı çayına örtülü bir yol çəkdirdi. Yolun və yol üzərindəki burcun asarı indi də qalır. İkinci dəfə mühasirənin müddəti altı ay davam etdi, lakin qaladakılar darlıq çəkmədilər. Səmsam üç ildən sonra, üçüncü dəfə olaraq yenə gəldi. O, bu dəfə yuxarı tərəfdən gəlib qalanın yanında yeddi il dayandı. Dərvişai çarəsiz qalıb Tərsanın əmirlərini və Rütul, Cınıq və Rüfuqun təcrübəli adamlarını köməyə çağırdı. Yeddi ay da bu müharibə davam etdi. Hər iki tərəfdən çox adam öldü. Dərvişainin oğlu Şah Qasım da bu müharibədə məğlub olub, öldürüldü. Axırda Səmsam məğlub olub geri qayıtdı və 15 il sakit olaraq öz yerində oturdu. Bir gecə Səmsam öz qoşunu ilə qəflətən Tərsa kəndi üzərinə tökülüb əhalini qırdı. Mal və əyallarını qarət və əsir edib apardı. Bundan doqquz il keçdi, Dərvişai Dərbəndə, Əbu Müslimin yanına gəlib, ondan kömək istədi, Əbu Müslim də öz bacısı Ümmülmöminatı, müsəlman olan Dərvişaiyə verdi, onu qoşunla bərabər göndərdi ki, gedib Səmsam şəhərini alsın və xəzərlərin kökünü kəssin. Müharibə yeddi ay uzandı, heç bir nəticə əldə edilmədi.

Axırda, Dərvişai Şeyxşahi-Əlbürzinin obasına gəldi. Bu adam Qüreyş tayfasından olub, Əlbürz ölkəsində yurd saldığından bu ləqəblə tanınırdı. Ətəyində yaşadığı dağ da onun (Şeyxşahın) adı ilə şöhrət tapmış və çox işlənmək nəticəsində Şalbürz olmuşdur. Şeyxşah gizlicə bir nəfər göndərib Səmsamın vəziri şamlı Əmir Kağını öz yanına dəvət etdi. Bunlar məşvərət edərək, Səmsamın əleyhinə ittifaq bağladılar. Əmir Kağı şəhərdəki təbəələrini xəbərdar etdi. Dərvişai cümə gecəsi dərvazanın yanına gəldi. Əmir Kağının təbəələri onları şəhərə buraxdılar. Əmir

Kağı onlardan on nəfərlə gedib Səmsamı öldürdü. Dərvişai divanxanaya gəlib, xalqı islama dəvət etdi. İslamiyyəti qəbul edənlər öz mallarına sahib oldular. Qəbul etməyənləri öldürüb mal və ya əyallarını qənimət olaraq apardılar. Şəhər də Əmir Kağının adı ilə adlandı. Bir zaman keçdikdən sonra, bu ad Mikrağ şəklinə düşdü. Sonra Dərvişai, Əmir Kağı və Şahi-Əlbürzi Dərbəndə Əbu Müslimin yanına getdilər. Əbu Müslim bunlara çox nəvaziş etdi. Şəhbani kəndini də Üxti, yəni bacıya mənsub deyə adlandırdı. Bu da çox işlənmə nəticəsində Axtı şəklini almışdır. Əhalinin dediyinə görə, Axtı məscidinin cənub divarı Əbu Müslim tərəfindən bina edilən divarın qalığıdır.

Bu zaman Səmsamın qaçıb qurtaran adamlarından beş nəfəri Şahi-Əlbürzinin obası üzərinə tökülüb, onun bir oğlunu öldürdülər, iki qızını da mal və dövlətilə bərabər əsir apardılar. Arvadı ikinci oğlu ilə qaçıb qurtardı. Buna görə, Şahi-Əlbürzi Əmir Kağı şəhərindən Qüreyş obasına 30 ev köçürüb, oranı özü üçün oturaq seçdi. Samur çayının sol tərəfində, Kələkürənin qarşısında olan bu obanın adı - çox işlənmək nəticəsində - indi Quruş şəklinə girmişdir. Qıpçah adlı yerdə bir şəhər xarabası vardır ki, xalq tərəfindən Qəmqam adlanır. Bura Tərsa əmirlərinin məskəni olmuşdur. Bu yerin Qıpçah adlanması əhalisinin keçmiş vətəni olan Qıpçaq adından alınmış ola bilər. Çox ehtimal vardır ki, bu əhvalat hicri 5-ci əsrdə Şeyx Əbu Müslimin dövründə olmuşdur; çünki o, öz ailəsi ilə bu ölkədə sakin idi. Daş bir günbəz altında olan qəbri də Xumzaq qəsəbəsində məruf və məşhurdur. Bizcə bu Şeyx Əbu Müslim xəlifənin qardaşı Əbu Müslim deyildir; çünki xəlifənin qardaşı öz qoşunu ilə gəlib yenə geri qayıtmışdır. Onun öz bacısını gətirib burada ərə verməsi də ağlasığan bir məsələ deyildir.

Məhəmməd Rəfi Əbdürrəhim oğlu Şirvani hicri 712-ci (=1313) ildə bir tarix kitabı yazmışdır. O, bu kitabı yazmaq üçün qədim məktub və vəsiqələrdən, bir də hicri 318-ci (=931) ildə yazılan bir əsərdən istifadə etmişdir. Müəlifin haman tarix kitabının 1030-cu (=1617) ildə yazılan nüsxəsində belə deyilir: Həmzənin qızı Ümmatın nəslindən olan Şeyx Əbu İshaq İbrahim, Şeyx Əhməd və Şeyx Əli, Abbas ibni-Əbdülmüttəlibi - Qüreyşi övladından Şeyx Məhəmməd, Şeyx Nasirəddin ilə bərabər, hicri 200-cü (=816) ildə Hərəmeyndən, yəni Məkkə və Mədinədən çıxdılar. Onlar 2000 nəfər əqrəba və tabelərilə Şam ölkəsinə gəldilər. Bir neçə ildən sonra 5000 nəfərlə Misrə gedib bir neçə il də orada qaldılar, bir çox ölkəyə səfər etdilər. Sonra, o dövrdə müharibə meydanı olan Çərkəz ölkəsinə gəlib çıxdılar. Bunlar uzun müddət cəhd edib, Əmir Əzzalı öldürdülər, onun mal və dövlətini qənimət aldılar. Buradan da Qaytaq vilayətinə gəlib, onun əmiri Qəzənfəri öldürdülər. Mal-dövlətini və xəzinəsini ələ keçirib əhalini də müsəlman etdilər. Ərəblərin adətinə görə qəbilə içərisində yaşca böyük olanlar əmir olurdu, o biriləri də danışıqsız və boyun qaçırmadan ona itaət edirdilər.

Bu dövrdə Əmir Çoban Sultan Əli bəy oğlu onların rəisi idi. Təbərsəran əhalisinin çoxu müsəlman oldu. Əmir Çoban öz qızını Təbərsəran əmiri Məsum bəyə verdi və onun qızını da özü üçün aldı. Qaytaqda bir çox kənd saldırıb, Qumuq

əmirləri ilə əhdnamələr bağladı. Bir neçə müddətdən sonra öz əhdini sındırıb, qəflətən onların üzərinə hücum etdi. Əmirlərdən bir çoxunu öldürdü və şəhərlərini ələ keçirərək əhalisini islam dininə gətirdi. Öz qohumlarından, Şam vilayətinin Xal kəndində doğulmuş və babasının adı ilə adlanan Şamxalı o yerlərə əmir təyin etdi. Bundan sonra cənubdakı dağlara tərəf gəlib Qəbələ mahalından sayılan Maza şəhərini aldı və buranı özü üçün məskən intixab etdi. Bu kəndin kişi və qadınları onun qulu idi. Maza ərəbcə bir söz olub "Bu nədir" deməkdir.

Əmir Çoban kafirlərin ətrafda olan bir çox kəndlərini xarab etdi. Quruş əmirlərindən İsmayıl bəy və Həsən bəylə əhdnamə bağladı. O, Şamaxı nahiyəsinə qədər bütün dağ əhalisindən xərac, cizyə və dəhyek alırdı. Məktublaşma və elçilər vasitəsilə Şirvanşah Sultan Firidun ilə barışıq etdi. Qızını onun oğlu Keyqubada verdi və onun qızını da oğlu Sultan Süleyman üçün aldı. Bir müddət bunların arasında dostluq davam etdi. Axırda xərac və dəhyek üstündə aralarında ədavət düşdü, bir neçə vaxt hərb etdilər, sonra yenə barışdılar. Qumuq şəhəri türklər tərəfindən xarab edilən zaman, Həsən - Ələvi - Səfəvi burada qazi idi. O, Məhəmməd Rəfi Şirvaninin yuxarıda adı çəkilən tarixindən istifadə edərək başqa bir əsər yazmışdır. Dağıstanda çox yayılmış olan əsərdə, yuxarıda söylənilən hadisələr bəzi fərqlərlə daha geniş bir surətdə təsvir edilir. Bu əsərdə göstərdiklərimizdən əlavə deyilir: İndi Xumzaq yaxınlığında bir kənd vardır. Bu kənd keçmişdə Avarın qədim paytaxtı Tanıs şəhəri idi. Burada Süraqə adlı şövkətli və şücaətli bir əmir olurdu. O, müsəlmanlıqdan dönüb bütpərəst olmuşdu. Ləqəbi Novsal idi. Avarlılar padişahlarına bu ləqəbi verdilər.

Müəllif zənn edir ki, onun nəsəb silsiləsi (şəcərəsi) doğru deyildir. Buna da bəzi halların və adların münasibətsizliyi səbəb olmuşdur. Hər halda, bu əmir, Süraqə ibni-Sərətan ibni-Urusxan ibni-Ümməxan ibni-Firuzşahdır, özü də, Ərəskani nəslindəndir. Şamaxı hüdudundan Çərkəz vilayətinə qədər olan sahəni öz idarəsi altına almışdır. O, Əkərə qəsəbəciyindən başqa bütün əmirliklərdən və camaatdan vergi olaraq hər cür mal, pul, taxıl, mal-qara, qumaş, meyvə, hətta yumurta da alırdı. Vergilərin miqdarı bu qədər idi: ildə hər ailədən üç dirhəm gümüş və ya bu qiymətdə qızıl; bir kil[49] ən çox sərf edilən taxıl; hər bir tacirdən iki top bez; hər bağdan bir çuval üzüm; hər bir qatildən 100 qoyun; cani və oğrudan bir öküz; hər bir kənddən yeni taxtda oturan padişahı təbrik etmək üçün biri qara və dördü sarı olmaqla beş tülkü dərisi və beş qoyun; vəfat edən padişahın basdırılması üçün bir at; padişah ailəsində edilən toy üçün bir öküz və iki qoç.

Qumuq və Qaytaq ölkələrinin ayrı-ayrı əmirləri var idi. Qaytaq əmiri çox şövkət və əzəmətə malik Qəzənfər adlı bir şəxs idi. Misir və Şamdan cəhd edərək, Rum və Hindistan hüduduna qədər getmiş olan Həmzə və Abbasın xələfləri, axırda Şirvana gəlmişdir. Səfər tədarükü görüb yaxşı fillər, dəvələr və atlarla cəhad üçün Dağıstana yürüş etdilər. Bunların gəlmək xəbərini eşidən Dağıstan əhalisi və Rus

[49] Taxıl – dənə ölçüdüdür, xalq "kilə" deyir.

tayfası Çur və ya Sur şəhəri yaxınlığında tam mənasilə toplaşdılar. Müsəlmanlar düşmənin vəziyyətini öyrənmək üçün igid adamlarından 100 nəfərini kəşfiyyata göndərdilər; düşmənin çoxluğundan və qüvvəsindən qorxuya düşdülər. Vəziyyətdən çıxmaq üçün belə bir hiylə düşündülər: bir xeyli xörək bişirib ona zəhərli ot qatdılar və az bir mal ilə onu ordugahda qoydular. Hərbə girişincə qaçmağa başladılar. Düşmən qoşunu ordugahı aldı və xörəkləri yedi. Onlardan saysız-hesabsız adam tələf olub, dağılmağa üz qoydular. Müsəlmanlar qələbə qazandılar. Əvvəlcə Qaytaq vilayətini alıb viran etdilər. Əmir Çoban Sultan Əli bəy oğlu burada hakim oldu. O bir çox kənd saldırdı, o cümlədən Qüreyş qalasını bina etdirərək özünə hökumət mərkəzi təyin etdi. Burudan Avara getdi. Bu yerin əmiri Bayar Süraqə oğlu özünə tabe olan Tuş nahiyəsinə qaçdı. Müsəlmanlar ardı-arası kəsilmədən qalib gəlirdilər. Bir zaman keçdikdən sonra, onların xələfləri Krımı da ələ keçirdilər. Xülasə, Avarda bir çox kəndi viran etdilər. Xumzaq şəhərini güclə alaraq kişiləri öldürdülər, onların arvadlarını və mallarını isə qənimət olaraq apardılar. Bu ölkənin hamısı müsəlmanların ixtiyarına keçib əhalisi müsəlman oldu.

Şeyx Əhməd övladından Məsum bəy adlı bir nəfər əmirliyə keçdi, bu yerin fəzilətli alimlərindən Əbu Müslim də ölkənin qazisi və imamı oldu. Bütün Dağıstan, bir qismi müharibə və təxribatla, bir qismi də sülh ilə bunların ixtiyarına keçdi. Sonra bunlardan Şamxal adlı bir nəfər Qumuq şəhərində bütün Daqıstana əmir oldu. Bu zamandan etibarən “şamxal” sözü mənsəb və vəzifə mənasında işlənib bütün canişinlər də bu adla adlandılar. O, bütün ölkələrdən vergi, xristian və yəhudilərdən cizyə, gəlib-gedənlərdən dəhyek, müsəlmanlardan da zəkat alırdı. Bütün vergilərin beşdə birini götürər, qalan beşdə dörd hissəsini Həmzə və Abbas övladı arasında bərabər bölərdi. Başqa bir nüsxəyə görə, Bağdad xəlifəsinin həmişə göndərdiyi hədiyyələri də bu qayda ilə paylardı. Bu xanədana mənsub şəxslər bütün vergilərdən azad idilər. O əsrdə yaşayan Abbas övladından Hacı Məhəmməd, Əbülqasim, Şeyx Əli, Mənsur və Həsənin vəziyyəti və nəsli haqqında heç bir şey məlum deyildir.

Müəllifin zənnincə, Şamxalın Dağıstandan topladığı daimi vergi, hicri IX və ya X əsrlərdə belə olmuşdur: mal otarmaq üçün, Həbələl camaatdan hər 4 ildə ev başına bir qoyun, Qəraxi camaatından hər ildə 500 qoyun, Kərxi camaatından 300 qoyun, Ğrim[50] üçün də 400 qoyun, Kərxidəki bir dağ camaatdan 1000 qoyun, Ğrim üçün də 30 öküz; Cəmüləl camaatından 500 qoyun; Təndib nahiyəsindən 20 öküz; indi Qaziqumuğa tabe Ərçub kəndindən 130 qoyun, Ğrim üçün də 30 qoç, ikinci ildə 10 qoyun; Xumzaq nahiyəsində 700 qoç, 700 kil buğda və 60 kil bal. Əndib nahiyəsindən bir öküz və 8 keçə. Ğədər və Hirkəs şəhərlərinin hər birindən Xumzaqdan alınan verginin yarısı miqdarında, avarlıların Tomıl deyə adlandırdıqları qaziqumuqlulardan hər ev başına bir qoç və bir kil buğda: Şamxalın

[50] Şamxalın vəliəhdinə inli də Ğrim Şamxal deyirlər.

xüsusi mülkü olan Mıçıqıçdan hər ev başına bir qoyun; Küstək şəhərindən hər ev başına bir balıq; Tarxu şəhərindən hər ev başına iki sa[51] düyü; Gübdən kəndindən 100 qoç, Qaytaq əhalisindən 170 camış; Aqquşa və İsişə kəndlərindən 100 öküz, Züdəqər kəndindən 50 öküz; Sürhidən hər ev başına bir dirhəm; Cümcüqat və Kəkuba kəndlərindən - ehtimal ki, indi Qaziqumuğa mənsub olan Şəkbadır - yağla yüklü altı eşşək; Zirihgəran kəndindən 30 tüfəng, Sumbat dağlarından 50 qoç, İrhani kəndindən hər ev başına bir kil ən çox sərf edilən taxıl; Jəntab dağından 80 qoyun, Bəqtüləl camaatından 30 öküz və 30 quzu; Zaxiru və Qülədi dağlarından, yəni Şamxalın xüsusi mülkü olan Cardan 50 qoyun; indi Qaziqumuq rəiyyəti sayılan Rüsür camaatından və Mukruqdan 70 qoç; Kürələl, yəni Kürədən 100 at və 100 madyan.

Avar ölkəsi uzun müddət Həmzə övladının təsərrüfündü idi. Axırda, Tuş sakini Əmir sultan ibni-Bayar, ibni-Süraqə, Zümtaldan başlayaraq, Ariştinin son hüduduna qədər olan yerlərdən qoşun toplayıb, qaranlıq bir gecədə gizlicə Xumzaq nahiyəsinə gəldi. O, öz xanədanına tərəfdar olan islamı ürəkdən qəbul etməyən adamlarla ittifaq etdi. Qoşununu da onların mənzillərində gizlətdi. Bunun sabahı, Əbu Müslim ibni-Yusif ibni-Məhəmməd ibni-Şeyx Əbu Müslim guya bu əhvalatı bildirən bir yuxu gördüyü üçün, Qumuq tərəfinə qaçdı. Ertəsi gecə sübh açılmadan, Əmir sultan qoşunu ilə Xumzağa daxil oldu. Müsəlmanların əmiri Əhməd ibni-Çoban ibni-Sultan ibni-Məsum bəyi öldürüb başını qalanın divarından asdırdı. Bu qəsəbədə yaşayan müsəlmanların hamısı öldürüldü. Əmir sultan ata-babasının taxtında oturdu. Bu ölkə əhalisindən islama daxil olanları yenə bütpərəstliyə qaytardı. Bunlarla müsəlmanlar arasında ardı-arası kəsilməyən müharibələr 24 il davam etdi. Axırda, Avar əhalisi məişətin pisliyindən və azuqənin azlığından təngə gəlib islam dinini qəbul etdilər. Bu səbəbə görə, düşmənçilik aradan qalxdı və uzun bir zaman sülh və asayiş bərpa olundu. Axırda, yenə şəxsiqərəzlik və çəkişmələr nəticəsində Qumuq və Qaytaq əmirləri arasında ədavət, Abbas və Həmzə övladı arasında ayrılıq düşdü. Qaytaq əmirlərindən Məhəmməd xan, Əmir xan və Əmir Həmzə Avar padişahının yanına gedib ondan kömək istədilər və ittifaq bağladılar. Onlar uzun illər idi ki, Qumuq əmirləri ilə müharibə vəziyyətində idilər.

Nəhayət, Avar padişahı Sərətan, türk Kövsər şahın yanına mötəbər elçilər göndərdi, onunla dostluq əhdnaməsi bağladı. Kövsər şahın tayfası Ömər ibni-Xəttab dövründə islam dinini qəbul etmişdir. Kövsər şah, Məlik Sərətanın qızını öz oğlu üçün aldı, öz bacısını da onun oğluna verdi. Bu qohumluq səbəbilə dostluqları son dərəcədə möhkəmləşdi. Kövsər şah türk qoşunu ilə şərq tərəfdən, Məlik Sərətan Avar qoşunu və Qaytaq əmirləri ilə qərb tərəfdən Qumuq üzərinə hücum etdilər.

Bu hadisə Şeyx Nəcməddinin sağlığında olmuşdur. Kəkəli məscidinin yuxarısındakı qalada 70 nəfər gənc qəhrəmancasına döyüşüb həlak oldu. Qumuq

---

[51] Taxıl - dənə ölçüsüdür.

şəhəri viran edildi və əmirləri qaçdılar. Kövsər şah və Məlik Sərətan geri qayıtdılar. Qaytaq sultanları da öz irsi əmirliklərində qaldılar.

Müəllifin zənnincə, Əmir Çoban hicri 5-ci əsrin axırlarında vəfat etmişdir, çünki hicri 1030-cu ildə (tərtib olunan) şəcərədə o, 10-cu cərgədə, Şeyx Əbu İshaq İbrahim isə 19-cu cərgədə qeyd edilmişdir.

Xülasə, Harunərrəşiddən sonra, abbasilərin istiqlaliyyəti binövrəsinə rəxnə düşdü. İslam əmirləri hər tərəfdə xəlifələrin istibdadından danışır, ancaq zahirdə onların hakimiyyətini tanıyırdılar. Xəlifələr əmirlərin öhdəsindən gələ bilmirdilər, ancaq onlara fəxri ləqəblər verməklə kifayətlənirdilər. Bu səbəbə, dövlət işləri nizamdan düşdü. Şərq və şimal tayfaları bir çox vilayətə, xüsusilə də Şirvan və Dağıstan ölkələrinə təcavüz etdilər. Müsəlmanlar da öz sərhədlərini müdafiə edirdilər. Lakin çox təssüflər olsun ki, bu əsrlərin hadisələri haqqında lazımi dərəcədə məlumat yoxdur. Bir zaman gəldi ki, səlcuqi sultanları İranda iqtidar sahibi oldular, bunların çoxu Şirvana və Dağıstana da əl atdı. Bu dövrdə dağ əhalisinin çoxu islam dinini qəbul etdi.

Məşhur tarixçilərin dediyinə görə, Səlcuq Tatar qəbilələrindən birinin başçısı idi. Bunun Mikail və İsrafil adlı iki oğlu var idi. Sultan Mahmud Qəznəvidən icazə alaraq böyük bir cəmiyyət təşkil edən qəbilələrlə Ceyhun çayının bu tərəfinə keçdilər.

Hicri 432-ci (=1041) ildə, Mikail oğlu Tuğrul bəy Sultan Mahmud Qəznəviyə qalib gəldi. Xorasan, Fars, İraq, Kürdüstan və Azərbaycan ölkələrinə padişah oldu. Onun vəfatından sonra, hicri 442-ci (=1051) ildə qardaşı oğlu Alp Arslan İran şahı oldu. Xəlifə Qaim li-əmrillah[52] ona İzzüddin ləqəbi verdi. O, Gürcüstanda və ətrafında bir çox qabiliyyətə nail oldu. Sonra Ermənistan vilayətinə keçdi. Oranın padişahı ilə sülh edib qızını aldı. Onun vəfatından sonra, hicri 454-cü (=1062) ildə, Məlikşah Alp Arslan oğlu atasının vəziri Nizamülmülkün gözəl tədbiri və himməti sayəsində, ölkəni nizama saldı və tərifə sığmaz bir istiqlaliyyət əldə etdi. O, öz qızını xəlifə Müqtədi-Billaha[53] verərək, Nizamülmülk ilə Bağdada göndərdi. Deyirlər ki, nəfis qumaşlar və qızıl-gümüş şeylərlə yüklənmiş ağır qiymətli cavahiratla dolu 12 gümüş sandıq, yəhərləri dürr, yaqut və sair qaş-daşla bəzənmiş 33 at; başlarında mürəssə cilov, ayaqlarında cəvahirat nəsb edilmiş xalxalları olan üç dəvə və bu dəvələr üzərində qiymətli qaş-daşla bəzənmiş üç kəcavə qızla bərabər cehiz olaraq göndərilmişdir. Sultanın qızı bu böyük təzyinatla Bağdada varid oldu. Ona böyük bir toy etdilər, bu toyda 40000 batman şəkər sərf olundu.

---

[52] Mətndə yanlışlıq var. Qaim bi-əmrillah olmalıdır. Abbasilərdən iyirmi altıncı xəlifədir (422-467=1031-1075).

[53] Mətndə yanlışlıq var. Müqtədi bi-əmrillah olmalıdır. Abbasilərdən iyirmi yeddinci xəlifədir (467-487=1075-1094).

Məlikşah Rum, Gürcüstan və Şirvan ətrafında bir çox müharibələr etdi. Bu padişahın səltənət dövrü, əsirlərin ən gözəli idi. Bu dövrdə ölkənin abadlığı və millətin asayişi tam mənasilə bərqərar və Nizamülmülk kimi misilsiz vəzir də ixtiyar sahibi idi.

O, həmişə alimlər və şairlərlə oturub-durardı. Bəzən şer söyləməyə də həvəs edərdi. Bu rübai onundur:

Dünən sevgilim gözümdən bir öpüş aldı,
O getdi, amma gözüm onun ardınca yaşlı qaldı.
Sevgilim gözümdən ona görə, öpdü ki,
O öz camalını mənim gözümdə görmüşdü.

Məlikşahın dövründə Həsən Səbbah, bir çox xüsuslarda xürrəmilərin qanunlarına əsaslanaraq, mülhidlərin çirkin məzhəbini meydana atdı. O, ətrafına canından keçən bir çox fədai toplayıb fitnə-fəsad yolu ilə öz əzəmət və istibdadını artırdı. Axırda, Məlikşahın baş hərəmi Türkan xatun, cürbəcür böhtanlarla Nizamülmülkü padişahın gözündən saldı. Nizamülmülk işdən kənar edildi və bir il sonra Nəhavənd şəhərində Həsən Səbbahın fədailəri tərəfindən bıçaqla öldürüldü. Vəfat etdiyi zaman bu qit'əni yazıb, padişahın hüzuruna göndərdi:

Ey gənc taleli şahım!
Sənin xoşbəxtliyinlə qırx il,
Dünya üzündən zülmün tozunu sildim.
Əz-qəza ömrüm 96-ya çatınca,
Səfərdə, bir bıçaq zərbəsindən öldüm.
Niknamlıq və səadət fərmanını,
Sənin imzanla səma padişahının hüzuruna apardım.
Bu qədim vəzifəni oğluma tərk etdim,
Onu da, Allaha və padişaha tapşırdım.

Nizamülmülkün vəfatından 40 gün sonra, Məlikşah da hicri 482-ci (=1089) ildə, Bağdad yaxınlığında vəfat etdi. Böyük oğlu Börküyarıq taxta oturdu. Gəncədə sakin olan Azərbaycan, Ermənistan və sair yerlərin hakimi Məhəmməd Məlikşah oğlu üsyan bayrağı qaldırdı. Sultan Börküyarıq qardaşının şərrini dəf etmək üçün hərəkət etdi. Bir gün, onun qoşun başçıları iğtişaş salıb, sultanın çadırında baş vəzir qumlu Məcdəddini öldürdülər. Padişah belə bir cəsarətdən qorxuya düşüb İraq Quhistanından Rey (mülkünün) mərkəzinə qaçdı. Məhəmməd maniəsiz və zəhmətsiz səltənət taxtında oturdu. Daha sonra, iki qardaş arasında dörd dəfə müharibə oldu. Bunlar gah qalib və gah məğlub olurdular, nəticədə sülh etdilər. Şam, Diyarbəkir, Azərbaycan, Muğan, Şirvan və Ermənistan vilayətləri Sultan Məhəmmədə, İranın sair vilayətləri isə, Börküyarığa çatdı. Hicri 489-cu (=1096)

ildə Börküyarıq vəfat etdi. Sultan Məhəmməd bütün ölkədə müstəqil oldu. Hicri 491-ci (=1098) ildə Bağdada gedib xəlifə Müstəzhir Billah[54] ibni-Müqtədi Billahdan Nasiri-Əmirəlmö'minin ləqəbini aldı. Bunun vəfatından sonra hicri 502-ci (=1109) ildə Sultan Səncər Məlikşah oğlu, Bürhani-Əmirəlmö'minin ləqəbilə səltənət taxtına oturdu. 40 il müstəqil olaraq səltənət sürdü.

Mahmud Sultan Məhəmməd oğlu, əmisi Sultan Səncər tərəfindən İraq, Ermənistan və Azərbaycan ölkələrinə hakim təyin olundu. Dövlətşah Səmərqəndi[55] təzkirəsinin qeydinə görə, o, bu yerlərdə 8 il, Rövzətüssəfanın yazdığına görə isə 11 il padişahlıq etmişdir. Şirvan və Dağıstan işləri də onun ixtiyarında idi. Axırda o, hicri 519-cu (=1126) ildə öz əmisinə qarşı üsyan etdi, nəticədə məğlub oldu. Sultan Səncər isə onun taqsırından keçdi və adı çəkilən vilayətlərdən başqa, Şam mülkünü də onun ixtiyarına verdi. Bundan əlavə iki qızını da - birincisi vəfat etdikdən sonra ikincisini - ona verdi. Özü isə Xorasan və Mavəraünnəhrdə olurdu.

Sultan Mahmud səltənətə keçincə, kiçik qardaşı Məsud onunla müharibəyə başladı. Bir müddət iki qardaş bir-birilə vuruşaraq bu ölkənin nizamsızlığına və xaraba qalmasına səbəb oldular. Gürcülər bundan istifadə edib Tiflis şəhərini və ətrafını ələ keçirdilər. Sultan Mahmud vəfat etdi, oğlu Toğrul taxta çıxdı. O da, çox keçmədi Həmədan şəhərində vəfat etdi, Sultan Məsud ölkədə müstəqil oldu.

Bunun dövründə Həsən Səbbahın fədailəri İraq və Azərbaycan hüdudunda zülm və tüğyana başladılar. Xəlifə Müstərşid Billah[56] hicri 534[57]-cü (=1140) ildə, bunları dəf etmək məqsədilə o tərəfə hərəkət etdi. Bəzi səbəblərə görə, xəlifə ilə Sultan Məsudun arasına ziddiyyət düşüb müharibə ilə nəticələndi. Xəlifə məğlub olub və əsir oldu. Xorasandan Sultan Səncərin yazdığı məzəmmət və nəsihət nəticəsində, Sultan Məsud xəlifəni çox izzət və ehtiramla Bağdada yola saldı. Lakin fədailərdən bir dəstə yolda fürsət tapıb, bıçaqla onu öldürdülər və özləri də Sultanın qəzəb və əzabına düçar oldular.

Bəzi tarixçilərin qeydinə görə, xəlifənin öldürülməsi Sultan Məsudun işarəsilə olduğu halda, fədailərin adına isnad verilmişdir. Xülasə, bu xəbər Bağdada çatınca, Raşid Billah[58] ibni-Müstərşid Billah xilafətə keçdi. Sultan Məsud onun ardınca Darülxilafəyə (Bağdada) hərəkət etdi. Raşid Billah ona qarşı müqavimət göstərə bilməyəcəyindən, Mosula getdi. Bir ildən sonra Azərbaycan İraq ətrafında sərgərdan gəzirdi. İsfahanın yaxınlığında fədailər tərəfindən bıçaqla öldürüldü.

---

[54] Müstəzhir Billah - abbasilərdən iyirmi səkkizinci xəlifədir (487-512=1094-1118).

[55] Dövlətşah Səmərqəndi - əslən səmərqəndli olub, Sultan Hüseyn Bayqara zamanında Heratda yaşamışdır. Məşhur «Təzkirətüşşüəra»sını hicri 995-ci (-1586/87) ildə Sultan Hüseyn ilə onun vəziri Əlişir Nəvaninin adına yazmışdır.

[56] Müstərşid Billah - abbasilərdən iyirmi doqquzuncu xəlifədir (512-529=1118-1135).

[57] Mətndə yanlışlıq var, hicri 534-cü ildə Müstərşid Billah deyil, Müqtəfi li-Əmrillah xəlifə idi.

[58] Raşid Billah - abbasilərdən otuzuncu xəlifədir (529-530=1135-1136)

Sultan Məsud Bağdada daxil olandan sonra, Müqtəfi li-Əmrillahı[59] xilafətə oturtdu və özü də ona beyət etdi. Lakin, buna baxmayaraq o, hər bir xüsusda müstəqil hökm sürürdü. Deyirlər ki, Sultan Məsud elçi vasitəsilə xəlifədən soruşdu: «Ona məsarif üçün nə qədər pul lazımsa (desin) təyin edək». Xəlifə cavabında: «Hər gün su daşımaq üçün 40 baş qatır lazımdır, qalan mayehtacı da buna əsasən təyin etsin» dedi. Sultan dedi: «Bəh-bəh! Əsəb cəlal sahibini xilafətə oturtmuşuq, Allah onun şərrini müsəlmanların başından götürsün». Sultan Səncərin səltənətinin axırlarında, Quz tayfası Ceyhundan keçdi. Sultan Səncər də onların müharibəsinə gedib, məğlub oldu və əsir düşdü. Bir müddətdən sonra qaçıb qurtardı, intiqam almaq tədarükündə ikən, hicri 542-ci (=1148) ildə vəfat etdi...

Sultan Məsud, onun vəfatından sonra, 12 il də müstəqil səltənət sürdü. O, hünər və şücaət sahibi olub rəhmdil və rəiyyətpərvərlikdə məşhur idi. Onun hökmranlıq dövrünün axırlarında, Məlikşah ibni-Sultan Mahmud Həmədanda üsyan etdi. Sultan gəlib fitnəni yatırtdı. Sultan Məsud hicri 554-cü (=1159) ildə vəfat etdiyi zaman, II Məlikşah ibni-Mahmud taxta oturdu. Son dərəcə eyş-işrətə alüdə olduğundan, səltənət əlindən çıxdı. Qardaşı II Məhəmməd padişahlıq taxtına oturdu. O, öz əmisi Süleyman ibni-Sultan Məhəmməd ilə Arazın kənarında müharibə edib qalib gəldi.

Bəzi səbəblərə görə, onunla xəlifə Müstəncid Billah[60] ibni-Müqtəfi Billahın[61] arasında ədavət törədi. Bir neçə gün Bağdadı mühasirə etdikdən sonra, xəlifənin qızı Kirman xatunu alıb sülh etdi. Ondan sonra, hicri 556-cı (=1161) ildə, Süleyman ibni-Məhəmməd ibni-Məlikşah taxta oturdu. O, boşboğaz və əyyaş olduğu üçün, altı ay sonra həbsə alındı. Arslan ibni-Tuğrul ibni-Mahmud hökmranlığa keçdi. Nizami, Zəhir və Ənvəri tərəfindən mədh edilən Arslan alim, adil, ağıllı, təcrübəli və xeyirli işlər görən bir padişah idi. Ondan sonra, hicri 571-ci (=1176) ildə oğlu Tuğrul taxta oturdu. Əmisi Məhəmməd ibni-Tuğrul da ona vəzir oldu. Məhəmməd vəfat etdikdən sonra, qardaşı Qızıl Arslan onun yerinə keçdi. Axırda, dostluq düşmənçiliyə çevrilib, Qızıl Arslan xəlifənin köməyilə müharibədə qalib gəldi. Tuğrulu həbsə alıb özü səltənətə keçdi. Qızıl Arslan vəfat etdikdən sonra, Tuğrul ikinci dəfə səltənətə keçdi.

Deyirlər ki, Tuğrul elmi, hünəri sevən və himayə edən bir padişah olub, bəzən şer də söylərmiş...

Tuğrul hicri 590-cı (=1194) ildə, Təkəş xan Xarəzmşahın müharibəsində öldürüldü. Bu sülalənin səltənəti də bir neçə il ondan əvvəl Fars və Xorasana sahib olan Xarəzmşahlara çatdı. Bu sülalənin qısaca tarixi belədir:

Məlikşah Səlcuqinin qulamlarından Ənuştəkin adlı bir şəxs, Xarəzm əyalətinə hakim təyin olunmuşdu. Ondan sonra, oğlu Qütbəddin Məhəmməd də

---

[59] Müqtəfi li-əmrillah - abbasilərdən otuz birinci xəlifədir (530-555=1136-1160).
[60] Müstəncid Billah - abbasilərdən otuz ikinci xəlifədir (555-566=1160-1170).
[61] Mətndə yanlışlıq var, Müqtəfi li-Əmrillah olmalıdır.

Xarəzmşah ləqəbilə bu mənsəbə keçdi. Sultan Səncər Quz tayfası əlində əsir olduğu zaman, Məhəmməd sikkəni öz adına vurdurub, xütbəni öz adına oxutdu. Ondan sonra, oğlu Adsız və ondan sonra da Sultan şah, Təkəş xan və el Arslan bir-birinin ardınca səltənət sürdülər. Hicri 596-cı (=1200) ildə, xarəzmşahlardan Məhəmməd Təkəş oğlu taxta oturdu. Hicri 617-ci (=1221) ildən başlayaraq 4 il davam edən Çingiz xan hadisəsi zamanında, qaçıb Mazandaranın Abesikun adasında vəfat etdi. Onun böyük oğlu Cəlaləddin səltənət taxtına oturdu. Gürcüstanı almaq üçün gəldiyi zaman Şirvan və Dağıstana da hücum etmiş olduğu məlum deyildir.

## ÜÇÜNCÜ FƏSİL

### *MOĞOL İSTİLASINDAN SƏFƏVİLƏRİN ZÜHURUNA QƏDƏR, ŞİRVANŞAHLAR SÜLALƏSİ VƏ ONLARIN SƏLTƏNƏTİNƏ AİD HADİSƏLƏR HAQQINDA*

Hülaku xan bin-Tuluy bin-Çingiz xan, öz qardaşı Mənku qaan zamanında İrana gəldi. Hicri 656-cı (=1258) ildə xəlifə Müstəsim Billahı[62] öldürərək abbasilər dövlətini dağıtdı. Sonra, özü ilə bərabər gətirdiyi 200000 türk ailəsini müxtəlif yerlərdə yerləşdirdi. İran səltənətini öz əlinə alıb möhkəmləndirdi. Lurlar və kürdlərdən başqa, İran köçəri qəbilələrinin əksəri bunların nəslindəndir. Şam ölkəsinin o başından (Əqsayi-Şamdan) Ceyhuna, Ümmandan Dərbəndə qədər onun hakimiyyəti altında idi. Elm və hikmət sahiblərinin ehtiramını saxlar, ümumi mənfəətinə aid müəssisə və bunlar tikdirməyə son dərəcə səy edərdi. Paytaxtı Təbriz şəhərində, ali bir imarət tikdirdi. Hülaku xana çox yaxın olan Xacə Nəsirəddin Məhəmməd Tusi, onun əmrilə Marağada bir rəsədxana bina etdirdi. Hicri 663-cü (=1265) ildə səltənəti oğlu Abaqa xana tərk edib vəfat etdi. Bu da Şirvan, Ermənistan və Azərbaycanın idarəsini qardaşı şahzadə Eşmuta tapşırdı. Bu zaman Qıpçaq padişahı Cağatay xanın oğlu Bərəkə xan, şahzadə Buğanı Dağıstan yolu ilə Azərbaycanı almağa göndərdi. Eşmuq hicri 664-cü (=1266) ilin əvvəllərində, Dərbənd yaxınlığında onu məğlub edib geri qaytardı.

Bu məğlubiyyətdən sonra Bərəkə xan 300000 atlı ilə Dərbənd yolu ilə gəldi. O, Kür çayı kənarına çatıncaya qədər atın cilovunu çəkmədi. Abaqa xan da külli qoşunla Kürün o biri tayında düşüb onu çaydan keçməyə qoymadı. Bərəkə xan körpüdən keçmək üçün Tiflisə üz qoydu. Lakin xəstələndiyindən yolda vəfat etdi. Buna görə də qoşunu dağılıb öz yurdlarına qayıtdı. Abaqa xan hicri 681-ci (=1282) ildə vəfat etdi.

İslam dinini qəbul etdikdən sonra Sultan Əhməd adını alan Nikudar bin-Hulaku xan, İraq və Azərbaycanda rəyasət və ədalət taxtına oturdu. İki il sonra Abaqa xanın oğlu Arqun onu öldürüb özü onun yerinə keçdi. Arqun zalım və xain bir padişah idi. Hicri 690-cı (=1291) ildə vəfat etdi. Onun yerinə keçən qardaşı Keyxatu eyş və işrətlə məşğul olub əmirlərinin irz və namusuna təcavüz edirdi. Bunların (əmirlərin) təhriki ilə Baydü ibni-Taraqay ibni-Hülaku xan Bağdaddan qoşun çəkib gəldi. Keyxatu Muğana qaçdı. Əmirlər Baydu xanın əmrilə onu təqib edərək hicri 694-cü (=1295) ildə əsir edib öldürdülər.

Bu hadisədən sonra, islam dinini qəbul edib Sultan Mahmud adını alan Xorasan hakimi Qazan ibni-Arqun xan, Keyxatunun intiqamını almaq üçün Baydu xanın üzərinə hərəkət etdi. Əvvəlcə sülh və sonra hərb etdilər. Baydu xan qaçıb Naxçıvanda Əmir Novruzun əlində öldü. Qazan xan hakimiyyət başına keçdi...

---

[62] Müstəsim Billah - abbasilərdən otuz yeddinci və sonuncu xəlifədir (640-656=1242-1258).

O vəfat edəndən sonra, hicri 703-cü (=1304) ildə, Ulcaytu Məhəmməd Xüdabəndə ibni-Arqun xan taxta oturdu. Sultaniyyə şəhərini bina və özünə paytaxt etdi. O, ədalətli və xeyirli işlər görən bir padişah idi. Onun adı, Bakı şəhərində bina etdirdiyi burc və məscidlər üzərindəki kitabələrdə indi də durur. Hükəmanın təhqiqatına və alimlərin söhbətinə çox mail idi. Şiəliyi qəbul etdi və sikkəni on iki imamın adına vurdurdu. Bir çox həkimanə sözləri vardır, bunları fazil adamlar toplamışlar...

Ondan sonra hicri 716-cı (=1317) ildə, 13 yaşında olan böyük oğlu Sultan Əbusəid taxta oturdu. Bunun dövründə Cüci-ibni-Çingiz xan nəslindən Qıpçaq padişahı Özbək xan - Özbək qəbiləsi bunun adı ilə adlanmışdır - hicri 718-ci (=1319) ildə Dərbənd yolu ilə Azərbaycanı almağa gəldi. Sultan Əbusəid müqavimət məqsədilə çıxıb Qarabağ düzündə qışladı. Özbək qoşunları Şirvanda qətl qarətlə məşğul idilər. Əmir Çoban 20000 qoşunla sultanın köməyinə gəldi. Özbəyin qoşunu müqavimət göstərə bilməyib qaçmağa başladı. Əmir Çoban onları təqib edərək bir çoxunu öldürdü. Özbək şah hicri 735-ci (=1335) ildə təkrar həmin yol ilə Azərbaycana yürüş etdi. Sultan Əbusəid yenə müqavimət məqsədilə qarşıya çıxdı. Havanın istiliyi və üfunəti üzündən Şirvanda xəstələnib hicri 736-cı (=1336) ildə vəfat etdi. Müasirlərindən biri yazdığı bir şerdə onun Qarabağda vəfat etdiyini qeyd etmişdir. Qarabağ çox vaxt Şirvan üstündə sayıldığından, tarix kitablarında Şirvan adı ilə şöhrət tapmışdır.

Zəfərnamənin müqəddəməsində deyilir: (Əbusəidin) arvadı Bağdad xatun, Əmir Çobanın qızı və keçmişdə Şeyx Həsən Elxanın arvadı idi. Sultan ona aşiq olub, zor ilə təlaq verdirərək almışdı, atasını və qardaşını da öldürmüşdü. Bağdad xatun, Özbəyin təhrik və təşviqi ilə, Sultana zəhər verdi. Bundan sonra, Tulu Çingiz xan oğlu nəslindən olan Arpa xan səltənətə keçdi. Özbəyi məğlub edərək Şirvan və Dərbənddən çıxartdı. Bu zaman Musa ibni-Əli ibni-Baydu xan üsyan edib, Arpa xanı öldürdü. Hülaku xan nəslindən Məhəmməd də buna qarşı üsyan etdi. Daha sonra, bu sülalədən bir neçə nəfər bir-birilə vuruşaraq, öz nəsillərinin kəsilməsinə və ölkənin xaraba qalmasına səbəb oldular. Bunların Azərbaycan və İraqdakı əzəmətli dövləti elxanilərə keçdi.

Bu sülalənin əhvalatı belədir: Ağ Buğa ibni-Elxan ibni-Cəlayir Keyxatu dövründə əmirül'üməra olub Baydu xan hadisəsində öldürüldü. Oğlu Əmir Hüseyn Arğun xanın qızını aldı. Bunun oğlu Şeyx Həsən, Sultan Əbusəid dövründə Rum valisi idi. Əbusəid öləndən sonra, Şeyx Həsən onun arvadı Dilşad xatunu aldı. Bu arvad Əmir Çobanın oğlu Xacə Dimişqin qızı idi. Musiqi elmində, rəssamlıqda öz əsrinin nadiri və gözəllikdə bütün dünyada məşhur olan Şeyx Üveys bundan doğulmuşdur. O, hicri-757-ci (=1356) ildə iraqi-Ərəb səltənəti taxtına oturdu.

Hülaku övladı səltənətinin sarsıldığı və elxanilər dövlətinin hələ müstəqil olmadığı bir zaman idi. Zalım və qəddar bir şəxs olan Şeyx Həsən ibni-Teymurtaş ibni-Əmir Çoban yeddi il onun ölümündən sonra uğursuz qardaşı Əmir Əşrəf 13 il Təbriz mülkünü və sair yerləri istila etdilər. Bunlar həddən artıq zülm edib saysız-

hesabsız mal və dövlət topladılar. Bu zaman bərdəli Qazi Mühiyyəddin Dəşti-Qıpçağa, Cüci ibni-Çingiz xan övladından ədalətli, maarifpərvər və pərhizkar bir padişah olan Canibəy xanın yanına getdi. Gözəl nəsihət və mövizələrlə onu vadar etdi ki, gedib Əşrəf zalımı cəzalandırsın. Canibəy 300000 qoşun götürüb Dərbənd yolu ilə gəldi. Şirvanşah Kavus ibni-Keyqubad, bu gözəl səfərdə ona qarşı çox xidmətlər göstərdi. Buna görə, Moğol və Tatar tayfası, zatən talançı olsalar da, xərmən vaxtı kimsənin taxılına əl uzatmadılar. Canibəy Təbrizə gəlib Əşrəfi öldürdü və onun xəzinələrinə sahib oldu. İndi də xalq arasında belə bir məsəl məşhurdur:

Eşşək Əşrəfi gördünmü nə etdi?
O özü ilə lənət apardı, Canibəy isə altun.

Bu hadisədən sonra, oğlu Bərdi bəyi Azərbaycanda canişin qoyub, öz paytaxtına qayıtdı. Bərdi bəy atasının bərk xəstələndiyi xəbərini alınca, moğollardan Axıcıq adlı bir nəfəri Təbrizdə naib qoyub getdi. Axıcıq da 15 ilə yaxın, Əşrəf kimi, zülmkarlıq edib Təbriz əhlini təngə gətirdi. Təbrizlilər Müizziddin Üveys Elxanidən kömək istədilər. O, çoxlu qoşunla gəldi. Axıcıq onun qarşısına çıxdı və məğlub olub, Naxçıvana qaçdı. Buradan da Qarabağa gəldi. Sultan Üveys onu təqib etdi, tutub boynunu vurdu. Hicri 775-ci (=1374) ildə, İraqi-Əcəm və Azərbaycanı aldıqda, Şirvan valisi Huşəng ibni-Kavus da ona tabe oldu. Bu səfərdən Bağdada xəstə qayıtdı. O biri il, çox gənc ikən vəfat etdi...

Sonra oğlu Sultan Hüseyn padişahlığa çatdı. O, ölkə və ordu işlərindən qəflət edərək, eyş-işrətlə məşğul idi. Qardaşı Sultan Əhməd, hicri 784-cü (=1383) ildə, türkmən qaraqoyunlu Qara Məhəmmədin köməyilə onu öldürdü. Qardaşı Şeyx Əliyə də qalib gəldi. Şirvan valisi Huşəng Kavus oğlunun vasitəsilə o biri qardaşı Sultan Bayəzidlə də Azərbaycanda sülh edib, səltənət taxtına oturdu. Bu zaman ölkələr fatehi Əmir Teymur Kürəkən xürc etdi...

Bir çox tarixçilərin yazdığına görə o, Çingiz xanın böyük əmirlərindən Qaracar noyanın oğlu nəvəsi, moğolların Barlas qəbiləsi əmirlərindən Əmir Turağayın oğludur. Hicri 736-cı (=1336) ildə Keş nahiyəsində Şəhrsəbzdə anadan olmuşdur. Çox tərəqqi etdi, Əmir Hüseynin damadı olduğundan, Kürəkən deyə şöhrət tapdı. Əmir Hüseynə də qalib gəlib, 35 yaşında Mavəraünnəhrin padişahı oldu. Moğolustanı, İranın bir çox vilayətlərini, hətta Gilan və Azərbaycanı da aldı, sonra yenə Mavəraünnəhrə qayıtdı.

Hicri 787-ci (=1386) ilin qışında, Toxtamış xan 90000 qoşunla Dərbənd yolu ilə Şirvan və Azərbaycana soxuldu, qarət və təxribatdan sonra, yenə həmin yol ilə geri qayıtdı.

Zübdətüttəvarix[63] müəllifinin yazdığına görə, Çingiz övladından Toxtamış xan, keçmişdə Urus xan tərəfindən məğlub edilmişdi, hicri 787-ci (=1381) ildə, Əmir Teymurun köməyilə Qıpçaq padişahlığına yetişdi. Ertəsi il, Əmir Teymur İrana yürüş etdiyi zaman, Xorasandan ona xəbər çatdı ki, Sultan Əhməd Cəlayir Elxani Bağdaddan Təbrizə hərəkət etmişdir. Hacı Seyfəddin adlı birisini bir dəstə qoşunla onu dəf etmək üçün göndərdi. Əmir Teymurun gəlmək xəbərini eşidərək qayıtmaq fikrində olan Sultan Əhmədə, Naxçıvan duzlağında çatdı. Müharibə başlandı. Sultan Əhməd nicatı qaçmaqda gördü, qoşunlarından bir dəstəsi öldürüldü və ordusu talan edildi. Əmir Teymur özü Təbrizə gəldi, məşhur adamlardan bir çoxunu öldürdü və bir çoxunu da cərimə etdi. Bu şəhərin tanınmış sənətkarlarını yığıb Səmərqəndə göndərdi. Payız fəslində Naxçıvan və Qars qalalarını aldı. Qarsı viran edərək, Gürcüstana hərəkət etdi. Buranın valisi Əmir Baqrat müqavimət göstərdi, məğlub olub əsir düşdü. Əmir Teymur buradan Qarabağa gəlib, islam dinini qəbul edən Baqrata öz irsi mülkünü qaytardı. Şirvan valisi Əmir İbrahim, öz ölkəsini qurtarmaq məqsədilə, ləyaqətli töhfələr və hədiyyələrlə Əmir Teymurun hüzuruna gəldi. Sahibqran tərəfindən mehribanlıqla qarşılandı və Şirvanşah ləqəbini aldı.

Bahar zamanı, Teymurun ordusu Araz kənarından Gəncəyə yetişdikdə xəbər çatdı ki, Toxtamış xan tərəfindən Şirvana külli qoşun gəlmişdir. (Əmir Teymur), oğlu Miranşahı onları dəf etməyə göndərdi. Miranşah onları məğlub edib Dərbəndin o biri tərəfinə qədər qovdu və çoxlu qənimət ələ keçirdi. Dövlətşah Səmərqəndi Təzkirətüş-şüərasında yazır: Sultan Əhməd zahiri cəh-cəlaldan başqa cürbəcür fəzilətlərə də malikdi. İnşa, ərəbcə və farsca şer söyləmək, nəqqaşlıq, mozaika və sair fənlərdə mahir idi. Havacat və musiqi elminə dair bir çox təlifatı vardır. Bunlara baxmayaraq o, etimadsız, pis əməlli, tiryəki, hərdəmxəyal və mərdümazar bir adam idi...

Xülasə, pis işlərinə görə rəiyyət və qoşun ondan nifrət edib Əmir Teymura sığındılar. Hicri 791-ci (=1389) ildə, sahibqran Bağdada hərəkət etdiyi zaman, Sultan Əhməd bu qitəni yazıb ona göndərdi:

Ruzigarın cəfasına nə üçün boyun əyək!
Hər bir kiçik işdən ötrü nə üçün zəhmət çəkək!
Dənizi və dağı ötüb keçək,
Ünqa kimi dəniz və quru qanadımızın altında qalsın.
Ya muradımıza çatıb fələklərə yüksələk,
Ya da, kişi kimi mübarizə yolunda başdan keçək.

[63] «Zübdətüttəvarix» - Teymur dövrünün tarixçilərindən Hafiz Abrunun əsəridir. O, Heratda anadan olmuş və hicri 834-cü (=1430/31) ildə vəfat etmişdir. «Zübdətüttəvarix» dünyanın yaradılışından hicri 829-cu (=1425/26) ilə qədər olan hadisələri təsvir edir.

Sahibqran təbi-şeri olmadığına görə, təəssüf edib buyurdu, övladından biri onun cavabını yazsın. Bəzilərinin qeydinə görə, Sultan Xəlil yazdı. Cavab bundan ibarətdir:

Zəmanənin cəfasına boyun əymək lazımdır,
Böyük işi kiçik sanmaq olmaz.
Ünqa kimi Qaf dağına nə üçün uçursan!
Sərçə kimi kiçil və qol-qanadını salla.
Xam xəyalı başından çıxar,
Ta, sənin başın uğrunda yüz min baş (kəsilməsin).

Sultan Əhməd müqavimət göstərə bilməyib Ruma getdi. Bağdad sahibqranın ixtiyarına keçdi. Xacə Məsud Sərbədar buraya hakim təyin edildi. Əmir Teymur, bu səfərdən sonra, paytaxtı Səmərqəndə qayıtdı. Hicri 793-cü (=1391) ildə Qıpçağa getdi, Qunduzca adlı yerdə Toxtamış xanı məğlub etdi. Cüci qəbiləsini qətl-qarət edib onlardan əsir aldı.

Əmir Teymur hicri 796-cı (=1394) ildə yenə gəlib Gürcüstanı qarət etdi və Şəkini ələ keçirdi. Sultan Mahmud Qazan xan tərəfindən, dəniz kənarında, Kür çayının iki qolu arasında bina etdirilmiş Mahmudabad şəhərində qışladı. Bu zaman xəbər çatdı ki, Toxtamış xanın qoşunundan bir dəstə Dərbənddən keçib yenə Şirvanı çalıb-çapmaqla məşğuldur. Buna görə, Toxtamış xanı cəzalandırmaq üçün külli qoşun götürərək hicri 797-ci (=1395) ilin baharında Dərbənd yolu ilə hərəkət etdi. Həbibüssiyərin yazdığına görə, Əmir Teymur Samur çayının kənarına çatıb dənizdən beş ağac yuxarıda düşdü. Bu zaman, Toxtamış xanın yanına elçi göndərilən Şəmsəddin Almalığı, düşmənanə yazılmış bir məktubla varid oldu. Sahibqran burada qoşununu nəzərdən keçirdi. Heç bir zaman onu bu çoxluqda və bu təchizatda qoşun müşayiət etməmişdi. Buradan qəsd etdiyi tərəfə hərəkət etdi. Yolda, Toxtamış xanın tərəfdarlarından rast gəldiyi tayfaların hamısını qətl-qarət edirdi. Xülasə, iki qoşun indi Terek adlanan Qori çayının kənarında üz-üzə gəldi. Burada əsrlər boyu misli çox az görünmüş şiddətli bir müharibə baş verdi. Döyüşün şiddətindən qiyamət gününün dəhşəti bərpa oldu. Məğlubiyyət nişanələri Teymurun qoşununda görünməkdə idi. Bu zaman nüsrətli padişahın yüksək himməti və ağıllı tədbirləri sayəsində, müharibənin gedişi başqa bir şəklə girdi. Toxtamış xan, hədsiz qoşunu ilə pərişan bir halda qaçmağa üz qoydu. Əmir Teymur, Qumari çayının kənarında öz qoşununun başçılarına ənam verib onlara nəvaziş etdi. Düşməni də Atil çayına qədər izlədi. Qoyzıcan Urusxan oğlunu Qıpçaq səltənətinə oturtdu. Toxtamış xan bir neçə nəfərlə dağlara və meşələrə qaçdı.

Əmir Teymur rus ölkəsinin cənub tərəfini Oka çayına qədər viran etdi. Mərkəzdən uzaq düşməsi və qışın yaxınlaşması münasibətilə qayıtdı. Qara dəniz sahilində Azaq şəhərini aldı. Çərkəz və Əlbürz-kuh (Qafqaz) ölkələrində də bəzi

qələbələr çalıb, Qum keçidində qışladı. Qışın ortasında gedib Hacı Tərxanı qarət etdi və yandırdı. Sonra İrana qayıdarkən, Dağıstanda bəzi qalaları və kəndləri də xarab etdi, müqavimət göstərənləri layiqincə cəzalandırdı. Dağıstan əhalisindən bir çoxunun dediyinə görə Əmir Teymur Terek ilə Sulaq arasında yaşayan Qumuq tayfasını itaəti altına aldı. Sonra Mıçıqıçın ortasından keçərək, yeddi min evdən ibarət Almaq şəhəri üzərinə gəldi. Buranı çox şiddətli müharibədən sonra alıb viran etdi; bu şəhərin yerində indi təqribən 100 evdən ibarət bir kənd durur. Oradan, Salatav dağları üzərindəki dağ yolu ilə (bu yol indi «Teymurşah yolu» adlanır) Salatav əhalisinin sığındığı Bərktav, Əlxastav, Çobantav və Batluq adlı çətin keçidli qalalar və kəndlər üzərinə gəldi. Bu yerləri qəribə və əcaib asarı indi də mövcuddur. Bu yerləri aldıqdan sonra, əhalisini köçürüb aranlıq yerlərdə yerləşdirdi. Onlar da get-gedə dağıldılar. Onların çoxu bir çirkab yerində Çirkay kəndini bina edib oturdular.

Əmir Teymur Axat keçidindən Qoysu çayını keçib, təqribən 7-8 min evdən ibarət böyük Ğədər şəhərini mühasirəyə aldı. Yerin çətinliyindən onu almaq imkansız görünürdü. Axırda, sülh məsələsini ortaya atdı, töhfə və hədiyyə adı ilə şəhərə, içində silahlı əsgər olan bir çox sandıq göndərdi; daxildən və xaricdən hücum edərək şəhəri aldı və xərabəzarə çevirdi. Ğədər şəhəri, Şamxal mülkündə indi də 400 evdən ibarət kənddir. Bu zaman Qumuqun keçmiş əmirləri nəslindən bir gözü kor Kübdən adlı bir əmir öküzə minib Teymurun hüzuruna gəldi və dedi: «Mən korun sən axsaqdan bir sualı vardır, biz kimik ki, sənin kimi iqtidarlı bir padişah bizimlə müharibəyə gəlsin və nəyimiz var ki, bizdən alsın?» Əmir Teymura onun sadə danışmağı xoş gəldi. Kübdən kəndinin bütün əmlakını ona verdi. O da öz eli ilə dağlardan köçüb, adına bir kənd və məskən saldırdı. Onun nəsli və qəbilələri Qaraçıbəgan adı ilə məşhurdur. Onlardan bəziləri Qarabudaqkənd və sairdə yurd salmışlar.

Qüdrətli Əmir Teymurun bu ölkədə qoyub getdiyi əsərlərdən ən məşhuru bir torpaq səddir. Bu yer, Axsaq Teymurun ori (Teymur Ləngin səddi) adı ilə məşhurdur. Bu sədd, Dərbənd ətrafından başlayıb Tərəkəmə mahalında təpələr şəklində davam edərək, Ütəmiş səhrasına gəlib çatır. Buradan bir sədd şəklində, Buynaq və Tarxu altından Teymur-Quyuya gedir; Sulaq çayından və İndirinin aşağısından keçərək Mıçıqıçın ortası ilə Nasran və Qaraçay mülkündən ötür; buradan başqa bir Teymur-Quyu adlı yerə, oradan da Qurban çayına yetişir. Bəzilərinin dediyinə görə isə o, Qara dənizə qədər uzanıb gedir. Bu böyük abidənin nə məqsədlə tikildiyi məlum deyilsə də, güman etmək olar ki, Əmir Teymur bununla sərhəddi təyin etmək, öz qüvvət və qüdrətini göstərməkdən başqa bir şey nəzərə almamışdır.

Xülasə, Əmir Teymur Dağıstan işlərini mümkün qədər yoluna qoyduqdan sonra, Buynaq yuxarısındakı məşhur düşərgəsindən hərəkət edib, hicri 798-ci (=1396) ilin baharında Dərbəndə gəldi. Buradan da Ermənistana hərəkət etdi. Kür kənarına çatdıqda, bu səfərdə ona yoldaşlıq edən Şirvan valisi Əmir İbrahim, Əmir

Teymurun şərəfinə bir neçə gün davam edən böyük bir ziyafət verdi, ləyaqətli hədiyyələr təqdim etdi. Özü də sahibqranın lütf və ənamına nail olaraq mürəxxəs oldu. Əmir Teymur Qarabağa gəlib Ağdam adlı yerdə, Dərbənddən Bağdada və Həmədandan Rum sərhəddinə qədər olan bütün əyalətlərin idarəsini oğlu Miranşaha tapşırdı. Özü də Sultaniyyədən keçərək Səmərqəndə getdi. Buradan Hindistana hərəkət etdi. Hicri 801-ci (=1399) ildə Dehli şəhərinin xaricində, bu ölkənin padişahları ilə böyük müharibələr edib qalib gəldi. Məqsədinə çataraq Səmərqəndə qayıtdı. Hicri 802-ci (=1400) ildə yenə İrana hərəkət etdi. Hicri 803-cü (=1401) ildə, Şam valisi Məlik Fərəci məğlub edərək, bütün Şam ölkəsini ələ keçirdi. Buradan da Sultan Əhməd Cəlayirini cəzalandırmaq üçün Bağdada hərəkət etdi. O, keçmişdə Bağdadı Teymur qoşunlarına tərk edib Ruma qaçmışdı. Onlar getdikdən sonra yenə Bağdadı almışdı. Sultan Əhməd bu dəfə yenə qaçıb Rum sultanı İldırım Bayəzidə pənah apardı. Sabiqran bir neçə gün mühasirədən sonra Bağdadı hücumla alıb xaraba qoydu və əhalisinin qılıncdan keçirilməsinə fərman verdi. Rum sultanına da düşmənanə bir məktub yazıb Sultan Əhməd və türkmən Qara Yusifi ondan tələb etdi. Bunların verilməməsi Rum müharibəsinə səbəb oldu.

Sahibqran buradan qayıdıb Qarabağda qışladı və hicri 804-cü (=1402) ildə Rum ölkəsinə hərəkət etdi. Sultan Bayəzid müharibədə məğlub olub əsir düşdü. Rum ölkəsi də bu qüdrətli padişahın hakimiyyəti altına keçdi. Hicri 806-cı (=1404) ildə Əmir Teymur yenə Gürcüstana qayıtdı. Bəzi qələbələrdən sonra bu ölkənin valisi Məlik Gürgin, Teymurun hüzurunda olan Şirvan valisi Əmir İbrahimin vasitəsilə hədiyyələr təqdim edərək ciziyə verməyə razı oldu. Teymur yenə Qarabağa gəlib orada qışladı. Miranşahın başına hava gəldiyi üçün, ona tapşırılan vilayətləri alıb oğlu şahzadə Ömərə verdi. İraqi-Ərəb, İraqi-Əcəm və Fars əyalətlərini idarə edən şahzadələrə tapşırdı ki, onun buyurduqlarına tabe olsunlar. Ölkəni idarə etmək xüsusunda da (Şahzadə Ömərə) gözəl tapşırıqlar verdi... Qarabağda ibni-Firuzi-Sasani tərəfindən bina edilən Bəyləqan şəhəri, Hülaku xan tərəfindən bir müddət mühasirədən sonra hücumla alınıb xarab edilmişdi. Əmir Teymur bu şəhərə çox möhkəm bir hasar çəkdirdi. O, bu şəhəri abad etmək fikrində idi, lakin ilanların çoxluğundan bu iş baş tutmadı.

Dövlətşah Səmərqəndi, hicri 900-cü (=1495) ildə, Təzkirətüşşüərasında yazır: Şahrux ibn-Əmir Teymur bu şəhəri abad etmək istəyirdi. Lakin ölkənin məlumatlı adamları, bu şəhərin dəfələrlə zəlzələdən xaraba qaldığını söyləyib onu bu fikirdən daşındırdılar. Amma o, Bəyləqan arxını işə saldı. Bu arxın kənarında salınan dəyirmanlar indi də durur. Müəllif deyir: bu şəhərdə, sultanların qəbirləri üzərində iki uca minara var imiş. Bunlardan birisi yarım xaraba halında indi də mövcuddur. Buna görə, xalq Bəyləqanı Millər deyə adlandırır.

Sahibqran bu tədbirlərdən sonra Ərdəbilə gəlib Şeyx Səfi türbəsini ziyarət etdi. Bir çox kənd və əkin yerləri alıb o həzrətin türbəsinə vəqf etdi. Buradan paytaxtı Səmərqəndə qayıtdı. Bir neçə gün keçəndən sonra, qışın şiddətli vaxtında

Çin səfərinə hərəkət etdi. Ətrar adlı yerdə xəstələnərək hicri 807-ci (=1405) ildə vəfat etdi...

O, böyük işlərilə məşğul olmasına baxmayaraq, bir dəqiqə də olsun, elm və maarif sahiblərini himayə etməkdən geri durmazdı. Öz övladı üçün qoyub getdiyi düsturül'əməl, onun dünyanı idarə etməkdən nə dərəcədə ehtiyatlı, cahangirlikdə nə sayaq əzm sahibi olduğunu bildirir.

O zaman hüzurunda olan böyük övladı Xəlil Sultan ibni Miranşah, 20 yaşında taxta çıxdı. O, dövlət və ordu işlərinə fikir verməyib arvadının təsiri altına düşdü. Buna görə, səltənətin əsası gündən-günə sarsılaraq vilayətlərin çoxu bu xanədanın əlindən çıxdı. Onların əlində yalnız Mavəraünnəhr və Xorasan qaldı. Daha sonra, bunların səltənəti Hindistana keçdi.

Gülşəni-xüləfədə yazılmışdır: Rum ölkəsi alındıqdan sonra, Sultan Əhməd və Qara Yusif, Misirə qaçmışdılar. Misir sultanı onları həbsə alıb Əmir Teymurun hüzuruna göndərmək istəyirdi. Bu zaman onun vəfat xəbəri Misirə çatdı. Sultan Əhməd Bağdada gəlib Əmir Teymurun nəvəsi Əbubəkr Mirzəni valilikdən çıxartdı. Buradan Qara Yusif Qara Məhəmməd oğlu ilə Azərbaycana Miranşah və şahzadə Ömərin müharibəsinə getdi və onlara qalib gəldi. Miranşah bu müharibədə öldürüldü, şahzadə Ömər isə, qaçıb qurtardı. İran ölkəsinin bir çox hissəsi yenə Sultan Əhmədin ixtiyarına keçdi. Axırda onunla Qara Yusif arasına ziddiyyət düşdü. Sultan Əhməd hicri 813-cü (=1411) ildə Azərbaycanda olan müharibə nəticəsində məğlub olub əsir düşdü və Təbrizdə Qara Yusifin oğlu Əmir İsfəndiyarın əlində öldürüldü. Səltənət bu sülalədən, Qaraqoyunlu padişahlarına keçdi.

Qaraqoyunluların mənşəi haqqında olan məlumat belədir: Qara Yusif ibni-Qara Məhəmməd ibni-Bayram Xacə, ata-babadan türkmən Qaraqoyunlu qəbilələrindən bir çoxunun əmiri idi. Sultan Əhməd Elxaninin tərbiyəsi ilə iqtidar sahibi olub, ondan sonra da, əzəmətli bir padişah olmuşdu. Hicri 816-cı (=1414) ildə külli qoşunla Şahrux Teymur oğlunun müharibəsinə getdi. Ucan adlı yerdə qəflətən vəfat etdi. Oğlu İskəndər səltənətə keçdi və üç dəfə Şahrux ilə müharibə edib məğlub oldu.

Başqa bir nüsxədə deyilir: İskəndər hicri 828-ci (=1425) ildə Şirvana gəlib qətl-qarətə başladı və Şamaxı şəhərini viran etdi. Bu zaman qardaşı Mirzə Cahanşah bəzi türkmən əmirləri və əsgərləri ilə Şahruxun yanına getdi. Şahrux ona vədə verib inandırdı ki, əgər o, qardaşının şərrini dəf etsə, Diyarbəkir və Azərbaycan hakimiyyətini alacaqdır. İskəndər Naxçıvanın Alıncaq adlı qalasına çəkildi. Bir neçə vaxtdan sonra, onun xain oğlu Qubad, sevişdiyi bir kəniz ilə əlbir olub Cahanşahın təhrikilə, onu öldürdü. Nüxbə müəllifinin yazdığına görə, Qubad da atasından sonra Cahanşahın hiyləsilə öldürüldü.

Cahanşah, Şahruxun canişini olub Diyarbəkir və Azərbaycanda 22 il hökmranlıq sürdü. Şahruxun vəfatından sonra, Xorasandan başqa bütün İrana hökmran oldu. Qədim düşməni türkmən Ağqoyunlu Həsən bəy Bayındır ilə

müharibə etdi. Həsən bəy vaxt qazanmaq üçün müharibədən çəkinib ətrafda dolanırdı. Bir müddətdən sonra hər iki tərəfin qoşunu dağıldı və müharibə təxirə salındı. Bir gün Cahanşah beş-altı yüz nəfərlə, bir çayın kənarında içki və işrətlə məşğul idi. Həsən bəy fürsətdən istifadə edərək, Hicri 872-ci (=1468) ildə, 80 yaşlı Cahanşahı öldürdü. Beləliklə, səltənət bu sülalədən ağqoyunlu sultanlarına keçdi.

Ağqoyunluların mənşəyi haqqında olan məlumat belədir:

Qaraqoyunlu və ağqoyunlular tərəkəmə, yəni türkmən nəslindən iki köçəri qəbilə idilər. Bunlar, Arğun xan zamanında İrana gəldilər. Qaraqoyunlular Azərbaycan ətrafında, Ərzrum və Sivasda, ağqoyunlular isə Diyarbəkirdə sakin oldular. Onlar gündən-günə qüvvətlənib səltənət qurdular. Həsən bəyin babası Qara Osman, Əmir Teymurun zamanında Diyarbəkirin bəzi yerlərində hakim idi. Ondan sonra oğlu Əli bəy və bundan sonra da Uzun Həsən adı ilə məşhur olan oğlu Həsən bəy hökmranlıq etdilər.

Cahanşah öldürüldükdən sonra, oğlu Həsənəli Mirzə, o zaman Mavəraünnəhr və Xorasan padişahı Sultan Əbusəid ibni-Miranşah ibni-Əmir Teymur Kürəkəndən kömək istədi. Sultan Əbusəid İraq və Fars vilayətlərini almaq üçün əmirlər təyin edib, özü də 27 min qoşunla Azərbaycana hərəkət etdi. Həsən bəy peydərpey elçilər göndərib öz itaətini və yalnız Azərbaycanla kifayətlənəcəyini bildirdi. Bu isə sultanın hərəkətinə mane ola bilmədi. Həsən bəyin anası bu xüsusda danışıq aparmaq üçün sultanın yanına getdisə də arzusuna çatmadan geri qayıtdı. Sultan Əbusəid Sultaniyyəyə gəldiyi zaman, Həsən bəy Qarabağa getdi. Sultanın qoşunu Miyanəcə yetişdikdən sonra, Həsən bəy ixlas və iradəsini bildirmək və möhlət almaq üçün oğlu Yüsif bəyi sultanın yanına gətirdi. Ondan xahiş etdi ki, qış qurtarıncaya qədər, ona Azərbaycanda qalmağa izn versin. Sultan yenə qəbul etməyib əmirlərin məşvərətilə Həsən bəyin məskəni olan Qarabağda qışlamağı qərara aldı. Bu yerin yeddi ağaclığına çatdıqda, azuqələrin azlığından Şirvanın Mahmudabad şəhərinə hərəkət etdi. Yol üzərindəki çöllərin otu-ələfi zəhərli olduğundan onların bir çox heyvanları tələf oldu. Burada da azuqə az tapılırdı. Həsən bəy yolları kəsib qoymurdu ki, sultan ordusuna Xorasan və İraqdan bir nəfər də gəlsin. Bir neçə gün idi azuqəni Şirvandan gəmi ilə gətirirdilər. Bundan sonra şirvanşah da, Həsən bəyin təhdidinə görə, sultanla müxalifətə başladı.

Sultan ordusundakı heyvanlar zəiflədiyindən türkmən qoşunları bu ətrafda qətl-qarətə başladılar. Sultan naçar qalaraq Ərdəbilə hərəkət etdi və bataqlıq yerlərdən çətinliklə keçdi. Həsən bəy vuruşa-vuruşa onu təqib edirdi. Bir günün içərisində o, sultanın qoşunundan 500 nəfər öldürdü. Sultan barışmaq üçün Sarı xanədanının böyük əmirlərindən Seyid Qiyasəddin Məhəmmədi elçi göndərdi. Onun ardınca da, anasını Qumlu Seyid İbrahim ilə yolladı. Həsən bəy təzim mərasimini yerinə yetirib sülh etmək istəyirdi. Lakin bir az əvvəl, elçi getmiş olan Ərdəbil seyidi Şeyx Heydər Səfəvi, sultan ordusunun pərişanlığını görmüş olduğundan buna mane oldu.

Həsən bəy sultanın anasının xahişini qəbul etməyib geri qaytardı. Seyid Qiyasəddinə isə lütf və mərhəmət göstərib, Sarı hökumətini ona bağışladı. Türkmən qoşunlarının şiddətli hücumları nəticəsində, xorasanlıların bir hissəsi də Həsən bəyin ordusuna qoşuldu. Sultan naçar qalıb qaçmağa üz qoydu. Həsən bəyin oğlu Yusif bəy onu təqib etdi, gecə onu tutub atasının yanına gətirdi. Sultan ilə Həsən bəy arasında bir çox danışıqlar oldu. Türkmən əmirlərinin məsləhəti və Şirvan qazisinin fitnəkarlığı ilə Sultan Əbusəid hicri 873-cü (=1468) ildə öldürüldü... Həsən bəy İranda taxta çıxıb, hicri 882-ci (=1477) ildə vəfat etdi. Oğlu Xəlil Mirzə onun yerinə keçdi. Bir il sonra, qardaşı Yaqub Mirzə ilə etdiyi müharibədə öldürüldü. Sultan Yaqub da on üç il səltənət sürdü. Sonra Qarabağın Sultanbud adlı yerində anası bilməyərək ona zəhər verdi. Özü də buna tab gətirməyib zəhər içdi və oğlu ilə bir yerdə öldü...

Sultan Yaqub öləndən sonra türkmən əmirləri iki dəstəyə ayrıldılar: bunlardan biri Sultan Yaqub qardaşı Məsih Mirzənin, o biri isə, oğlu Baysunqar Mirzənin tərəfdarı idi. Axırda iş müharibə ilə nəticələndi. Məsih Mirzə öldürüldü, hökumət başına Baysunqar keçdi. Əmisi oğlu Rüstəm Mirzə ibni-Məqsud ibni-Həsən padişah onun tərəfindən Alıncaq qalasında həbsə alındı. Lakin Rüstəm Mirzə, Əbih Sultanın köməyilə xilas və Baysunqara qalib gələrək padişah oldu. Baysunqar naçar qalıb Qaracadağ və Əhər yolu ilə Şirvana, dayısı və qaynatası olan şirvanşahın yanına gəldi. Türkmən əmirləri, ümumiyyətlə Rüstəm Mirzənin hökmranlığına tərəfdar idilər. Lakin, şirvanşah Baysunqara kömək məqsədilə onun qoşununu düzəldib nizama salırdı. Rüstəm Mirzə əmirlərin məsləhətilə, Stəxr qalasında məhbus olan Sultan Əli Şeyx Heydər oğlunu gətirib şirvanşaha qarşı müharibəyə göndərmək istəyirdi. Sultan Əlinin qalib gəlməsi və ya məğlub olması onun dövlətinin xeyrinə idi. Bu zaman, Baysunqar Şirvan qoşunu ilə Azərbaycana hərəkət etdi. Rüstəm Mirzə, Sultan Əlini müridləri və tabelərilə, Əbih Sultanı da, bir dəstə türkmən qoşunu ilə Baysunqarı və şirvanlıları dəf etmək üçün göndərdi. Əhər və Mişkin hüdudunda iki qoşun üz-üzə gəldi. Baysunqar məğlub edilərək öldürüldü. Rüstəm Mirzənin hökmranlığından 6 il keçmişdi, vaxtilə Rum ölkəsinə gedib ikinci Sultan Bəyazidin damadı olmaq şərəfinə yetişən Əhməd ibni-Məhəmməd ibni-Həsən padişah Azərbaycana gəldi. Araz çayı kənarında müharibəyə girişib Rüstəm Mirzəyə qalib gəldi. Rüstəm Mirzəni əmirləri tutub ona verdilər, o da onu öldürtdü. Əhməd özü də altı ay sonra, hicri 903-cü (=1498) ildə, Əbih Sultanın əlində öldürüldü. Sultan Murad ibni-Sultan Yaqub səltənətə keçdi. Lakin Məhəmməd Mirzə ibni-Yusif ibni-Həsən padişah ona qalib gəldi. Əbih Sultanı öldürərək Azərbaycana sahib oldu. Sultan Murad İraqa getdi. Əlvənd Mirzə öz qardaşı Məhəmmədi ilə vuruşaraq hökuməti onun əlindən aldı. Məhəmmədi Mirzə İsfahana qaçdı. Sultan Murad Şirazdan İsfahana gəlib hicri 904-cü (=1499) ildə Məhəmmədini tutdu və Təbrizə sürgün etdi. Əlvənd Mirzə müharibə fikrində idi, lakin xeyirxahların vasitəçiliyilə araya sülh düşdü. Diyarbəkir və Azərbaycan Əlvənd Mirzəyə, İraqi-Ərəb, İraqi-Əcəm və Fars da Sultan Murada çatdı.

## *ŞİRVANŞAHLARIN SƏLTƏNƏTİ VƏ NƏSƏBƏLƏRİ HAQQINDA*

Onların haqqında yalnız bu qədər məlumdur ki, müstəqil bir səltənətə malik olmayıb çox vaxt fars, ərəb və türklərin sultanlarına tabe olmuşlar, bəzən də müstəqil hökmranlıq sürmüşlər. Şirvanşahların; böyük xaqan Mənuçehrdən əvvəlki silsilələri (şəcərələri) də lazımınca məlum deyildi.

Ömər ibni-Xəttabın xilafəti zamanında, Nuşirəvani-Adil tərəfindən təsis edilmiş şiranşahlar sülaləsindən Şəhriyar adlı bir nəfər Şirvanda hökmranlıq edirdi. Süraqə ibni-Əmr və Əbdürrəhman ibni-Səlmə, Xüzeyfə ibni-Yəmən, Müğeyrə ibni-Şəbə, Əşəs ibni-Qeys, Əbdüləzizi-Bahili, Əbu Übeydeyi-Cərrah, Səid ibni-Əmr Hərşi və Müslimə ibni-Əbdülməlik xəlifə Şirvanda hökmranlıq edirdilər. Bəni-Abbas xəlifələri dövründə isə, Şirvan çox vaxt Azərbaycan hakimlərinin idarəsi altında idi. II əsrin sonlarında Fərruxzad Əxşican (Əxistan) oğlu və bundan sonra Filanşah, xəlifələr adından naib olaraq padişahlıq etmişlər. IV əsrin əvvəllərində Əli ibni-Heyşəm, bundan sonra da Bəhrami-Çubin nəslindən Məhəmməd ibni-Yəzid Şirvanda vali olmuşlar. Məhəmməd ibni-Yəzidin hökmü bir aylıq məsafədə rəvan idi. Bir müddətdən sonra, Sultan Firidün hökmranlıq etmişdir. Ondan sonra bir şey məlum deyildir.

Hicri IV əsrin ortalarında, Xaqani-Kəbir ləqəbi ilə məşhur Mənuçehr, əzəmətli və müstəqil bir hökmdar idi. Məşhur şair Xaqani Şirvani, bununla müasir olmuşdur. Onun şövkət və iqtidarını və oğlunun Bakı ətrafında vəhşi heyvanlar ovuna çıxmasını qəsidələrinin birində gözəl surətdə təsvir edir.

O zaman dəniz ilə yanar odlar arasında olan Bakı, əhalinin azlığından şir və sair yırtıcı heyvanlar yatağı imiş. Dövlətşah «Təzkirətüşşüəra»sında yazır: alim və mənsəb sahibi olan İbrahim ibni-Əli Xaqani, dünyadan əl çəkmək bəhanəsilə Həccə getmək istəyirdi. Xaqan isə buna razı olmurdu. O, xaqandan izinsiz yola çıxdı, xaqanın məmurları Bəyləqan şəhərində onu tutub geri qaytardılar. Bundan məlum olur ki, Ərran ölkəsinin bir qismi də xaqanın ixtiyarında imiş. Qaziyi-Beyzavi «Nizamüttəvarix»də şirvanşahlar sülaləsini Bəhrami-Çubin nəslindən sayır, o da (Bəhrami-Çubin) bir neçə arxdan sonra, Ərdəşiri-Babəkana yetişir. Qazi Əhmədi-Qəffari «Cahanara» adlı əsərində şirvanşahları, aşağıdakı tərtib üzrə, Nuşirəvan nəslindən sayır:

Mənuçehr ibni-Kəsran ibni-Kavus ibni-Şəhriyar ibni-Guştasib ibni-Fridun ibni-Fəramərz ibni-Salar ibni-Zeyd ibni-Covn ibni-Mərziban ibni-Hürmüz ibni-Nuşirəvan.

Bir çox tarixçilərin yazdığına görə, Mənuçehr ədalətli bir padişah olub, elm və sənət əhlini əziz və möhtərəm tutardı. O həmişə rəiyyətin asayişinə və ölkənin abadlığına səy edərdi. Ondan sonra oğlu Fərruxzad, sonra onun oğlu Güştasib taxta oturdu; bəzi tarixçilərin yazdığına görə, Kürün iki qolu arasında, dərya kənarında böyük və məhsulu bol olan Güştasibi şəhərini bu bina etmişdir. Bundan sonra oğlu

Fəramərz, sonra onun oğlu Fərruxzad, sonra onun oğlu ədalətilə məhşur Keyqubad və sonra da oğlu Kavus Şirvanda hökmranlıq etmişdir.

Kavus ədalətli və rəiyyətpərvər bir padişah olub, uzun müddət padişahlıq etmişdir. O, Əşrəf Çobanini dəf etmək üçün Canibəy xana dəfələrlə yaxşı yardım göstərmişdir. Hicri 774-cü (=1373) ildə vəfat etmişdir. Qəbri Quba şəhərinin xaricində indi də mövcuddur. Onun oğlu Huşəng on ilə yaxın qanun, ədalət və bacarıqla hökmranlıq edib, vəfat etdi. Sonra, düşmənlərin qələbəsi üzündən, hökumət bunların əlindən çıxdı.

Şirvanda hökmran olan bir əmir çox zülm edirdi, şirvanlılar birləşib onu öldürdülər. Bu zaman Şeyx İbrahim Dərbəndi ibni-Sultan Məhəmməd ibni-Keyqubad şirvanşah, Şirvan şəhərlərindən sayılan Şəkidə, yoxsul bir halda əkinçiliklə məşğul olurdu. Şirvanlılar gəlib onu tarlada bir ağacın altında yatmış gördülər. Əyninə şahanə paltar və başına əmmamə qoyaraq, gətirib padşahlıq taxtına oturtdular. O, yuxarıda deyildiyi kimi, Əmir Teymur Kürəkənlə müasir olmuşdur.

Tarixçilərdən bəzisi deyir ki, Əmir İbrahim Təbrizi alıb, ertəsi il daha da irəliləmək istəyirdi. Lakin aldığı yerləri də əldən verdi. Bu hadisə, ola bilsin ki, türkmən Qara Yusifin Sultan Əhməd Elxani ilə müharibə etdiyi və Azərbaycan işlərini tamamilə qarma-qarışıq olduğu bir zamanda əmələ gəlmişdir. Məlum olur ki, Əmir Qara Yusif hicri 813-cü (=1411) ildə, Sultan Əhmədi öldürdükdən sonra, Təbrizi Əmir İbrahimin əlindən alıb, Şirvanı da ələ keçirmişdir. Bunu, Dərbəndin «Qiyamət dərvazası» üzərindəki kitabə də təsdiq edir. Kitabəyə görə, bu dərvaza hicri 814-cü (=1412) ildə Qara Yusifin oğlu Əmir İsfəndiyarın əmrilə təmir edilmişdir.

Bu məsələ, Hacı Zeynəlabidin Şirvaninin sözləri ilə də təsdiq edilməkdədir. O, «Riyazüssəyahət»ində belə yazır:

Qara Yusif külli qoşunla Şirvana gəlib bir çox yerləri viran etdi. Əmir İbrahimi əsir edib ondan çoxlu mal-dövlət aldı. Lakin hökuməti yenə özünə verdi.

Hicri 820-ci (=1418) ildə Əmir İbrahim vəfat etdi və Sultan Xəlil padişahlıq taxtına oturdu. «Sultan Xəlil» tərkibi əbcəd hesabilə onun taxta oturması tarixidir. Bakı, Quba və Səlyan yollarında olan karvansaraların bəzisi, Bakıdakı bir çox məscidlər və burclar onun tərəfindən bina edilmişdir. Bundan əlavə o, Dərbənd şəhərinin hasar və qalasını da təmir etdirmişdir. Onun adı bu abidələr üzərindəki kitabələrdə indi də oxunmaqdadır. Bakıda tikdirmiş olduğu ali imarətin (sarayın) xarabaları onun şan və şövkətindən bir nişanədir.

«Riyazüssəyahə»də deyilir: İskəndər Qara Yusif oğlu külli qoşunla Şirvana gəldi. Sultan Xəlil qaçdı və türkmənlərdən bu ölkəyə saysız sədəmə toxundu. O, Şahrux Mirzənin köməyilə türkmənlərin şərrini dəf etdi. 53 il səltənət sürdükdən sonra, Sultan Xəlil vəfat etdi. Oğlu Fərrux Yasər ona canişin oldu. «Şirvanşah» tərkibi (əbcəd hesabilə) onun taxta oturması tarixidir. Hicri 906-cı (=1501) ildə Şah İsmayıl Səfəvi ilə apardığı müharibədə öldürüldü. Sonra, oğlanları Bəhram bəy və

Qazi bəy hər biri bir ilə yaxın hökumət sürdü. Onlar ədalətli və rəiyyətpərvər idilər. Vəfatlarından sonra, Şeyxşah ləqəbli İbrahim ibni-Fərrux Yasər taxta oturdu. O bir neçə vaxtdan sonra Şah İsmayıl və Şah Təhmasib Səfəvi ilə sülh etdi. Onların hakimiyyəti altında 22 il asudə hökmranlıq sürdükdən sonra vəfat etdi. Oğlu II Sultan Xəlil taxta oturub, Şah Təhmasiblə qohum oldu. O, hicri 942-ci (=1536) ildə vəfat etdi. Ondan sonra Şahrux ibni-Sultan Fərrux ibni-Şeyxşah əmirlər və dövlət böyüklərinin arzusu ilə səltənətə keçdi, lakin uşaq olduğundan iş baş tutmadı. Hicri 945-ci (=1539) ildə, Şirvan vilayəti İran padişahının təsərrüfünə keçdi.

I Şah Təhmasib Səfəvi buranın idarəsini öz qardaşı Əlqas Mirzəyə verdi. Əlqas Mirzə üsyan etdikdən sonra Şah Təhmasib hicri 954-cü (=1547) ildə oğlu İsmayıl Mirzəni buraya hakim göndərdi. Hicri 955-ci (=1548) ildə, şirvanşahlar nəslindən Bürhan Mirzə adlı bir nəfər fürsət tapıb Şirvanı aldı. Lakin bir neçə gün hökmranlıq sürdükdən sonra vəfat etdi.

Şirvan hökuməti, şahın bibisi oğlu və damadı Ustacallı Abdulla xana həvalə olundu. O da 17 il hökmranlıq sürdükdən sonra vəfat etdi. Bundan sonra, rumlu Aras xan 13 il hökmranlıq sürdü. Hicri 986-cı (=1578) ildə Bürhan Mirzəni Lala paşa gəlib Şirvanı aldı və Osman paşanı buraya hakim təyin edib geri qayıtdı.

Rum və İran qoşunları bir müddət bir-birilə müharibə edirdilər. İranın vəziri - əzəmi Mirzə Səlman gəlib Osman paşanı məğlub etdi. O da bu məğlubiyyətdən sonra Dərbəndə getdi. Şirvanda qalan Məhəmmədqulu xəlifə Zülqədər, osmanlı-tatar müharibəsində öldürüldü. Şirvan ikinci dəfə Osman paşanın əlinə keçdi. Mirzə Səlman yenə gəldi. Osman paşa Dərbəndə qayıtdı.

Peykər xan Qacar və onun vəfatından sonra Xəlifə Ənsar Qaradaği Şirvana hakim təyin olundular; lakin onlar bir iş görə bilmədilər və hər ikisi çox keçmədən vəfat etdi. Bunlardan sonra Osman paşa, sonra Həsən paşa, Mahmud paşa və Əhməd paşa Şirvanda hökmranlıq sürürdülər.

Hicri 1016-cı (=1607) ildə I Şah Abbas gəlib buranı aldı. Bu zamandan etibarən Şirvanı İran bəylərbəyisi idarə etməyə başladı. Qaramanlı Zülfüqar xan - 2 il, Yusif xan - 18 il, Ərəb xan - 8 il, Fərəc xan - 3 il, Ərəb xan - 11 il, Xosrov xan - 8 il, Mənuçehr xan -7 il, Hacı xan - 3 il, Məhəmmədi xan - 2 il, Nəcəfqulu xan - 7 il, Mehrəli xan -13 il, Məkriqulu xan - 2 il, Səid xan - 7 il, Əliqulu xan - 6 il, Musa xan ilə Həsənəli xan - 20 il və Hüseyn xan - 2 il Şirvanda bəylərbəyi olmuşlar.

Hicri 1124-cü (=1712) ildə müskürlü Hacı Davud, Üsmini və Surxayın köməyilə Quba hakimini tələf edib, Şamaxını aldı və qüdrətli bir hökmran oldu. Sonra, hicri 1138-ci (=1725) ildən Nadir şahın gəlməsinə qədər, Şamaxı 9 il Surxay xanın ixtiyarında qaldı. Şirvan adından sonra, Məhəmmədqulu xan Səidli və Əliqulu xan Şirvana hakim təyin olundular.

Nadir şah tac qoyduqdan sonra, qardaşı İbrahim xan üç il, Qaplanguhdan Dağıstanın son sərhəddinə qədər idarə edirdi. Xorasanlı Mehdi xan isə, Şirvana əmirül'ümara təyin edilmişdi. Mehdi xanın öldürülməsindən sonra, Sərdar xan Qırxlı 5 il və Heydər xan Əfşar 1 il Şirvanda əmirül'ümara oldular.

Hicri 1157-ci (=1743) ildə, Sam Mirzə və Məhəmməd xan Surxay xan oğlu Şirvanın asayişini pozub, az bir müddət hökmran oldular, Azərbaycan sərdarı Aşur xan və Fətəli xan Əfşar onları ölkədən çıxardılar. Lakin Nadir dövrünün son günləri tamamilə iğtişaş zamanı olduğundan, Şirvanın işləri də intizam tapmadı. Nadir şah vəfat etdikdən sonra, Şirvanın hər bir vilayətində ayrı və müstəqil xanlıqlar əmələ gəldi. Onlar Şirvan, Şəki, Bakı, Quba və Dərbənd xanlıqlarından ibarət idi. Lakin Dərbənd xanlığı tezliklə Quba xanlığı ilə birləşdi, yerdə qalan dörd xanlıq da müxtəlif zamanlarda rus dövlətinin təsərrüfünə keçdi.

## DÖRDÜNCÜ FƏSİL

### *SƏFƏVİLƏR DÖVLƏTİNİN ZÜHURUNDAN NADİR ŞAHIN VƏFATINA QƏDƏR*

Aləmara[64], Həbibüssiyər və sair bir çox tarixi mənbələrə görə, Səfəviyyə sultanları Şeyx Səfiyyəddin İshaqın nəslindən olduqları üçün bu ləqəblə adlanmışlar. Şeyx Səfiyyəddin, ata-babadan böyük və məşhur seyidlərdən və hörmətli şeyxlərdən biri olmuşdur. Onun Ərdəbildəki ali türbəsi, indi də xalqın ziyarətgahıdır. Nəsəbi 21-ci arxada, yeddinci imam Museyi-Kazimə çatır.

Şeyx Səfiyyəddindən sonra, oğlu Şeyx Sədrəddin Musa, ondan sonra oğlu Xacə Əli, ondan sonra Şeyxşah adı ilə məşhur oğlu İbrahim və ondan sonra da oğlu Şeyx Cüneyd zahiri və batini dövləti (hakimiyyəti) öz şəxslərində toplamışdılar. Hər tərəfdən çoxlu mürid onların asitanəsinə üz qoyub irşad gözləyirdi. Şeyx Cüneydin cəh-cəlalı və müridlərinin sayı gündən-günə artırdı.

O zaman İraqi-Ərəb, İraqi-Əcəm və Azərbaycan padişahı olan türkmən qaraqoyunlu Cahanşah, dövlətinin zəvalından qorxuya düşüb, Şeyx Cüneyd haqqında bədgüman oldu. Ancaq, bədnamlıq qorxusundan, ədavətini izhar edə bilmirdi. Axırda, bəzən kinayə və bəzən də açıqdan-açığa onun bir tərəfə getməsini arzu etdi. Şeyx Cüneyd də öz tərəfdarları ilə Diyarbəkirə getdi. Diyarbəkir vilayətinin yarısına hakim olmuş və Uzun Həsən ləqəbilə şöhrət tapmış olan türkmən ağqoyunlu Həsən bəy Cahanşaha itaət etmirdi. O, öz bacısı Xədicə bəyimi Şeyx Cüneydə verdi. Bir zaman keçdikdən sonra Şeyx Cüneyd yenə Ərdəbilə qayıtdı. Bu zaman Cahanşah onu dəf etmək xəyalına düşdü. Şeyx Cüneyd də öz müridlərinin sayını artırıb səltənət iddiasına başladı. Çərkəzlərə qarşı müharibə etmək fikrilə 10000 nəfər toplayıb Şirvan tərəfinə hərəkət etdi. «Fütuhati-Əmini» kitabında deyilir ki, o Şirvanı almağa getmişdi. Necə olursa-olsun, şirvanşah Sultan Xəlil Təbərsəran əhalisinin təhrikilə, onun çərkəz tərəfinə getməsinə mane oldu və qoşun toplayıb döyüşə çıxdı. Şeyx Cüneyd müharibədə öldürüldü. Səfəviyyə xanədanının təbərsəranlı tərəfdarlarından bir dəstə camaat, onun nəşini Samur çayının sol tərəfində, Qıpçah kəndinin yaxınlığında olan müharibə meydanından çıxarıb Quba və Qülhan nahiyəsini Quryan (indiki Həzrə) kəndində basdırdılar. Öldürüldüyü yerdə indi də nişangahı vardır.

Bu hadisə hicri 851-ci (=1447) ildə vaqe olmuşdur. Yüz il keçəndən sonra, I Şah Təhmasib Səfəvi, onun qəbri üzərində ali bir türbə tikdirmişdir. Asarı indi də mövcud olub, yerli əhalinin ziyarətgahıdır. Həsən bəyin bacısı oğlu Şeyx Heydər atasının canişini oldu. Həsən bəy padişahlıq məqamına çatınca, öz qızı Həlimə

---

[64] «Aləmara» - tam adı: «Tarixi-aləmarayi-Abbasi»dir. I Şah Abbasın münşisi İsgəndər bəyin əseridir. O, bu kitabında Səfəvi dövlətinin mükəmməl bir tarixini yazmışdır. İskəndər bəy özü Azərbaycan tərəkəmələrindən olub, təqribən hicri 968-ci (-1560) ildə anadan olmuşdur.

bəyimi Şeyx Heydərə verdi, onun şövkət və iqtidarını daha da artırdı. Bundan sonra Şeyx Heydər, guya ona yuxuda əmr olunubdur deyə, o zaman mütəarif olan türkmən taqiyəsi əvəzinə, başına qırmızı şaldan on iki tərkli (dilimli)... bir tac qoydu. Müridləri də ona tabe olaraq bu papaqla başqalarından seçildilər, o zamandan qızılbaş adı ilə məşhur oldular.

Həsən padişah öləndən sonra, oğlu Sultan Xəlil və bundan sonra da Sultan Yaqub padişahlıq etdi. Şeyx Heydər, dayısı oğlu Sultan Yaqubun ona qarşı olan rəftarını yaxşı görmədi. Hicri 893-cü (=1488) ildə çərkəzlərə qarşı cəhada başlamaq üçün Şəki yolu ilə Dərbəndə getdi. Dərbənd əhalisi onun qoşununa hücum etdi, o da Dərbəndin fəthini qərara aldı. Mühasirə edilmiş qala əhalisinin vəziyyəti çətinləşdi. Şeyx Heydəri dəf etməyə iqtidarı olmayan şirvanşah Fərrux Yəsar, damadı Sultan Yaqubun yanına bir-birinin ardınca elçilər göndərib kömək istəyirdi. O deyirdi ki, əgər Şeyx Heydər Şirvanı istila etsə, türkmən dövlətinin də məhv olmaq qorxusu vardır. Sultan Yaqub, şirvanşahın köməyinə Bicən oğlu Süleyman bəyin komandası altında 4000 seçmə əsgər göndərdi. O da öz qoşununu toplayıb, Şeyx Heydərin ardınca getdi. Dərbənd qalası alınmaq üzrə ikən, onların eşitmək xəbəri Şeyx Heydərə çatdı. O, qalanın yanında onları qarşılamağa getdi və Təbərsəran hüdudunda iki qoşun üz-üzə gəldi. Şiddətli müharibə oldu və bu müharibədə hər iki tərəfdən bir çox adam tələf oldu, Şeyx Heydər özü də ox yarasından öldü.

«Fütuhati-Əmini»də deyilir: bu xəbərlərin əsli, Şeyx Heydər oğlu Şah İsmayılın buyruğu ilə, bu müharibədə iştirak edən Həsən bəy lələ və Fərrux ağa kimi şəxslərdən öyrənilmişdir. Şeyx Heydərin nəşini, müridləri Təbərsəranda dəfn etdilər. Bu hadisədən 22 il keçdikdən sonra hicri 915-ci (=1510) ildə, Şah İsmayıl ikinci dəfə Şirvana gəldiyi zaman onun nəşini Ərdəbilə apardı. Müəllif deyir: onun qəbri Təbərsəranın Ətək mahalında, Rubas çayının sol kənarındadır. Bu qəbr, Tənit kəndinin bir ağaclığında olub, üzərindəki günbəz indi də yerli əhalinin ziyarətgahıdır.

Şeyx Heydərin vəfatından sonra, onun böyük oğlu Sultan Əli, Ərdəbildə İrşad məsnədinə (təriqət başçılığına) keçib, hökmranlıq üçün hazırlanmağa başladı. Bu xanədanın müridləri, əqidələrini aşkara çıxarıb, beyəti təzələyirdilər. Sultan Yaqub onu, qardaşları və anası ilə bərabər İstəxri-Fars qalasına göndərib, həbs etdirdi. Sultan Əlinin anası Sultan Yaqubun bacısı idi. Onlar dörd il yarım orada qaldılar. Rüstəm Mirzə, yuxarıda göstərildiyi kimi, vaxtın təqazasına görə, onları Təbrizə gətirdi. Baysunqar Mirzə öldürüldükdən sonra, Sultan Əlini izzət və ehtiramla Ərdəbilə göndərdi. Bir neçə vaxtdan sonra, Rüstəm Mirzə sufi firqəsinin toplanmasını və müridlərin artmasını görərək Sultan Əlidən şübhəyə düşdü. Onu yenə qardaşları ilə bərabər Təbrizə gətirdi və üzərində gözətçilər qoydu.

Müridlərin gizli və aşkar olaraq gediş-gəlişi davam etdiyindən, Rüstəm Mirzə onu dəf etmək fikrinə düşdü. Sultan Əli, qardaşları və 700 nəfər müridləri ilə bərabər, Ərdəbilə doğru hərəkət etdi. 4000 əsgər ilə onu təqib etməyə məmur

edilən Əbih Sultan, Ərdəbilin şimal tərəfində ona çatdı. Dava qızışdı və Sultan Əli öldürüldü. Sufilərin başçıları, altı yaşlı qardaşı İsmayıl Mirzəni o biri qardaşı İbrahim Mirzə ilə bərabər, gizli olaraq, Ərdəbilə gətirdilər, 40 gündən sonra da Gilana apardılar. İsmayıl Mirzənin anadan olması tarixi hicri 898-ci (=1493) ildə üz vermişdir.

Nə qədər ki, türkmən təbəqələri arasına ikitirəlik düşməyib, istiqlaliyyətləri ixtilala üz tutmamışdı, Gilan hakimi Mirzə Əli Karkiya onlara qarşı lazımi məhəbbət göstərirdi. İsmayıl Mirzə hicri 906-cı (=1501) ildə xüruc edərək, Rum ilə Şam sufi və müridlərindən 1500 nəfərlə Ərdəbilə gəldi. Qoşunu az olduğundan, müharibəni məsləhət görməyib Talışa getdi. Qış qurtarandan sonra yenə Ərdəbilə gəlib Qarabağa hərəkət etdi. Oradan da şahanə bir cəh-cəlal və başına toplanan külli qoşunla, Şirvana yola düşdü.

Fərrux Yasər 20000 atlı və neçə min piyada qoşunla «Gülüstan qalası» yaxınlığında Cəbəlani yaylağında onunla hərb etdi. Gülüstan qalasının xarabası Şamaxı şəhərinin yuxarısında, bir dağ üzərində «Qız qalası» adı ilə məşhurdur. O, buradakı döyüşdə məğlub olub, böyüklərindən bir çoxu ilə bərabər öldürüldü. Şirvanşahın igid oğlu İbrahim Şeyxşah, gəmiyə minib Gilana getdi. Şah İsmayılın səltənət təbili bu ölkədə çalındı. Qışı Şirvanın Mahmudabad şəhərində keçirdi. Qalaları və şəhərləri bütün xəzinələri ilə bərabər onun əlinə keçdi. Lakin bəzi qalaların əhalisi təslim olmaq istəmirdilər. I Şah İsmayıl, bir tərəfdən çox dərin xəndək, üç tərəfdən isə dəniz ilə əhatə olunmuş Bakı qalasını azacıq müdafiə və müqavimətdən sonra fəth etdi. Bu qalanı Nuşirəvan bina etmişdi. Şirvan padişahları da ona çox möhkəm bir burc çəkmişdilər. Bundan sonra, məşhur qalalardan hesab edilən və Şirvan əmirləri ilə əhalidən bəzisinin sığınağı olan Gülüstan qalasını mühasirəyə aldı. Bu zaman xəbər yetişdi ki, Əmirzadə Əlvənd türkmən əsgərləri ilə Naxçıvana gəlib, qoşunu hər iki tərəfdən onunla vuruşa hazırlamışdır. Şah İsmayıl buradan Azərbaycana yola düşdü. Əmirzadə Əlvənd, Muslu Əmir Osmanı bir dəstə qoşunla göndərdi. Şah İsmayıl da öz qoşunlarından bir dəstəni onun qarşısına göndərdi. Şiddətli müharibədən sonra türkmən qoşunu məğlub oldu. Əmir Osman, bir dəstə böyük adamlarla əsir düşüb öldürüldü. Əmirzadə Əlvəndin özü 30000 əsgərlə onun qabağına yeridi. Hicri 907-ci (=1502) ildə, Naxçıvanın Şərur adlı yerində, Şah İsmayıl 7000 qızılbaş qoşunu ilə onu məğlub edib, böyük adamlardan və qoşun əhlindən bir çoxunu öldürdü. Külli qənimət ələ keçdi. Əmirzadə Əlvənd Ərzəncana qaçdı. Şah İsmayıl Təbrizə gəlib səltənət taxtına oturdu. Həmədan ətrafında Sultan Muradı da məğlub etdi.

Sultan Murad məğlub olduqdan sonra, bir müddət Bağdadda qaldı. Buradan damadı Əlaüddövlə Zülqədərə pənah apardı. Onun vasitəsilə öz məqsədinə çatmaq istədi. Hicri 912-ci (=1507) ildə Zülqədərin qoşunu ilə gəlib Diyarbəkirin qala və şəhərlərindən bəzisini aldı. Sonrakı il Şah İsmayıl çoxlu qoşunla onu dəf etməyə getdi. Müharibə alovu iki gün şiddətlə şöləländi, üçüncü gün Sultan Murad məğlub olub yenə Əlaüddövlənin yanına getdi.

Şah İsmayıl bir-birinin ardınca Diyarbəkir, İraqi-Ərəb, İraqi-Əcəm, Fars, Xorasan və Mavəraünnəhrin bəzi yerlərini fəth edib, yenə də Təbrizə qayıtdı.

Bu zaman xəbər çatdı ki, Şeyxşah Şirvanı ələ keçirib istiqlaliyyətdən dəm vurur və xərac verməkdən də boyun qaçırır. Bu xəbər şahın qəzəbini alovlandırdı. Qışın şiddətli soyuq bir çağında, hicri 915-ci (=1510) ildə, Şirvana hərəkət etdi. Şeyxşah müqavimət göstərə bilməyib Beyqurd qalasına qaçdı. Bu qala Şamaxının üç ağac şimalında, çətin keçidli bir yerdə olub xarabaları indi də mövcuddur.

Bu qalanın yanında həmin adla böyük bir kənd də vardır.

Şah İsmayıl Şirvana gəlib Lələ bəyi Şamaxıda Şirvan hakimi təyin etdi və özü də bu vilayətin qala və şəhərlərini almaqla məşğul oldu. Bakı və Şabran qalasının mühafizləri təslim oldular. Dərbəndlilər qalanın möhkəmliyinə arxalanaraq bir neçə gün müqavimət göstərdilərsə də, axırda təslim oldular. Şah İsmayıl, yeni hökumətə dayaq olmaq və onu möhkəm saxlamaq üçün İraqda yaşayan Bayat türklərindən bir dəstəni siyahi üzrə köçürüb Dərbənd və Şabranda yerləşdirdi. Özü də həmin qışda Qarabağa gəldi, baharda Sultaniyyəyə getdi.

Sultan Səlim, hicri 920-ci (=1515) ildə, İran ilə müharibəyə gəlib Çaldıran səhrasında Şah İsmayıla qalib gəldi və Təbrizi aldı. O burada doqquz gün qaldıqdan sonra Ruma qayıtdı. Qürurunun çoxluğundan, Əlaüddövlə bu iki padişahdan heç birini (Sultan Səlimi və Şah İsmayılı) tanımaq istəmirdi. Buna görə Sultan Səlim Fərhad paşanı onu cəzalandırmağa məmur etdi. Əlaüddövlə öz tayfasından bəzisi Ruma dağıldı və bir parçası da sonralar Zülqədər oğlu adı ilə məşhur olan nəvəsi ilə Azərbaycana gəldi. Şəmsəddinli mahalı bunlardandır. Bir çoxları da Car, Tala və Dağıstanla qonşu olan yerlərə dağıldılar. Ləzgilər «z» hərfini «b» hərfi ilə dəyişərək, bunlara indi də Bülqədər deyirlər.

Bu tayfa Hülaku xanın Türküstandan köçürüb Şirazda yerləşdirdiyi türkmənlərdəndir. Bunlar orada Diyarbəkirə və Mosula gələrək cəlal və iqtidar sahibi olduqdan sonra, qonşu vilayətlərə təcavüz edirdilər. Bunlardan on nəfəri, yüz otuz səkkiz il o ölkədə hökmranlıq etmişlər. Bunların sonuncusu olan Əlaüddövlə, bir dərəcəyə çatdı ki, bir-birilə vuruşmaqda olan Misir və Şam valilərinin hər ikisi onun köməyinə möhtac oldu. Buna görə o deyərmiş: «Mənim iki toyuğum var, bunlardan bir qızıl, digəri isə gümüş yumurtlayır».

Hicri 929-cu (=1523) ildə, Şah İsmayıl Azərbaycanda olduğu zaman, Şirvan hakimi Şeyxşah ona itaət edərək çoxlu hədiyyə ilə hüzuruna gəldi. Şirvanşahlar xanədanına mənsub bir şahzadə xanımı da Şah İsmayılın hərəmxanasına göndərdi. Bu kimi yaxşı xidmətlərinə görə, Şirvan vilayətləri yenidən ona tapşırıldı.

Sonrakı il, hicri 930-cu (=1524) ilin əvvəllərində, yayın axırlarında Şah İsmayıl vəfat etdi. O, mehribanlıqda dünyanı işıqlandıran və qəhrəmanlıqda düşməni yaxan, od məzaclı bir sultan idi. Qurmuş olduğu səltənətin mühüm işlərilə məşğul olmasına baxmayaraq, Şah İsmayıl alimlərlə müsahib olub şer söyləməyə də maildir. Şah Xətai təxəllüsü ilə yazmış olduğu gözəl şerlər indi də xalq arasında məşhurdur. Bu aşağıdakı beyt onun şerlərindəndir:

Bisütun dağı zar-zar ağlamağımı eşidincə, yerindən oynadı,
Fəryad edib dedi: indi artıq başqa bir Fərhad meydana gəlmişdir.

Ondan sonra, oğlu I Şah Təhmasib padişahlıq taxtına oturdu. Çox keçmədi Şeyxşah da vəfat etdi. Oğlu II Sultan Xəlil Şirvan əyalətində müstəqil oldu. O, Şah Təhmasiblə qohum olmaq şərəfinə nail oldu.

Padişahlardan üz çevirib İranla müharibə qızışdıran Təkəli Ülamə Sultanın təhrikilə, hicri 940-cı (=1533) ildə, Sultan Süleyman ibni-Sultan Səlim Xandigar saysız qoşunla Azərbaycana gəldi. Şah Təhmasib üz-üzə hərb etməyi məsləhət görməyib düşmənin işini azuqə, ələf qıtlığı və qışın şiddətilə bitirmək istədi. Sultan Süleyman çox çətinliklə Sultaniyyəyə və oradan da Bağdada getdi. O şəhəri aldıqdan bir il sonra, Azərbaycana qayıdıb Təbrizi tutdu. Lakin dövlət işlərinin qarışıqlığı və əsgəri qüvvənin nizamsızlığı üzündən Ruma qayıtmağa məcbur oldu.

Gilan tarixini yazan Əbdülfəttah Fumeni deyir: Sultan Süleyman Xoy və Səlmasa gəldiyi zaman, Gilan hakimi və Şah Təhmasibin damadı Əmir Dubac-Müzəffər Sultan onun tərəfinə keçərək, 8000 nəfərlə hüzuruna getdi. Geri qayıtdığı zaman öz nemətilə bəslənən Gühdüm hakimi Əmir Hatəm onun üzərinə basqın edərək, onu məğlub və ordusunu talan etdi. Bu hadisədən sonra, Gilan əhalisi də ondan üz çevirdi. O da əlacsız olaraq gəmiyə minib Şirvana getdi. Şamaxıya çatandan sonra məlum oldu ki, Dərbənd hakimi və şahın damadı olan başqa bir Müzəffər Sultan vəfat etmiş və arvadı dul qalmışdır. Şah Təhmasibin bir bacısı da Əmir Dubacın arvadı olub, vəfat etmişdi. O, Şah Təhmasibin bu bacısını o biri bacısının yerinə almaq istədi. O bununla möhkəm Dərbənd qalasını ələ keçirmək və özünə sığınaq etmək ümidində idi. Yola düşüb Dərbənddə ölən hakimin mənzilinə getdi. Bir neçə gün orada qalandan sonra mətləbini izhar eləyib bu xüsusda israr etdi. Şahzadə xanım gizli olaraq, Təbrizə qardaşının yanına bir adam göndərib macəranı ona bildirdi.

Şah Təhmasib Muğan və Arasbar hakimi şamlı Bayəzid Sultana qəti hökm verdi. O da tam sürətlə gedib Müzəffər Sultanı tutdu. Başına taxta papaq qoyaraq, cürbəcür təhqir və istehza ilə Təbrizə gətirdi. Təbrizdə əyninə içi barıtla doldurulmuş bir don geydirdilər, dəmir bir qəfəs içərisində Rəşidiyyə minarəsinə çıxardıb gülləbaran etdilər.

Hicri 942-ci (=1535) ildə Sultan Xəlil sonsuz olaraq vəfat etdi. Şirvan əmirləri, onun qardaşı oğlu Şahrux ibni-Sultan Fərrux ibni-Şeyxşahı, uşaq ikən taxta oturtdular. Bu sülalənin dövlət qanunları, əmirlərin özbaşınalığı üzündən gücdən düşüb, hərc-mərclik əmələ gəldi. Bu zaman bir dərviş, Sultan Məhəmməd ibni-Şeyxşah iddiası ilə külli qoşun toplayaraq Səlyanı tutdu. Şahruxun yaxın adamları, əmirlərin qanunsuzluğu və əsgərlərin intizamsızlığı üzündən, onu dəf etməyə müqtədir olmayıb Beyqurd qalasına qaçdılar. Dərviş şirvanşahlar paytaxtı Şamaxı şəhərinə gəldi. Dərvişin başına yığılanlar da başı pozuq olub, yanında ağıllı

və iş bilən adam olmadığından, ehtiyatsızlıq edərək, səbəbsiz, Şamaxını buraxıb Səlyana qayıtdı. Beyqurd qalasında olan Şirvan böyükləri onun getməsindən xəbər tutub, Şahrux Mirzənin ordusu ilə onu təqib etdilər. Səlyan ətrafında onu tapıb hərbə başladılar. Dərviş məğlub olub şirvanlıların əlinə keçdi. Şeyx Padar onu öldürdü. Lakin Şirvan əmirləri, həddindən artıq nizamsızlığa, xalqın malına və namusuna təcavüz etməyə başladılar. Şahrux uşaq olduğu üçün, onlara mane ola bilmədi. Qorçibaşı Padar, qoşun və rəiyyətin bir qismi əmirlərin zülmündən Şah Təhmasibin hüzuruna şikayət etdilər. O, hicri 945-ci (=1538) ildə, öz qardaşı Əlqas Mirzəni, Məntəşa Sultan, bir dəstə Qacar əmirləri, Qarabağ talışlarından mürəkkəb 20000 nəfərlik bir qüvvə ilə Qorçibaşı Padarla birlikdə Şirvanı almağa göndərdi. Onlar Şirvana gəldilər. Şirvanlılar onlara boyun əyməyib, qalaları təcrübəli adamlarla möhkəmləndirib, müdafiəyə başladılar. Qızılbaş əsgərləri əvvəlcə Sürxab və daha sonra Qəbələ qalasını aldılar. Şahzadə, Şirvan qalalarının ən möhkəmi olan Gülüstan qalasını almaq üçün bir dəstə qoşun təyin etdi. Özü də Şahrux Mirzənin olduğu Beyqurd qalasına üz qoydu. Şahrux Mirzənin vəkili Hüseyin bəy, igid və cəsur qoşunu ilə qarşıya çıxdı. Beyqurd dərəsində müharibə odu alovlandı. Hüseyn bəy məğlub olub qalaya qayıtdı və qalanı müdafiə etməyə başladı. Dördaylıq mühasirədən sonra, Şəki hakimi Dərviş Məhəmməd xan, şirvanlıların köməyinə gəldi. Şəbxun vurmaq məqsədilə o, qızılbaş ordusuna yaxınlaşdı. Nağara vurulub şeypur çalındı, qorçu və sairdən ibarət bir dəstə döyüşə çıxıb qalib gəldi. Dərviş Məhəmməd xan, qoşunundan bir çoxunu ölümə verdi və heç bir iş görə bilməyib geri qayıtdı. Şirvanlılar köməksiz qaldıqları üçün müqavimət göstərə bilmədilər və qalanı müdafiədən aciz olub xəbər göndərdilər ki, əgər şah özü gələrsə, biz qalanı ona təslim edərik. Əmirlər işin keyfiyyətini şaha ərz etdilər. Şah Təhmasib Mərənddən köçüb, qalanın ayağına gəldi. Ertəsi gün vəkil Hüseyn bəy, Şirvanın böyükləri və əyan ilə bərabər, Şahrux Mirzəni şahın hüzuruna gətirdilər. Qala və xəzinələrin açarlarını təslim etdilər. Gülüstan qalabəyisi də hüzura gəlib qalanı təslim etdi. Vəkil Hüseyn bəy, Şirvanın bir çox əyanları ilə bərabər öldürüldü.

Bir il sonra Şahrux Mirzə də vəfat etdi. Şirvan hökuməti şahzadə Əlqas Mirzəyə tapşırıldı. Əlqas Mirzə Şirvanda 9 il müstəqil hökmranlıq sürdü. Axırda əzəməti, mənsəbi və qoşununun çoxluğuna güvənərək öz vəlineməti və böyük qardaşı olan padişaha asi oldu...

Bu hadisənin təfsilatı belədir: Əlqas Mirzə, azğınlıq havasilə qardaşının rəyinə müxalif işlər görüb gündən-günə üsyan və müxalifətini artırırdı. Axırda, Şah Təhmasib onun fitnəsini dəf etmək üçün Şirvana hərəkət etdi. Əlqas Mirzə qəflət yuxusundan oyanıb, öz keçmiş hərəkətlərindən peşman oldu. Bağışlanmaq üçün anasını və oğlu Əhməd Mirzəni şahın hüzuruna göndərdi. Üzr istəyib qəliz andlara həmişəlik ixlas və itaətə söz verdi. Şah özü Gürcüstana yola düşüb, onu çərkəzlərə qarşı cəhada göndərdi. Lakin, Əlqas Mirzə xütbəni öz adına oxudub və sikkəni öz adına vurdurmuş olduğundan, Şah Təhmasib Gürcüstandan qayıtdıqdan sonra,

İbrahim xan Zülqədəri, Göycə Sultan Qacarı və Şahverdi xan Ziyad oğlunu bir dəstə qoşunla basqın üsulilə Şirvanı almağa göndərdi. Bu zaman Əlqas Mirzə hələ Çərkəzistanda idi. Onun ordu başçısı və inanılmış adamı olan Mihtər Dövlətyar onun ailəsini və köçünü götürüb Gülüstan qalasına çəkildi. Şahın əmirləri Şirvan vilayətini alıb, Gülüstan qalasını mühasirə etdilər. Əlqas Mirzə bu xəbəri eşidincə, qayıdıb Dərbəndə gəldi. Əmirlərin üzərinə iki dəfə qoşun göndərdisə də, məğlub edildi. Şah Təhmasib əmirlərin köməyinə yeni qüvvə göndərdi, özü də onların ardınca yola düşdü. Əmirlər Əlqas Mirzənin üzərinə yürüş etdilər. O, şah ordusu və əmirlərinin gəlməsi xəbərini eşidib, qorxuya düşərək Xınalıq tərəfinə qaçdı. Onun adamları dəstə-dəstə dağılmağa başladılar. Əmirlər Samur çayı kənarında ona yetişdilər. Lakin o bir çox çətinliklər çəkərək, 40-50 nəfərlə Dağıstana, Ğrim Şamxalın yanına getdi. Buradan Kəfəyə (Feodosiyaya), oradan da, İstanbula yola düşdü. Dərbənd və Gülüstan qalaları bir müddət onun məmurlarının əlində idi. Bu qalalar alındıqdan sonra, Mihtər Dövlətlər bir neçə nəfərlə öldürüldü. Şah Təhmasib Şirvan vilayətini öz oğlu İsmayıl Mirzəyə verib, Göycə Sultan Qacarı da onun xidmətində qoyaraq geri qayıtdı.

Bu zaman, Şirvan sultanları nəslindən Bürhan Mirzə adlı bir nəfər Qaytaq camaatının arasında olurdu. Onun tərəfindən verilmiş hökm və fərmanlar üzərində olan möhürün mətni belədir: Bürhənli ibni-Keyqubad ibni-Əbabəkr ibni Əmir İshaq ibni-Şeyx İbrahim. Bu adam hicri 954-cü (=1547) ildə Şirvana gəlib Qülhanda sakin oldu. Qoşun əhlindən bəzisi onun başına toplanıb, meşə və cəngəlliklər arasında müharibəyə hazırlandılar. İsmayıl Mirzə və Göycə Sultan çoxlu qoşunla onu dəf etməyə getdilər. Çarxçılar ilə Bürhan Mirzənin adamları arasında şiddətli müharibə oldu. Şahzadənin ordusu yetişincə, Şirvan qoşunu basıldı və onlardan bir çoxu öldürüldü. Bürhan Mirzə Dağıstana qaçdı.

Əlqas Mirzə Ruma gedib Sultan Süleymanı İran səfərinə tərğib etdi. O, üçüncü dəfə hicri 955-ci (=1548) ildə saysız qoşun, topxana və bir çox təchizatla İran üzərinə hərəkət etdi. Şah Təhmasib tam bir hazırlıqla qarşıya çıxdı. İsmayıl Mirzə və Göycə Sultan da, onun əmrinə görə, Şirvan qoşunu ilə bərabər bu müharibədə iştirak edirdilər. Xülasə, bir çox müharibələrdən sonra, Sultan Süleyman Ruma qayıtdı. Əlqas Mirzə də İraqa və Farsa gedib iğtişaş qaldırmağa başladı. Buradan da Bağdada gəldi. Axırda tutulub, qardaşının hökmü ilə Qəhqəhə qalasında dustaq oldu. Ömrünün axırlarında Məşhədi-müqəddəsə gedib orada vəfat etdi. Gözəl təbi vardı...

İsmayıl Mirzə və Göycə Sultan Şirvandan uzaqlaşınca Bürhan Mirzə vilayəti boş görüb Şamaxıya gəldi və hökumət bayrağını qaldırdıqdan bir neçə gün sonra vəfat etdi.

Hicri 956-cı (=1549) ildə Şirvan hökuməti Şah İsmayılın bacısı oğlu və damadı Abdulla xan Ustacalı ibni -Xan Məhəmmədə tapşırıldı. Şirvanlılar Bürhan Mirzəyə bir neçə gün itaət etdiklərindən, Abdulla xandan qorxuya düşdülər və ittifaq edib Bürhan Mirzənin qohumlarından Mihrab adlı bir nəfəri özlərinə

hökmran seçdilər. Abdulla xan onları dəf etməyə getdi. Şirvanlılar məğlub edildi və bir çoxları öldürüldü. Mihrab Mirzə də qaçdı və başına nə gəldiyi məlum olmadı.

Şirvanlılar ikinci dəfə yenə iğtişaşa başladılar: Mihrab Mirzənin qohumlarından Qurbanəli adlı bir nəfəri hökmdar seçib, Xəzər dənizi adalarından birinə sığındılar. Abdulla xan nəsihət yolu ilə nə qədər məktub yazdısa da, bir fayda vermədi. Axırda onların üzərinə yeridi. Qızılbaş qoşunu suyun ortasında (adada) müharibə atəşini alovlandırdı, adanı alıb Qurbanəli Mirzəni, o tayfadan bir çoxları ilə bərabər qətlə yetirdi. Çoxlu mal ələ keçirdilər. Bu hadisədən sonra bir neçə il asayişlə keçdi.

Şah Təhmasibin bu ölkədəki fütuhatından biri də Şəkinin alınması idi. Bu hadisənin təfsilatı belədir: Şirvanşahlar xanədanına mənsub və ata-babadan Şəki hakimi olan Hüseyn bəy, gürcülərin təcavüzündən Şah İsmayıla pənah aparıb, həmişə ondan iltifat və köməklik görürdü. Şah İsmayıl vəfat edən ili, Kaxet hakimi Ləvənd xan Şəkinin üzərinə gəldi. Hüseyn bəy müharibədə öldürüldü. Şəkinin böyükləri, onun oğlu Dərviş Məhəmməd xanı hakim seçdilər. O, atasının ziddinə olaraq İran dövləti ilə çəkişməyə başladı. Yuxarıda söyləndiyi kimi, Şahrux Mirzənin müharibəsində qızılbaş qoşununa şəbxun etdi. Buna görə, Şah Təhmasib özü hicri 958-ci (=1551) ildə Şəki ölkəsini almaq məqsədilə hərəkət etdi. Kaxet valisi gürcü Ləvənd xan itaət izhar edib, əmrə tabe olmaq məqsədilə Ərəş qəsəbəsində hüzurə gəldi və şahın nəvazişlərinə nail oldu. Şah tərəfindən Dərviş Məhəmməd xanın adına lütf və mərhəmət müjdəsi verən bir fərman sadir oldu. Lakin, o, yerinin möhkəmliyinə arxalanaraq, inad göstərməyə başladı. Şəki böyüklərindən bəzisi Kiş qalasına, Dərviş Məhəmməd xan özü isə, çox möhkəm və uca olan Gələsən-Görəsən qalasına çəkildi. Bir dəstə də Əlbürz dağının ətəyində möhkəm bir yeri özlərinə sığınaq edib vuruşa hazır oldular. Qorçibaşı sevindik bəy, Bədir xan və Şahqulu Sultan Ustacallı, bir dəstə qoşunla Kiş qalasını almağa, Kaxet valisi Ləvənd xan və Şirvan hakimi Abdulla xan Gələsən-Görəsən qalası üzərinə, Möhürdar Şahqulu xəlifə də başqa bir dəstə ilə dağ ətəyindəki sığınağı almağa təyin edildilər. Əmirlər mühasirə və qalanı almaq işlərilə məşğul olub, topların zərbilə hasar və qalanın burclarını dağıtdılar. Bu halı görən Kiş qalabəyisi, qılınc və kəfən ilə şahın dərgahına gəldi, qalanın açarlarını təslim edərək, təltif edildi. Hökm və fərmana görə, qalanı dağıdıb hasar və burclarını yer ilə yeksan etdilər. Bundan sonra, şahın ordusu dağ ətəyindəki sığınaq tərəfinə hərəkət etdi. Buranın sakinləri də şahın əzəmətindən qorxuya düşüb əfv və aman istədilər. Dərviş Məhəmməd xan öz əməlindən peşman olub, bir gecə Gələsən-Görəsən qalasından çıxıb qaçdı. İşin tərsliyindən onun yolu Ləvənd xan və Abdulla xan ordusunun yanından düşdü. Bu qoşundan bir dəstə Dərviş Məhəmməd xanı təqib edərək ona yetişdi. O, yanında olan 400 nəfərlə müdafiəyə başladı. Adamlarının hamısı öldürüldü. Dərviş Məhəmməd xan özü, Çərəndab Sultan Şamlının mülazimi Kosa Pirqulu ilə olan əlbəyaxa oldu. Kosa qalib gələrək, onun rəyasət havası ilə

dolu olan başını öz padişahının ayağı altına, torpaq üzərinə atdı. Şəki ölkəsi tamamilə, şahın qüvvət və qüdrət sahibi olan dövlət başçılarının hakimiyyəti altına keçdi.

Hicri 961-ci (=1554) ildə Sultan Süleyman dördüncü dəfə olaraq Azərbaycana qoşun çəkdi. Şirvan hakimləri nəslindən, onun dərgahına pənah gətirmiş olan Qasım Mirzəni, Krımın Kəfə (Feodosiya) yolundan qoşunla Şirvana göndərdi. Qasım Mirzə Dərbəndi keçəndən sonra, şirvanlılar yenə Abdulla xandan üz çevirib onun başına toplandılar. Abdulla xan qızılbaş qoşunu ilə onları dəf etməyə getdi. Çətin keçidli Təngə adlı bir yerdə iki qoşun qarşılaşdı. Abdulla xan məğlub olaraq Şamaxıya qayıtdı. Qasım Mirzə Beyqurd qalasına gəlib, müharibə tədarükü görməyə başladı. 10000 nəfər rumlu və şirvanlı ilə Abdulla xanın üzərinə yeridi. Qızılbaş ağsaqqalları, öz azlıqlarından və düşmənin çoxluğundan qorxuya düşüb, xüsusunda tərəddüddə idilər. Lakin Abdulla xan başında olan iki min nəfərlə, müharibəyə qərar verib, Gülüstan qalası yaxınlığında düşmənlə üz-üzə gəldi. Müharibə atəşi bütün gün alovlandı. Axşam çağı Şirvan qoşunu basıldı. Onların çoxu öldürüldü, yerdə qalanları isə, Təbərsəran tərəfinə qaçdılar. Məlum olmadı ki, Qasım Mirzənin başına nə gəldi. Abdulla xan o ölkədə əzəmət və iqtidar bayrağını daha da ucaltdı. O, müxalifətdə olanlara daha cəza vermirdi, rəiyyətlərə mehribanlıq və iltifat göstərirdi. Kimsənin qüdrəti yoxdu ki, ona qarşı müxalifət göstərsin. Dövlət işlərini intizama salmaqdan əlavə, ticarət işlərini də genişləndirmək üçün artıq dərəcədə çalışırdı. Şamaxıda ingilis ticarətxanası onun himayəsi altında təsis edilmişdi. Hicri 969-cu (=1561) ildə, ingilis Cenkinson bu ölkədən Avropaya qayıtdığı zaman, Abdulla xan onunla bərabər, bəzi işlərdən ötrü, rus padişahı İvan Vasilyeviç (Qroznının) hüzuruna elçi göndərmişdi. 17 il davam edən hökmranlıqdan sonra, hicri 973-cü (=1566) ildə, vəfat etdi. Sonra Şirvan əyaləti rumlu Aras xana tapşırıldı və bir neçə müddət onun əlində qaldı.

Şah Təhmasib 54 il səltənət sürdükdən sonra hicri 984-cü (=1576) ildə vəfat etdi. O, ədalətli və çox iqtidarlı bir padişah idi. Şah Təhmasib cavanlığında bəzi əyləncə və qanunsuz işlərlə məşğul olmuşsa da, lakin rəiyyət və ordu işlərini nizama salmaq xüsusunda heç bir şey əsirgəməmişdir. Gözəl bir təbi-şerə və səliqəyə malik idi. «Qəti surətdə tövbə etdim» tərkibi onun tövbəsidir...

Şah Təhmasibdən sonra, oğlu II Şah İsmayıl taxta oturdu. Bir ilə yaxın hökumət işlərilə məşğul oldu. Ata-babasının qanunlarına zidd olaraq, dövlət və millət işlərini yeni əsaslar üzrə qurmaq istəyirdi...

II Şah İsmayıl... çox qan tökən və qohum-qardaş gözləməyən bir şəxs idi. Buna görə, həyat və hökmranlığından bir xeyir görməyib, zəhərlənərək vəfat etmişdir...

Onlardan sonra böyük bir qardaşı Sultan Məhəmməd Xudabəndə taxta oturdu. Aras xan, keçmişdə olduğu kimi, Şirvan vilayətində öz vəzifəsində qaldı. Təkəli Bardoğdu xəlifəyə, Şamlı və sair tayfaların əmirlərindən bir neçəsinə Şirvanda torpaq verildi. Vali Ləvənd xanın oğlu İsa xan, Şah İsmayılın oğlu Sam

Mirzənin qızını alıb, Şəkiyə hakim təyin olundu. Sultan Məhəmməd Xudabəndə dünya işlərindən bixəbər və xudapərəst idi. İradəsinin üstünlüyü və hesabsız ənamlar verməsi üzündən xəzinə boşalmışdı. Qadınlar da hökumət işlərinə müdaxilə edirdilər. Əmirlər və oymaqlar arasında ikitirəklik düşmüşdü. Bunların nəticəsində dövlətin bünövrəsinə və onun istiqlaliyyətinə rəxnə düşdü. Dostlar məəttəl qalıb, düşmənlər isə cəsarətlə mübarizəyə girişdilər. O cümlədən Şirvan əhalisi iğtişaş fikrinə düşdü. Onlar, Çərkəzistan və Dağıstan ölkələrində pərişan bir halda dolana və yuxarıda adı çəkilən Əbubəkr Mirzə ibni-Bürhan Mirzəni Şirvana dəvət etdilər. Şirvan qoşunundan qalan iki-üç min ləzgi və qarabörk onu başına toplaşıb iğtişaşa başladılar. Əbubəkr Mirzə Osmanlı sultanının hüzuruna bir adam göndərib, onun himayəsi altına keçdiyini bildirdi və Şirvan ölkəsini almaq üçün ondan kömək istədi... Sultan Murad xan da Şirvan, Bakı və Azərbaycan vilayətlərini fəth etməyi qərara aldı. Bu fikirlə Lala paşa adı ilə şöhrət tapmış öz lələsi Mustafa paşanı hicri 986-cı (=1578) ildə 100000-dən artıq qoşunla bu vilayətləri almağa göndərdi.

Mustafa paşa Axısqa hüdudunda, onu dəf etməyə gələn İrəvan və Qarabağ bəylərbəylərini məğlub etdi. Gürcüstana gəlib Tiflis qalasını aldı və Şirvana doğru hərəkət etdi. İsa xan Şəkidə qala bilməyib özünü bir guşəyə çəkdi. Lala paşa arxayınlıqla Şirvana gəldi. Dağıstan əmirləri və ləzgi tayfaları ona kömək edirdilər; Şirvan əhalisi də onun itaətində idi. Ağıllı və işbilən Şirvan bəylərbəyisi Aras xan, qalanı müdafiə etməyə özündə iqtidar görməyib, köç-külfəti və tərəfdarları ilə bərabər köçüb Kür çayının kənarında yerləşdi.

Lala paşa Osman paşanı Şirvana bəylərbəyi təyin edib, Qaytas paşanı da Ərəşdə hakim qoydu. Hər vilayətə bir hakim təyin edib Şamaxı, Ərəş və Bakı qalalarını möhkəmləndirdi. Rum ordusuna kömək etmək üçün Əbubəkr Mirzəni Şirvanda qoydu. Şirvan vilayətinin ona verilməsi haqqında Xandigardan xahiş edəcəyini ona vədə verdi. Özü isə, müharibə edə-edə Gürcüstan yolu ilə Rum ölkəsinə qayıtdı.

İran tərəfindən də, dövlət başçılarının məsləhətilə, Sultan Məhəmmədin böyük oğlu və Vəliəhdi Həmzə Mirzənin Azərbaycana və Şirvana hərəkət etməsi lazım görüldü. Şahzadənin ordusu Qarabağa yetişdikdə, Kürün Muğan tərəfində yerləşmiş olan Aras xan və Şirvan əmirləri səy etdilər ki, şahzadə gəlincəyə qədər Şamaxının üzərinə yürüyüb rumlularla vuruşsunlar; bəlkə başqalarının köməyi olmadan Şirvanı ələ keçirsinlər. Bu məqsədlə başlarındakı cəmiyyətlə Şamaxı üzərinə yürüdülər.

Lala paşa Şirvan səfərinə təyin olunduğu zaman Xandigar tərəfindən Cici ibni-Çingiz xan nəslindən olan Krım valisi Məhəmməd Gəray xana təklif edilmişdi ki, tatar qoşunu ilə Dərbənd yolundan Şirvana hərəkət etsin. Buna görə, qardaşı Adil Gəray Sultan 20000 tatar qoşunu ilə bu ölkəyə hərəkət etmişdi. Osman paşa onun gələcəyi günü bildiyindən, şəhərdən çıxıb, düşmənə qarşı döyüşə hazırlandı. Aras xan və əmirlər də, səflərini düzəldib, müharibəyə girişdilər. Bu zaman tatar

qoşununun padişahları görünüb, dağları və çölləri tutdular, qızılbaş qoşunu bu halı görüb qorxuya düşdü, vuruşa-vuruşa qayıtmaq istədi. Lakin Rum, Tatar, Ləzgi və Şirvanın Qarabörk tayfası onları araya aldılar. Aras xan bir çox əmirlər və əsgərlərlə bərabər öldürüldü. Qılınc ağacından qurtaranlar yarımcan aradan çıxdılar və Kür çayından keçincəyə qədər atlarının cilovunu çəkmədilər.

Bu hadisədən sonra, Osman paşa Şamaxıya gəldi. Adil Gəray Sultan və Əbubəkr Mirzə, Aras xanın ordusunu qarət etmək qəsdilə, Kür çayı kənarına hərəkət etdilər. Həmzə Mirzə bu xəbəri aldıqda Talış əmirlərinə və o ətrafdakı əhaliyə əmr verdi ki, ordusu gəlincəyə qədər, Kür çayı kənarlarını və Aras xan ordusunu qorusunlar. Məmurlar, tatar və ləzgi qoşunu yetişdikdə, qızılbaş yaralılarını keçirmək üçün mühafizə etdikləri körpünü dağıtdılar. Lakin buna baxmayaraq onların bir hissəsi özlərini suya vurub keçdilər, şiddətli müharibə başladı. Bu əsnada məlum oldu ki, onların başqa bir hissəsi də, şirvanlıların bələdçiliyi ilə çayı ayrı bir yerdən keçib qızılbaş əsgərlərinin arxasını tutmuşdur. Buna görə İran qoşunu məğlub oldu, canını qurtarmaq üçün hərə bir tərəfə üz qoydu. Tatar və ləzgi əsgərləri, köçməkdə olan ordunun başı üstünü aldılar. Ordu dağıldı, qadınlar və uşaqlar bir neçə ildən bəri toplanılan külli mal və təchizatla bərabər onların əlinə keçdi. Onlar həmin gün çayı keçib Şirvan tərəfinə qayıtdılar.

Lakin bu əsnada İran vəziri Mirzə Səlman, qızılbaş əmirləri və əsgərləri ilə Qarabağın Qaraköpək (ona Təxti-Tavus da deyirlər) adlı yerindən sürətlə hərəkət edərək, Qoyun-Ulamidən keçib, Şamaxı qalasını mühasirəyə almışdı. O, tatar və ləzgi qoşununun qayıtmasından xəbərdar olduqda, qalanın yanında bir dəstə əsgər qoyub özü onların qarşısına çıxdı.

Adil Gəray Sultan, əhvalatdan xəbərdar olmaqla bərabər, qızılbaş döyüşlərində göstərdiyi şücaətə görə onları saymayıb, Osman paşaya kömək etmək üçün Şamaxıya gedirdi. Ağsu çayı kənarında, Molla Həsən yurdunda iki dəstə üz-üzə gəldi. Adil Gəray Sultan yanında olan 12000 tatar, 4 və ya 5 min ləzgi və qarabörk ilə cəsarətlə döyüşə hazırlandı. Qızılbaş qoşununun çarxçısı Əmir Həmzə xan Ustacallı, bir dəstə ilə irəlilədi, vuruşma qızışdı. Şamaxı qalasını mühafizəyə təyin edilən dəstə də tatarlar ilə vuruşmanı o işdən yaxşı bilib, əmirlərdən icazəsiz müharibə meydanında hazır oldular. Tatar qoşunları, qızılbaşların ardı-arası kəsilməyən hücumlarına baxmayaraq, səba göstərib səhərdən axşama qədər cəsarət və mərdanəliklə vuruşurdular. Axırda, Adil Gəray Sultan öz qoşununda zəiflik nişanələri gördü. Onları cəsarətləndirmək üçün özü döyüş meydanına girdi. Vuruş zamanında Baba xəlifə onu nizə zərbəsilə yerə sərdi. Adil Gəray Sultan, ad və sanını bildirərək, ölümdən xilas olub əsir düşdü.

Bu hadisədən sonra, Tatar tayfası qaçmağa başladı. Bir çoxları qırıldı, sağ qalanlar da dağlara və meşələrə dağıldılar. Aras xan ordusunun malları, əsirləri və toxunulmamış yüklü dəvə qatarları yenə dəvə qatarlar yenə qaliblərin əlinə keçdi.

Osman paşa köməkdən məyus olunca, Şamaxı qalasını buraxıb Dərbənd tərəfinə getməkdən başqa bir çarə tapmadı. Onu təqib etmək üçün göndərilən bir

dəstə, Şabrana qədər gedib, onun topxana və ələhəsindən bir qədərini qənimət alaraq qayıtdılar. Osman paşa Dağıstan xalqının köməkliyilə Dərbəndə gəlib dayandı. Mirzə Səlman və əmirlər, Şirvanı mühafizə etmək üçün bir dəstə əsgər təyin edib, geri qayıtdılar.

Adil Gəray Sultanı, əvvələr çox ehtiramla padişahlıq imarətində saxlayırdılar. Axırda, əmirlər və dövlət başçıları, qalalardan birinə getməyi ona təklif etdilər. O isə buna razı olmayıb müqavimət göstərmək istədi və əlbəyaxa vuruşmasında öldürüldü.

İran dövlətinin Adil Gəray Sultan ilə gözəl rəftar etməsi xəbəri Krıma yetişdikdən sonra anası, Krım xanı tərəfindən göndərilən məktub və bir çox hədiyyələrlə İrana hərəkət etdi. Şamxal mülkünün Kafir Qumuq kəndində, oğlunun ölüm xəbəri ona çatdı. O yerin əhalisi mala tamah edərək, Adil Gəray Sultanın anasına çox əziyyət verdilər, nəyi vardısa hamısını qarət etdilər. Bu hadisədən sonra o, qadın, onları Kafir Qumuq deyə adlandırdı. Bu ad indi də qalır. Özü də orada vəfat etmişdir. Qəbri kəndin kənarında bir təpə üzərində Tatarsin adı ilə mövcuddur.

Şirvan əyaləti şah tərəfindən Zülqədər Məhəmmədqulu xəlifəyə tapşırıldı. Bundan əlavə hər bir nahiyəyə xüsusi bir əmir təyin edildi. Osman paşa və Dağıstan hakimləri tərəfindən himayə edilən Şəki və Şabran əhalisi, Əbubəkr Mirzənin başına toplanaraq qızılbaş əmirlərini Şirvanda rahat və asüdə qoymurdular. Lala paşa da Ərzrumda gələcək il üçün səfər tədarükü ilə məşğul idi. Buna görə, şahın ordusu paytaxt olan Qəzvindən Təbrizə köçdü. Bu zaman, Məhəmmədqulu xəlifədən bir məktub yetişdi. Bu məktubda deyilirdi: Adil Gəray Sultanın qardaşları Qazi Gəray Sultan və Səfi Gəray Sultan tatar qoşunu ilə Dərbəndə varid olmuşdular. Bunlar ya Xandigarın fərmanı üzrə, ya da qardaşlarının intiqamını almaq üçün gəlirlər. Buna görə qərara alındı ki, Mirzə Səlman qoşun əmirləri və əyanları ilə Şirvana hərəkət etsin. Bunlar hələ Qarabağa çatmamışdılar ki, Qazi Gəray Sultan külli qoşunla Şirvana yola düşdü. Məhəmmədqulu xəlifə onları qarşıladı, Samur çayı kənarında, iki qoşun üz-üzə gəlib aralarında şiddətli müharibə oldu. Məhəmmədqulu xəlifə, qoşun əhlindən bir çoxu ilə bərabər öldürüldü. Sağ qalanlar qaçıb Şirvandan getdilər. Bunların malları və əhli-əyalları, bir dəqiqə qətl-qarətdən əl çəkməyən tatarların əlinə keçdi. Qənimətin çoxluğundan yükləri ağırlaşan bir dəstə tatar qoşunu, qızılbaş qoşununun gəlməsini eşidərək geri qayıtdı. Qazi Gəray və Səfi Gəray, Osman paşaya kömək etmək üçün, bir dəstə qoşunla Dağıstanda qaldılar. Bu hadisələrin qurbanı olan Şirvan əhalisinin bir hissəsi Osman paşanın yanına qayıtdı, bəzisi də Şəkinin Xaçmaz adlı yerində Əbubəkr Mirzənin başına toplandı. Mirzə Səlman, əmirlər və qoşunla Şirvana gəldisə də heç bir iş görə bilmədi. Xaçmaza, Əbubəkr Mirzənin üstünə göndərdiyi dəstə də məqsədə çatmadan geri qayıtdı. Xülasə, vilayət xaraba qalmışdı.

O il Qarabağ, Azərbaycan və Gilanda taxıl qıtlığı tam mənasilə hökm sürməkdə idi. Başlıca maniələrdən biri də əmirlər arasında nifaq və intizamsızlıq idi. Bu səbəblərə görə Mirzə Səlman Şirvanı boş buraxıb Təbrizə qayıtdı. Səfər tədarükü üçün ətrafa fərmanlar göndərdi. Şahın ordusu üçün İşkənbər və Kələnbər - yaylaq, Qarabağ isə -qışlaq təyin olundu. Səlman xanı Şirvan əyalətinə hakim, ustacallı əmirlərindən bir neçəsini də oranın nahiyələrinə əmir göndərdilər. Bunlar da Arasbar yolu ilə Kür çayı kənarına gəldilər. Havanın istiliyindən dənizin iki ağaclığında qədim bir şəhər xarabası olan Həməşərədə dayandılar. Firdovsinin Şahnaməsində bu yer Əbərşəhrə adlanır. Burada qoşun toplamaq və səfər tədarükü görməklə məşğul oldular. Bu zaman, Qazi Gəray Sultan və Səfi Gəray Sultan çoxlu qoşunla Şirvana axın etdilər. Onlar qızılbaşların vəziyyətindən xəbər tutub, şirvanlıların bələdçiliyi ilə, Kür çayından keçdilər. Yağış və palçığın çoxluğundan, qızılbaş qoşununun bir-birindən xəbəri yox idi. Belə bir zamanda onların üstünə töküldülər. Onları göz açmağa qoymayıb, bir çoxlarını qırdılar, ordunun da var-yoxunu talan edərək, həmin gün yenə Şirvana qayıtdılar. Qızılbaş qoşunu çox pozğun bir halda özünü toplayıb, Qızılağac hüdudunda yerləşdi.

Osman paşa Şamaxıya gəlib rumluların bir dəstəsini Bakı qalasına göndərdi və bu möhkəm qalanı daha da möhkəmləndirdi. Mirzə Səlmanın İran qoşunu və əmirlərilə gəlməsi xəbəri Rum (osmanlı) və tatar camaatına çatdıqda müqavimət qəsdilə qarşıya çıxdılar. Molla Həsən yurdunda çarxçıların müharibəsi vaqe oldu. Onlar, qoşununun çoxluğunu və yaxşı təchiz olunduğunu nəzərə alaraq, özlərində müqavimət qüvvəsi görmədilər. Osman paşa Dərbəndə, tatar sultanları da Dağıstana qayıtdılar.

Bu zaman bəylərbəyi Səlman xan Şirvanın əmirlərilə bərabər Kürdən keçdilər. Tatarlardan gördükləri sınıqlığın əvəzini çıxarmaq üçün Bakı qalasını almağa səy və qeyrət etdilər. Əmir xan da, Şabrana aparmış olduğu qoşunla, Bakı qalasının üstünə gəldi. On səkkiz gün davam edən mühasirə heç bir nəticə vermədi. Azuqə və ələfin yoxluğuna görə burada dayanmaq çox çətin oldu. Əvvəllərdə, arpa unu Təbriz batmanı ilə, altı misqal sikkəli gümüş pula satılırdı. Axırlarda isə, əsla tapılmırdı. Qızılbaş qoşunu, Şirvanı boşaltmağa məcbur olub, Qarabağa gəldi. Hökumət başçıları və əmirlər belə məsləhət gördülər ki, Şirvanı mühafizəsi Qacar tayfasından, Otuz-iki oymağı və sairdən ibarət olan Qarabağ camaatına verilsin. Bunların idarəsi də Qarabağ bəylərbəyisi İmamqulu xan Ziyad oğlu Qacara tapşırılsın. O qəbul etmirsə də, yenə onun boynuna qoydular. Onun məsləhəti ilə Peykər Sultan Ziyad oğlu Qacarı, xan rütbəsilə Şirvan bəylərbəyisi təyin etdilər. Qacar əmirlərindən bir neçəsini də bu vilayətin nahiyələrinə təyin edib onunla bərabər Şamaxıya göndərdilər.

Qazi Gəray Sultan tatarlardan və osmanlılardan ibarət külli qoşunla ikinci dəfə Şirvana üz qoydu. Bu hadisədən əvvəl, İmamqulu xandan çoxlu kömək almış olan Peykər xan Qacar, Çəkərli, Qaramanlı və sair əmirlərilə qarşıya çıxdı, Şamaxı ilə Şabran arasında müharibə başlandı. Qazi Gəray Sultan qızılbaş müharibəsində

göstərdiyi hünərə görə, bunları o qədər saymırdı. Buna görə cəsarətlə meydana girdi. Vuruşma zamanı bir dəstə qacar arasına düşüb əsir oldu. Qoşunu Səfi Gəray Sultanla bərabər qaçdı.

Qazi Gəray Sultanı şahın ordusuna apardılar; sonra da Qəzvin ilə Gilan arasında olan məşhur qalalardan Əlmövt qalasına göndərdilər. Bir müddət burada qaldı, azad edildikdən sonra Ruma getdi. Hicri 997-ci (=1589) ildə, Xandigarın yardımı ilə Krım və Dəşt səltənəti ona çatdı. Deyirlər ki, igid, arif, şer həvəskarı və musiqişünas bir əmir idi.

Hicri 991-ci (=1583) ildə qızılbaşlardan bir dəstə, Şabran ətrafında İbrahim paşa tərəfindən tikdirilmiş olan qalanın üzərinə getməyə məmur oldu. İbrahim paşa məğlub olaraq qaçdı və qala da alınıb dağıdıldı. Ayrı bir dəstə də Qəbələ və Şəki üzərinə yürüyüb qətl və qarət işində heç şeydən çəkinmədi. Bu zaman Peykər xan xəstələnib vəfat etdi. Osmanlılar yenə yürüşə başladılar, şirvanlılar da üsyan etdilər. Şahlıq dərbarından qaradağlı Xəlifə Ənsar, Peykər xanın yerinə təyin edildi. O gəlib şirvanlıları cəzalandırdı. Üsyanda daha artıq fəaliyyət göstərən Quba əhalisinin yurdlarını və mallarını yandırıb qarət etdi. Özü də çox keçmədən vəfat etdi.

Osman paşa, yeni Rum qoşunu ilə Dərbəndə çatmış olan Cəfər paşa, Heydər paşa, Şəmsi bəy və Piyalə bəylə birlikdə qızılbaşların üzərinə yeridi. Samur çayı sahilində, Palasa adlı yerdə üz-üzə gəldilər. Qızılbaşlar məğlub oldu, onlardan bir çoxu İmamqulu xan və sair əmirlərlə bərabər öldürüldülər. Sağ qalanlar da İrana qayıtdılar.

Bu hadisələrdən sonra, həm də gələcək il şah ordusunun İraqa qayıtması ilə əlaqədar olaraq, Şirvanın vəziyyəti elə qarışdı ki, qızılbaş əmirlərindən heç biri burda dura bilmədi. Osman paşa Dərbənddən Şamaxıya gəlib qalanı möhkəmləndirdi, əyalət də müstəqil oldu. Hicri 993-cü (=1585) ildə, Cəfər paşa Dərbənddən gedib, əhalisi baş qaldırmış olan Kürə qalasını aldı və qarət etdi.

Hicri 996-cı (=1588) ildə Sultan Məhəmməd Qarabağ Gəcəsindən İraqa hərəkət etdi. Birinci mənzildə, Əbuşəhmə adlı yerdə, böyük oğlu və vəliəhdi Həmzə, gecə öz dəlləyi Xudaverdi tərəfindən öldürüldü. Bu hadisədən sonra, sərəskər Fərhad paşa, ona müqavimət göstərə bilməyən Kartli valisi Simon xanın icazəsilə Qarabağa gəldi. Gəncə qalasını bina edərək Təbrizi və Azərbaycanın bir çox şəhərlərini ələ keçirdi. Ancaq Ərdəbilin ətrafı qızılbaşların əlində qaldı. Beləliklə, türklər 20 il müharibəsiz bütün vilayətlərin üzərində hökmran oldular. (Həmzə Mirzə öldürüldükdən sonra) Sultan Məhəmməd Xudabəndə həmin il iş başından çəkilib, səltənəti oğlu Şah Abbasa tərk etdi. O da bir neçə il dövlət işlərini islah etmək, qoşunu nizama salmaq və rəiyyətin vəziyyətini yoluna qoymaqla məşğul oldu. Beləliklə, itaətsizliyi və çəkişməni əmirlərin və oymaqların arasından qaldırdı.

Bu zaman Şirvan və Dağıstanın işləri çox abad bir halda idi. Lahıcan hakimi Mirzə Əli Karkiyanın qardaşı oğlu Xan Əhməd xan bütün Gilanı ələ keçirmişdi. O,

hicri 975-ci (=1568) ildə, Qəhqəhə və İstəxr qalalarında 12 ildən bəri məhbus idi. Sultan Məhəmməd Xudabəndə zamanında yenə keçmiş hakimlik mənsəbinə təyin edilmişdi. Xan Əhməd xan (Şah Abbasa qarşı) üsyan etdi. Lakin qızılbaş qoşunu gəldikdə, Gilan valisi Məhəmmədəmin xan Cəmşid xan oğlu ilə bir yerdə, hicri 1000-ci (=1592) ildə, gəmiyə minib Şirvana qaçmağa məcbur oldu. Vəzirini yardım almaq üçün Rum sultanı Xandigarın dərgahına göndərdi. Xandigar tərəfindən, bunların Qostəntiniyyəyə fərmanı sadir oldu. Şirvan valisi mehmandarlığa təyin olundu. Məmmədəmin xan Gəncədə vəfat etdi. Xan Əhməd xan onun (vəfatı haqqında) yazdığı mərsiyədə deyir:

Ruzigarın gərdişindən və fələklərin zülmündən
Ürəyimiz məhzun, ruhumuz qəmgindir.
Ey gözüm, yaş əvəzinə qan axıt ki, biz
Nadir bir xəzinəni Gəncədə torpağa basdırdıq.

Özü də Ruma gedib, axırda Nəcəfi-Əşrəfdə vəfat etdi. Sonrakı il İran dövləti ilə çəkişməkdə olan Astara hakimi Əmir Həmzə xan Talış, mühasirə şiddətindən cana gəlib aman istədi. Şirvana getmək üçün ona izn verildi. Burada bir müddət Rum dövlətinin ənam və nəvazişinə nail oldu. Lakin bir az keçəndən sonra, xain mülazimlərindən iki nəfər onu ovlaqda öldürdü. Ailəsi də vətənə qayıtdı.

Bir neçə vaxtdan sonra Əbubəkr Mirzə ibni-Bürhan Mirzə, öz oğlu Bürhanəli Mirzəni şahın dərbarına göndərib İran dövlətinin himayəsi altına girmək istədi. O, osmanlılardan üz çevirmiş və iğtişaş vəsaitini hazırlamaqla Şirvan vilayətini almaq fikrində idi. Hicri 1010-cu (=1602) ildə, şəkili Şahmur xan ilə birlikdə Kürə, Təbərsəran və sair dağlıq yerlərdən qoşun toplayıb, Axtı və Miskincəni dağıtdı. Lakin, Ağbil ətrafında, Palasa adlı yerdə, o zaman Şirvan valisi olan Əhməd paşa ilə vuruşub məğlub oldu. Rumlular (türklər) Quba xalqından bir çoxunu öldürdülər. Quba və Müskür mahallarını qarət edərək, Qusar kəndində qala tikdirib mühafiz qoydular. Şahmir xan Şəkidə qala bilməyib İrana getdi. Lakin məlum olmadı ki, Əbubəkr Mirzənin axırı nə oldu.

Dağıstan işləri elə qarışıq bir halda idi ki, Çoban Şamxal Qaytaq, Kürə, Avar və Çərkəz hüdudundan Terek çayına və Xəzər dənizinə qədər hökmran idi. O, hicri 982-ci (=1574) ildə Buynaqda vəfat etdi. Onun oğlanlarından: Eldar Buynaq və Tarxuda; Məhəmməd Qazanışda; Andiya Kafir Qumuqda və Gəray Hilidə hakim oldular. Lakin, bundan sonra, bu dörd xanədana mənsub olan şamxallar yaşlarına və kamallarına görə, bütün ölkəyə hökmran olurdular. Hicri 1187-ci (=1773) ildən isə, şamxallıq Buynaq əmiri xanədanına keçmişdir.

Xülasə, Sultan Əhməd Üsminin qızından olan bu dörd nəfər, Uzun Çərkəsin qızından olan öz qardaşları Sultan Budu çankə[65] hesab edərək, ona ölkədən hissə vermədilər. O da qədim Əhran şəhərinin yeri olan Çilyurda gəldi. Burada sakin olan üç nəfər əndəbili qatil ilə Çərkəzistana getdi. Çoxlu qoşunla geri qayıtdı, qardaşları naçar qalıb barışdılar. Sulaq və Terek çaylarının arasındakı yerləri, Mıçıqıçın və Salatavın aşağı qismi ilə Günbətin sərhəddi olan Qərxi dağına qədər bütün ərazini ona hissə verdilər. O, Qumuq tayfasını öz başına toplayıb Çilyurdda yerləşdi.

Sultan Əhməd Üsmi ibni-Həsənəli Üsmi cəsarətli, ağıllı və iqtidarlı bir əmir idi. Hicri 996-cı (=1588) ildə, Qaytağın altı əmirliyini öz oğlu Xan Məhəmməd Üsmiyə tərk edərək vəfat etdi. Ondan dörd böyük iş yadigar qaldı:

1) Əhalinin məşvərət üçün topladığı boş bir yerdə Məcalis kəndini bina etdi.

2) Dağıstanda indi də işlənməkdə olan bəy və çankə kəlmələri arasındakı təfavütü müəyyənləşdirdi: bu qanuna görə, əmir qızından olmayan əmirzadə, əmirliyə yaramaz.

3) Mülki işlərə dair bir qanun yazdı ki, indi də Həpşi mahalı qazisinin yanında mövcuddur, xalq çox vaxt o qanuna müraciət edir.

4) Ürcəmil və Başlı əhalisinə mənsub olan boş yerləri, tərəkəmə mahalı təyin etdi. Əhali əkinçiliklə məşğul olub əldə etdikləri məhsuldan Üsmiyə cüzi bir vergi verirdilər. Bir zaman Üsminin oğlu vergi toplamaq üçün oraya getmişdi, Ürcəmil əhalisi onu təhqir etmişdilər. O da, guya atasından icazəsiz gedib, öz bacısı oğlu Şamxaldan qoşun alıb gətirdi. O mahalın böyüklərindən bəzisini öldürdü. Bir az zamandan sonra Üsmi özü, başlarında üsyan havası olan sair böyükləri də bir bəhanə ilə toplayıb öldürdü. O zaman Şirvan tərəkəmə tayfalarından bir qismi iğtişaş şərrindən özlərinə asudə bir yer axtarırdılar. Sultan Əhməd Üsmi, bunların bir qismini gətirib tərəkəmə mahalı kəndlərinin binasını qoydu və onları öz sülaləsi üçün rəiyyət və təbəə qərar verdi.

Dağıstan işlərinin belə qarma-qarışıq bir zamanında, hicri 1002-ci (=1594) ildə, rus padişahı Fyodor İvanoviç Dağıstana 3000 qoşun göndərib Sulaq çayı kənarında Qoysu adlı bir şəhər saldırdı. O, Tarxu yaxınlığında da ikinci bir şəhər bina etmək istəyirdi. Çoban Şamxalın oğlanları Çərkəs, Qumuq və Dağıstan tayfalarını toplayıb, ona mane oldular. Boris Fyodoroviç Qodunov Rusiya taxtına oturunca, Dağıstanda öz hakimiyyətini möhkəmləndirmək üçün üç qala bina etdirdi: birincisi - həmin əvvəlki yerdə, Tarxunun yaxınlığında, ikincisi - İndiri kəndində və üçüncüsü də indi məlum olmayan başqa bir yerdə. Bu qalaların üçündə də mühafizlər qoydu və onların üzərində Buturlini sərkərdə təyin etdi.

Bir müddətdən sonra, hicri 1012-ci (=1604) ildə, Sultan Bud Çərkəzistandan 13000 əsgər gətirib qardaşı Gəray xan Şamxal və Krım tatarlarının

[65] Çankə - rəiyyət qızından olan əmirzadəyə deyilir.

yardımı ilə hər üç qala üzərinə hücum etdi. Qala mühafizləri çoxlu vuruşmadan sonra, düşmənin vermiş olduğu sözə görə, öz vətənlərinə qayıtmaqdan başqa çarə görmədilər. Lakin, verilən əhdin xilafına olaraq, onları əsir etmək istədikdə, ruslar müdafiəyə başlayaraq tamamilə qırılıb məhv oldular. Qoysunun mühafizləri də şəhəri yandırıb öz vətənlərinə yola düşdülər.

Sultan Bud öz tayfası ilə gəlib İndiri kəndində sakin oldu. Bütün Qumuq əmirləri, onun oğlanları Aytəmur və Qazanalb nəslindəndirlər. Başqa xalqlara qarışmış olan Qumuq tayfası da bunların nəslindəndir. İndi 5000-ə yaxın ailədən ibarət olub İndiri, Yaxsay, Küstək, Qazi-Yurd və sair kəndlərdə yaşayırlar. Qum-Turxalı ilə Teymur-Quyu arasında, Qoysunun sağ tərəfində sakin olan qədim Tumanlar tayfasının da çayları və əkin yerləri var idi. Bunlar öz xüsusi əmirlərinin nəsli kəsildikdən sonra, gedib Qazanalb Sultan Bud oğlu övladına tabe oldular. İndi onlar İndiri kəndinin bir məhəlləsini təşkil edirlər.

İndiri əmirləri, öz nəsillərini Avar xanlarına nisbət verən Günbət və Arqunay mahalı əmirlərindən iki nəfəri öldürdülər. Bir çox vuruşmadan sonra barışıq oldu. İndiri-əmirləri Çəçən Tala, Gərmənçuq, Şalı, Ataqa və sairdən ibarət olan Mıçıqıçın aşağı hissəsini, ölənlərin qan bahası olaraq, varisləri Terlav adlı şəxsə verdilər. Terlav Nəşşaqdan bir qədər əhali gətirib, bu yerləri abad etməyə başladı.

Mıçıqaç adlanan bu ölkə, öz adını Mıçıqıç çayından almışdır. Mıçıqıç, Mıçıq içi deməkdir. Özü də üç yerə ayrılır: dağlıq, meşəlik və çöllük... Meşəlik və çöllükdən ibarət olan Ağac Mıçıqıç və Tüz Mıçıqıç, əsrimizə qədər Terlav övladından olan öz əmirlərinə xərc verirdilər. Terlav oğlu əmirlərinin öz qədim mülkləri olan Günbət və Arqunayda da dağları və başqa yerləri vardı. Bundan başqa bir kəndə də sahib idilər, oradan hər il vergi alırdılar. Həmçinin neft mədənləri olan Avuq və Bayan kəndləri, təqribən 2000 evdən və 12 kənddən ibarət Salatav mahalı, İndiri əmirlərinə xərac verib xidmət edirdilər.

Hicri 1014-cü (=1606) ildə Şah Abbas Azərbaycanı fəth etdikdən sonra Təbrizdə qışladı. Köç və ailəsi ilə bərabər, hüzurunda olan Gürcüstan valisi Aleksandr xanın oğlu Qonstantin Mirzəni, xan rütbəsi ilə Şirvan əmirül-üməralığına təyin etdi. Bəzi adamlara da əmirlik mənsəbi verdi, onlar üçün bu vilayətdə nahiyələr ayırdı. Aleksandr xana tac, cıqqa, cəvahirlə bəzənmiş kəmər və sair xələtlər verib, oğlu Qonstantin xanı əmirlər və qoşunla bərabər Gürcüstana göndərdi. Əmr etdi ki, oradan Gürcüstan qoşunu ilə Şirvanı almağa getsin. Şirvan ölkəsinin hakimi ilə bir yerdə olan əmirlər bunlardan ibarət idi:

1) Şahmur xan, bu adam Şəkinin qədim valiləri nəslindən olub, bir müddət şahın hüzurunda idi. O, Şəki əyalətinə təyin edildi; 2) Şəmsi xan Qazaqlar; 3) Şamlı oymağından Əli xan Müvafiq; 4) Qonstantin xan ilə qohumluğu olan türkmən Muslu Məhəmməd xanın oğlu Bəktaş Sultan; 5) Tizrov Sultan Müqəddəm; 6) Çakərli Əxi Sultan; 7) Şəmsəddinli Əli xan; 8) Ərəşli Əli Sultan.

Aleksandr xan öz oğlu, əmirlər və şahın məiyyətində olan bir dəstə tüfəngçi ilə Gürcüstana gəldi. O, Şirvan səfəri tədarükündə səhlənkarlıq edirdi; çünki böyük oğlu və vəliəhdi Gürgin Mirzə, bu işdə ona mane olurdu. Axırda ata ilə oğlanları arasında iş çətinə düşdü və müharibə ilə nəticələndi. Müsəlman olan Qonstantin xan, əmirlərin və qızılbaş qoşununun köməyilə öz atası və qardaşını bir yerdə öldürdü və Gürcüstanın müstəqil hökmranı oldu. Sonra, səfər tədarükü görüb, hicri 1015-ci (=1606) ilin əvvəllərində, 2000 qızılbaş və bir qədər də gürcü qoşunu ilə Şirvana hərəkət etdi. Şirvan vilayətinə qədəm qoyunca, əyan və əhalinin çoxu təslim oldu. Şəki hakimi Şahmur xan, bəzi əmirlərlə pişdar idi. Qəbələ hüdudunda, o yerin hakimi Məhəmmədəmin paşa ilə müharibəyə girişib onu məğlub etdi. Məhəmmədəmin paşa bir dəstə rumlu ilə öldürüldü, sağ qalanlar isə, Qəbələ qalasına çəkildilər.

Mühasirəçilər qalanı almaq tədarükündə idilər. Şirvan bəylərbəyisi Cağal oğlu Mahmud paşa, ətrafdakı Rum əsgərlərini Şamaxı şəhərinə topladı, topxana və hərbi ləvazimat ilə qarşıya çıxdı. Qonstantin xan da Qəbələ qalasında bir dəstə mühafiz qoyub, özü qalan qoşunla düşmənin qarşısına yeridi. Ağsu çayı kənarında müharibə atəşi alovlandı. Rumlular müharibənin əvvəlində çarxçılara, sağ cinahdan və sol cinah dəstələrinə güc gətirib, özlərini mərkəzə yetirdilər. Qızılbaş qoşunu az qalmışdı ki, məğlub olsun. Lakin Qonstantin xan bir qol ordu ilə çapıb hücuma keçdi. Qaçmaqda olan sağ və sol cinah qoşunları öz əmirləri ilə geri döndülər. Rumlular məğlub olub qaçmağa başladılar. Onlardan bir çoxu öldürüldü, bir çoxu da əsir düşdü.

Qonstantin xan Mahmud paşanın ardınca gedib, ona yetişdi və fərasətlə onu tanıdı. Az qalmışdı ki, Mahmud paşanı öldürsün, gözlənmədən Qonstantin xana dəyən bir ox yarası buna mane oldu. Min nəfər rumlu öldürüldü, Mahmud paşa da sağ qalan qoşun ilə Şamaxı şəhərinə gəlib qalanın müdafiəsi ilə məşğul oldu. Qəbələ qalasının mühasirəsi üçün qalan dəstə də rumlular qaçdığı zaman, orada dayanmayıb müharibə meydanına gəldi. Qəbələ qalasının mühafizləri məğlubiyyət xəbərini eşidincə, şəhəri qoyub qaçdılar. Qubad ibni-Firuzun bina etdirdiyi bu qalanın xarabaları indi də durur. Dərvazası, hasarı və çox dərin və qəribə xəndəyin asarından onun nə dərəcədə möhtəşəm olduğunu anlamaq olar. O biri qalaların qalabəyləri də Şamaxıya toplandılar. Bakı və Dərbənd qalasından başqa rumluların əlində heç bir yer qalmadı. Qonstantin xan, şahın hüzurunda olan təyinata müvafiq olaraq, ölkəni əmirlərə verdi. Ölənlərin başlarını bir neçə nəfər əsir və 12 bayraqla Təbrizə, Şah Abbasın hüzuruna göndərdi. Bu xidmətin qarşısında ona tac, kəmər, xəncər, cəvahirlə bəzənmiş qılınc və sair ənam verildi.

Bir neçə gün sonra yarası bir az sağaldı, gəlib Şamaxını mühasirə etməyə başladı. Qalanı almaq üçün istədiyi topxana və qorxana şah ordusundan göndərildi. Mühasirənin müddəti çox uzandı. Qonstantin xan çox məğrur olduğundan, əmirlərə o qədər də əhəmiyyət vermirdi. Camaat da (xüsusən gürcülər) iki səbəbə görə, ondan narazı idilər: birinci səbəb din ayrılığı idi, ikinci səbəb isə, atası Aleksandr

xanın xilafına olaraq, onlarla bir padişah kimi rəftar etməsi idi. O gündə bir dəfə də olsun onları ümumi işlərdən ötrü öz yanına buraxmırdı. Halbuki atası bunlarla başqa cür rəftar edərdi, əyandan olan hər bir kəs istədiyi zaman onun yanına gedərdi. Bu səbəblərə görə əhd etdilər ki, Qonstantin xandan üz çevirib, yanlarında olan Aleksandr xanın nəvəsini Gürcüstana aparıb taxta oturtsunlar.

Tərəfdarlarından bir nəfər onu işdən xəbərdar etdisə də, o çox məğrur olduğundan, buna əhəmiyyət vermədi. Atasının və özünün vəziri olan Ziyaüddin Kaşi də Qonstantin xanı gürcüləri cəzalandırmağa qoymadı. Gözəl və faydalı nəsihətlərlə gürcülərin halını yaxşılaşdırmaq istədi. Onlar zahirdə ixlas və səmimiyyət göstərib dedilər ki, biz ancaq səfər və müharibənin uzanmasından təngə gəlmişik. Artıq Şirvanda qalmağa taqətimiz yoxdur. Vəzir söz verdi ki, bir aya kimi izn alıb onların qayıtmaq tədarükünü görsün. Beləliklə də o, xanın ürəyini təşvişdən qurtardı.

Bir gecə keşikdə olan gürcü zadəganlarından (aznaurlarından) bir neçəsi qarışıqlıq salıb xanın çadırını əhatə etdilər. Şahın Qarapiri adlı mülazimi onu bu işdən xəbərdar etdi. O da çadırın arxasını yarıb Əli xan Müvafiqin mənzilinə qaçdı. Gürcülər xan zənn edərək onun xadimlərindən bir neçəsini öldürdülər. Aleksandr xanın nəvəsini ələ keçirib, toplaşdıqları yerə qayıtdılar.

Əli xanın mənzilində kərənay çalındı, qızılbaş qoşunları hər bir tərəfdən toplandılar. Gürcülər qoşunun toplanmasından anladılar ki, Qonstantin xan sağdır. Valizadəni götürüb, hamısı bir yerdə Gürcüstana yola düşdülər. Xan, ertəsi gün səhər tezdən bir dəstə ilə gedib onlara çatdı. Gürcülər vuruşa hazırlaşıb açıq və uca bir səslə: «Sən müsəlmansan, bizə xristian hakim lazımdır» dedilər. Xan vuruşmanı məsləhət görməyib geri qayıtdı. Qorxusundan qalanın yanına gəlməyib ordudan əl çəkdi. Heç bir yerdə durmadan Ərdəbilə gəldi. Oradakı bütün ordu ləvazimatı və ticarət malları rumlulara qənimət qaldı.

Qonstantin xan macəranı Maku qalası yanında şahın hüzurunda ərz etdi və kömək istədi. Şah tərəfindən qəbul edilib yardım vədəsi aldı. Lakin, o, (şahdan) icazəsiz tacirlərdən zorla və xoşla xeyli pul toplayıb yanındakı əmirlər ilə Gürcüstana hərəkət etdi. Ləzgi, Şirvan və Otuz iki elinin yığıntı adamlarından ibarət bir çox qoşun onunla bərabər idi. Şahmur xan da Şəki tərəfdən gəlib ona qoşuldu. Gürcülər, şahın Qonstantin xandan narazı olduğunu bildikdə, daha da cürətlənib, onu Qanıq çayı kənarında qarşıladılar. Qonstantin xan məğlub edilib öldürüldü...

Onun qoşunu min fəlakətə uğrayıb, bir hissəsi Azərbaycana, bir hissəsi də Şahmir xanla Şəkiyə getdi. Şah Abbas Gəncə, Tiflis və Tumanis qalalarını aldıqdan sonra, Qarabağ-Bərgüşat yolu ilə hicri 1015-ci (=1606) ildə, qışın əvvəllərində, Şirvanı almağa getdi. Hüzurunun xas adamlarından ağıllı və huşyar Məhəmməd bəyi də nəsihətnamiz bir məktubla Şamaxıya, bəylərbəyi Əhməd paşanın və Rum böyüklərinin yanına göndərdi, özü isə Arasbara gəldi.

Şəmsəddin paşa Şirvan şeyxzadələrindən və osmanlı dövlətinin inanılmış adamlarından biri idi. Rumlular onun məşvərətilə incə bir hiylə işlədərək, şahın hərəkətinə mane olmaq istədilər. Məhəmməd bəyə cavab verdilər: Şirvan bizə aid olmasa da, bizim üçün qış zamanı getmək mümkün deyildir. Əgər 3-4 ay möhlət verilsə, biz özümüz vilayəti boşaldarıq. Lakin Şamaxı şahpərəstlərindən bir neçəsi gizli olaraq Məhəmməd bəyə məlumat verdilər ki, rumlular Şamaxını boşaldıb, Dağıstanın yardımı ilə möhkəm Dərbənd qalasında dayanmaq fikrindədirlər. Lakin İstanbula getmiş olan Şəmsəddin paşa bu yaxınlarda qayıdıb gəlmişdir. Rumlular və Şirvan əhalisi adına fərmanlar gətirib nəşr edir. Bu fərmanlarda deyilir ki, Kəfəyə (Feodosiya) neçə min yeniçəri gəlmişdir. Krım valisi Qazi Gəray xan da, tatar qoşunu ilə Şirvana hərəkət etməyə məmurdur. Baharın əvvəllərində, hər iki tərəfdən saysız-hesabsız Rum qoşunu yetişəcəkdir. Bundan əlavə kəşf və kəramət göstərib deyir: Rumdakı övliyalar ona demişlər ki, qızılbaş qoşunundan Şamaxıya heç bir zərər və xəsarət toxunmayacaqdır. Avam xalq da, buna inanıb, hələlik burada qalmaq fikrindədir. Xülasə, şahın ordusu Arasbarın Xan arxından köçüb Cavad keçidinə gəldi. Rumlular körpünü dağıtdıqlarından Kürdən kərəcilər və sal ilə keçib Qarasuda endilər. Oradan da Şamaxıya üz qoydular. Ordunun hərbi ləvazimatını Kürdən keçirmək üçün təqribən 10 gün sərf etdilər. Soyuq və buz səbəbinə bir çox minik və yük heyvanı batıb tələf oldu, yerdə qalanları da çox çətinlik çəkdi.

Şah, hicri 1015-ci (=1066) ildə, ramazan ayının 10-da Yasamal keçidindən qalanın yaxınlığına gəlib, vəziyyəti nəzərdən keçirdi. Şəhərin qərb tərəfində, qaladan fərsəxin dörddə bir qədər aralı, iki dağ arasında münasib bir yerdə çadır qurdurdu. Bu yerə indi də Şah yurdu və buradakı çeşməyə Şah bulağı deyirlər. 4000 nəfərə yaxın rumlu qalanın dərvazasını bağlayıb, müdafiə işlərilə məşğul oldular. Şamaxı qalası bir dərənin içindədir, şəhərin və qalanın uzunluğu isə, o dərənin eninə düşmüşdür. Şəhərin rəiyyət evləri yerləşmiş olan əsas hissəsi cənub tərəfdə, dağın ətəyində vaqedir. Keçmiş sultan və hakimlərin evləri isə, şimal tərəfdəki dağa bitişik olub, daha yüksəkdədir. Rumlular bu hissələrin hər birində bir qala düzəldib, bir-birilə birləşdirmiş və şimaldakı qalanı yüksək burclarla möhkəmləndirmişdilər. Şah ətrafı nəzərdən keçirəndən sonra, qazılacaq səngərlərin yerini təyin etdi. Şimal tərəfdə xəndək qazımaq çox çətin olduğundan, bunu Allahverdi xanın ixtiyarına verdi. Qərb tərəfdə də beş xəndək qazılmasını əmr edərək, tərtib üzrə hər birini bir sərkərdənin öhdəsinə tapşırdı. Xəndəyin ibtidası uzaqdan başlanıb hər bir neçə addımda burcvari bir şəkildə qazılır, lazımi mühafizlər təyin edilirdi. Üç aya yaxın davam edən yağışın çoxluğundan palçıq bir dərəcəyə yetişmişdi ki, gediş-gəliş çətinləşmişdi. Ot-ələf tapılmadığından, ordunun minik heyvanlarını aşağıdakı otlaqlara göndərdilər. Bu səbəbə rum atlıları bəzən qaladan çıxıb basqın edirdilər. Buna görə, bəzi varlılar öz atlarını gətirib, Rum süvarilərini qaladan çıxmağa qoymadılar.

Mühasirədə olanlar, xəndək və səngərlər üzərinə bir neçə dəfə hücum etdilərsə də, bir iş görə bilmədilər. Gəncə qalasını almaq üçün qayrılan topların gətirilməsi xüsusunda şah tərəfindən əmr verildi. Ölkə işlərini nizam və intizama salmaq rəiyyətin halını yaxşılaşdırmaqdan ötrü Qaramanlı Zülfüqar xan Şirvanın əmirülüməralığına təyin edildi. Bu zaman Bakı və Dərbənd qalalarının fəth edilməsi mümkün oldu. Bu hadisənin təfsilatı belədir:

Rumlular var qüvvələrini Şamaxı qalasını saxlamaq üçün sərf etdiklərindən, Bakı və Dərbənd işlərilə bir o qədər məşğul olmamışdılar. Bakı və Dərbənddə olan mühafizə dəstələrinin sayı 200-300 nəfərdən artıq deyildi. Bunların çoxu da yerli əhalidən olub, ancaq maaş üçün xidmət edirdi. Bir az keçəndən sonra Bakı əhalisi şahpərəstlik izhar etdi. Bakı qalabəyisi onların bəzisini cəzalandırmağa başladı. Onlar iğtişaş qaldırıb, rumluların üzərinə töküldülər. Bir hissəsini qətl edib, bir hissəsini də əsir etdilər. Ölənlərin başlarını və əsirləri şahın hüzuruna göndərdilər. Bu xidmətlərinə qarşı osmanlılardan alınan qənimətlər, çoxlu ənam və cayizə onlara mərhəmət edildi. Bu möhkəm qalaya, qalabəyi və mühafizlər təyin edildi.

Rumluların xidmətində olan bir çox Dərbənd əhalisi də bakılılar kimi hərəkət etməyə başladı. Xacə Məhəmməd Dərbəndinin oğlu Şah Təhmasib dövründə layiqli xidmətlər göstərmişdi. Xüsusilə bu padişahın lütf və mərhəmətinə nail olmuşdu. O, adam göndərib, Qaytaq üsmisi Xan Məhəmmədin oğlu Rüstəm xanı 200-300 nəfərlik bir dəstə ilə şəhərə gətirdi və şahpərəstlik izhar etməyə başladı. Qalabəyi Gəzər Həsən özünü itirib, 60-70 nəfər rumlu ilə Narınqalaya çəkildi. Xacə Məhəmmədin oğlu, Dərbənddəki yoldaşları və üsmi xanın mülazimləri ilə şahın hüzuruna gəlib lütf və mərhəmətinə nail oldu. Şah onların əmlak vergilərini bağışladı. Dərbənd əhalisini divan vergilərindən azad edib, Üsmi adına lütf və mərhəmət ifadə edən bir fərman yazdı. Öz bacarığı ilə məşhur olan xas qulamı Mənuçehr bəyi, cığatay, xorasanlı, iraqlı və sairdən mürəkkəb bir dəstə tüfəngçilə qalaya qalabəyin və yollara mühafiz təyin etdi. Şahnəzər bəy Təkəli Cığatay Şahqulu Sultan Bayat, Mir Nemətullah Sultan və sairdən ibarət bəzi əmirlər və əsgərlər də onların köməyinə getdilər. Üsmi Rüstəm xan ilə birlikdə burcların və hasarların altından lağımlar atdılar. Bununla da qala əhlinin işini çətinləşdirdilər. Gəzər Həsən, əmirlərin yanına adam göndərib, aman istədi, yoldaşları ilə birlikdə şahın qulluğuna girməyi xahiş etdi. Onun bu xahişi qəbul olundu, özü də hüzurun xidmətçiləri sırasına keçdi.

Şahın fikri Dərbəndi möhkəmləndirmək idi. Silahdarbaşı Gözüböyüklü Qənbər bəyi, burcları təmir etmək və səddi möhkəmləndirmək işlərinə rəhbər təyin etdi. Şah əmr etdi ki, mümkün qədər dənizin içərisində bir burc tikdirib, onun divarını qalanın hasarına bitişdirsinlər. Ta ki, su azaldığı zamanlarda gediş-gəliş mümkün olmasın.

Qəribə asardan biri də budur ki, burcun binasını qoyduqda, dəniz içərisində dəmir millər ilə bir-birinə bağlı daş və kərpic tikilmiş qədim bir burcun təməli meydana çıxdı. Yeni burcun binasını bu təməlin üzərində qoydular. Xalq arasında

məşhurdur ki, Qur'anda adı çəkilən Zülqərneyn səddi həmin Babül'əbvab səddidir. Bu sədd, Yəcuc xasiyyətli Dəşti-Qıpçaq əhlini dəf etmək üçün dəniz kənarından Əlbürz dağına qədər çəkilmişdir.

Bu əsnada, qabaqcadan Qazi Gəray xanın yanına səfarətə göndərilmiş Talıb bəylə, Hacı Bayram adlı bir nəfər gəlib dostluq məktubu gətirdi, sədaqət və səmimiyyət izhar etdi. Bu hadisə, Şamaxı qalasında yaşayanların iğtişaş salmasına daha çox səbəb oldu. Gürcüstan valisi Təhmurəs xanın anası da 1000 nəfərlə gəldi. Həmçinin Dağıstan əmirləri, Çərkəz əmirzadələri, Qaytaq üsmisi Rüstəm xanın qardaşları, zaxurlu Əli bəy və Təbərsəran valisi Məsum xan da şahın dərbarına üz qoydular... Məsum xan səbəbsiz qorxuya düşdü və icazəsiz ordudan ayrılaraq, Təbərsəran yolunu tutub getdi. Şah onun ardınca xələt və məktub göndərib könlünü aldı.

Təsadüfi olaraq, qurban bayramı günü, divanxananın yanında özü çubuqdan və sütunları qamışdan qayırılmış bir eyvanda qonaqlıq büsatı düzəlmişdi. Sədrəzəmlər, böyük alimlər, əmirlər və dövlət başçıları burada oturub padişahın gəlməsini gözləyirdilər. Birdən eyvan uçuldu; Dağıstan əmirzadələri bir tərəfdə oturduqlarından tez bayıra çıxdılar. Sədrəzəmlərdən, üləma və dövlət başçılarından bir çoxu yaralanıb həlak oldu.

Xülasə, Gəncədən böyük topları gətirməyə məmur olan Əmirgunə xanın qardaşı Hüseynqulu xan Qacar, topları salamət gətirib orduya yetirdi. Bunlardan birini Allahverdi xanın, o birini də, Qarçaqay bəyin səngərinə qoydular. Otuz batmanlıq (ağır) topların və xəndəkdən keçib, hasar altına çatmış lağımların sədəməsindən qala və qaladakıların halı gündən-günə zəifləməkdə idi. Mühasirə edənlər yürüş və hücum hazırlığı görüb, hökm və fərmana müntəzir idilər. Lakin şah istəmirdi ki, şəhər zorla alınsın, günahkarlarla bərabər günahsızların qanı tökülsün və malları qarət olunsun. Axırda, Qarçaqay bəyin səngərindəki qulamlardan bir neçəsi fürsət tapıb top zərbilə zədələnmiş bir burcun üstünə çıxdılar. Qoşun da bu hadisəni yürüş fərmanı zənn edib yoldan hücuma başladı. Qarçaqay bəy bu halda maneçilik göstərməyin faydasız olduğunu anladı, bir çox qoşunun həlak olmasından qorxaraq, istər-istəməz yürüş və hücum əmri verdi. Zülfüqar xan səngərinin qarşısında da köhnə burclardan birinin bir tərəfi top gülləsilə uçulub tökülmüşdü. Qala əhlindən iki nəfər gəlib dedilər: burc boşdur, əgər istəsəniz gəlin. Qoşun əhli fürsəti fövt etməyib, 150 nəfərə qədəri yuxarı dırmaşdı. Zülfüqar xan işi belə görüncə, burcun üzərinə çıxıb nağara və nəfir çaldıraraq hücuma əmr verdi. Bütün qoşun ətrafında şəhərə üz qoydu. Az bir zamanda şəhər və aşağıdakı qala alındı. Qala əhlindən 3000 nəfərə qədər qətlə yetişdi. Şahın qoşunundan ancaq bu 3-4 nəfər adam tələf oldu.

Rumlular yuxarıdakı qalaya çəkilib özlərini müdafiə etməyə başladılar. Şəhərə girmiş qoşun evdən evə yol açıb, lağımları iki qala arasında fasilə olan yuxarı qalanı divarlarına və burclarına çatdırdılar və onu uçurdular. O biri tərəfdən də qorçular öz səngərlərini xəndəyə və buradan da üstüörtülü yolla özlərini yüksək

burca çatdırıb hücumla onu aldılar. Bu hadisədən sonra, rumlular evlərin divarlarından və qapılarından müdafiəyə başladılar; Axırda, iş-işdən keçdiyindən, Əhməd paşa öz xas adamlarından bir dəstə ilə keçmişdə şirvanşahların məskəni olan bir köşkün damı üzərinə çıxıb müdafiə edirdi. Axırda, Allahverdi xan vasitəsilə, gecəni möhlət istədi ki, səhəri qalanı təslim etsin. Onun bu diləyi şah tərəfindən qəbul olundu. Lakin qalanın ətrafına gözətçilər təyin edildi ki, gecə heç kəs çıxıb gedə bilməsin.

Səhər, qalanın mühasirəsindən 6 ay keçəndən sonra, şahanə məclis quruldu. Şah dini ayin üzrə Allaha həmd və səna edib, dövlət taxtında qərar tutdu və şənlik nağaraları çalındı. Qarçaqay bəy qulamlar və tüfəngçilərlə qalanı və dərvazaları almağa, Hüseyn bəy carçıbaşı Zülqədər isə Əhməd paşanı, Şəmsəddin paşanı, onun qardaşını və oğlunu, Kiçik Həsəni və bir neçə başqa adamları tutub hüzura gətirməyi məmur edildi. Əhməd paşa ağıllı və söz anlar bir şəxs olduğundan aman tapdı. Kəşf-kəramət iddiasında olub, qalanın qızılbaşlar tərəfindən alına bilməyəcəyinə hökm verən Şəmsəddin paşanın, şahın əmrilə əvvəl uzun saqqalını yoldular, sonra qardaşı oğlu və bir neçə nəfər başqa adamlarla işgəncə ilə öldürdülər. Rum qoşunlarının mallarını zəbt etdikdən sonra onlara istədikləri yerə getməyə icazə verdilər. Şəhərin varlı və əyanlarından müsadirə yolu ilə bir çox mal alıb Şirvan əhalisindən lazım görülən şəxslərə ənam verildi. Fitnəsindən qorxu gözlənilən şəxslər də hakimlər tərəfindən tədricən dəf olundu. Şirvanlılar, qızılbaşlara həmfikir olduqlarını göstərmək üçün, çox vaxt onlara dost və aşna olan rumluları öldürdülər.

Bu zaman Şirvan əyalətinə hakim təyin edilən Zülfüqar xandan çox çirkin bir hərəkət baş verdi. Bu hərəkətinə görə o, şah və qoşun tərəfindən məzəmmət olundu. Bunun təfsilatı belədir: onun bacısı və qardaşının iki qızı Əhməd xan və Gilani hadisəsində Şirvanda rumluların əlinə keçmişdi. Rumluların əyanlarından bəzisi, insaniyyətpərvərlik göstərərək və onların namusunu mühafizə etmək məqsədilə onları alıb, övlad sahibi olmuşdular. İnsafsız Zülfüqar xan, sileyi-rəhm gözləməyib, qadın və kişi 32 nəfərdən ibarət olan hamısını bir gecədə öldürtdü. Özü də aşağıda qeyd ediləcəyi kimi ömründən və dövlətindən bir fayda görmədi.

Dərbənd və Şabran hökuməti Ustacallı Çıraq Sultana həvalə olundu. Şahnəzər bəy Təkəli də ona müavin təyin edildi. Zülfüqar xan Şamaxıya gəlib, işləri yoluna qoymağa və şəhəri abad etməyə başladı. Şah da havaların istiliyi üzündən Şamaxı yaylaqlarına gedib, eyş-işrətlə məşğul oldu. Dağıstan və Çərkəzistan hakimləri və əmirlərindən hüzurda olanları və ya elçilər vasitəsilə ixlas göstərənlərini padişaha layiq ənamlarla mükafatlandırdı. Rüsmi xan Üsmi üçün də layiqli xələtlər göndərdi. Qorxuya düşən Məsum xanı arxayın etmək üçün, Şirvan vəziri Məhəmməd Saleh bəylə ona xələt və hədiyyələr göndərdi. O da minnətdarlıq nişanəsi olaraq hərəmxanasına məxsus qızlardan birini şahın hərəmxanasına göndərdi. Özünü də dərgahın müxlislərindən hesab etdi. Şah Abbas, Şirvan və

Dağıstan işlərini yoluna qoyduqdan sonra, Ərdəbilə yola düşdü. Əli bəy Cavanşir də Cavad keçidindəki körpünü düzəltməyə məmur edildi.

Şirvanın qarışıqlıq dövründə, Şabranın Təbərsərana bitişik olan bir nahiyəsi təbərsəranlıların əlinə keçmişdi. Rumlular Təbərsəranlıların yardımına möhtac olduqlarından, bu yeri onlardan istəmədilər. Təbərsəranlılar indi də onu Şabran hakiminin ixtiyarına vermirdilər. Onların qorxusundan hakimin qulluqçularının buraya gedib gəlməsi çətin idi. Buna görə, şah tərəfindən Şirvan bəylərbəyisi Zülfüqar xana əmr olundu ki, o nahiyədə möhkəm bir qala tikdirib, mühafizlər təyin etsin və onların azuqədən təmin olunmasına nail olsun. Ta ki, gediş-gəliş yolu dağ əhalisinin şərindən asudə olsun. Zülfüqar xan da qoşunla bu nahiyəyə gəlib, əhvalatı Təbərsəran valisi Məsum xana bildirdi. O buna razı olmadı və qala üçün yer təyin edildiyi zaman, neçə min atlı və piyada ilə müharibə qəsdilə qarşıya çıxdı. Zülfüqar xan bir daha elçi göndərib, ona nəsihət etdi, onu əzmindən döndərmək istədi, birinci hücumda təbərsəranlılar məğlub edildilər, onlardan 1000 nəfərə qədər qırıldı. Zülfüqar xan az zaman içərisində ona tapşırılan mühüm məsələni bitirib qayıtdı. İşin keyfiyyətini şahın dərbarına bildirdi. Bu hadisə şah həzrətlərinin xoşuna getmədi, çünki o, Məsum xanın xatirini istəyirdi və həm də hərəmxanasında olan qadınlardan biri Məsum xanın əqrəbasından idi. Buna görə, Zülfüqar xana buyurdu ki, etibarlı bir adam göndərib, Məsum xanın könlünü alsın. Vali Zülfüqar xan da öz etdiyindən peşman olub üzr istədi.

Zülfüqar xanın istilası, məğrurluğu və qala tikdirməsi üzündən, Dağıstan hakimləri və Təbərsəran... başçıları, özlərinin məhv olmasından qorxaraq xəyalən pərişan bir halda idilər.

İran padişahı hicri 1018-ci (=1609) ildə, Qarabağda qışladığı zaman, yaxın adamlarından Qarçaqay bəyi hüzurunda olan bir dəstə qulam və qoşunla göndərdi ki, Zülfüqar xan və Şirvan əmirlərilə Şabrana getsin, könül alan məktublarla Dağıstan hakimlərini arxayın etsin, tabe olanlara hörmət göstərsin, onların övlad və əqrabalarından bəzisini xidmət etmək üçün şahın dərbarına göndərsin, üsyan edənləri isə cəzalandırsın. O, Şabrana gəldikdən sonra, «Şahdan gizli məktub var» bəhanəsilə Zülfüqar xanın çadırında onunla tək qaldı. Bu vaxt şahın qulamlarından bir neçəsi çadıra daxil olub Zülfüqar xanı öldürdülər. Şah tərəfindən verilən fərmana görə, Şirvan əyaləti keçmişdə Astarabad hakimi olan Yusif xan Mirşikara verildi. Qaramanlı oymağından olan bir dəstə, qorçular sırasına keçdi, qalan qoşun da, hökmə görə Yusif xanın ixtiyarına verildi. Zülfüqar xandan qorxan Dağıstan hakimləri vahiməsiz Qarçaqay bəyin yanına qayıtdılar. Sədaqət göstərdilər, öz adamlarına ləyaqətli peşkəşlərlə ona qoşaraq padişahın dərgahına göndərdilər. Hicri 1024-cü (=1615) ildə Rum əsgərlərinin gəlməsi xəbəri yayıldığı zaman, sərhəd işlərində iğtişaş baş verdi, Gürcüstana qarışıqlıq düşdü. Şirvanda və osmanlılara meyl və məhəbbət göstərməklə müttəhim və haqlarında sürgün hökm verilən şəxslər fürsət tapdılar. Xüsusən Dəli Məlik ləqəbilə məşhur olan Qabıstan tərəkəmələrinin başçısı məlik Piri, Şirvan dələdüzlərindən bir dəstəni öz başına

yığdı. Dağıstan tərəflərini özlərinə sığınaq edərək, ölkənin kənar bucaqlarında qarətgərliyə başladılar. Bu cəhətdən Şirvan vilayətində də çaxnaşma əmələ gəlib, fitnə və qarışıqlıq meydana çıxdı. Dəli Məlik baş qaldırmış olan Kaxet valisi Təhmurəs xanın yanına bir nəfər göndərib, ona tərəfdar olduğunu bildirdi. Başındakı dəstə ilə, şirvanlı İmadəddin bəyin nəvəsi, Ərəş hakimi və möhürdarı olan Şahqulu bəy Zülqədərin qız nəvəsi Məhəmmədhüseyn Sultanın üzərinə yürüdü. Məhəmməd Hüseyn Sultan öz köçünü və ailəsini qarşılamaq üçün Kür kənarına getmişdi, bu zaman onun üzərinə töküldülər. Sultan yanındakı azacıq adamla, bacardığı qədər özünü müdafiə etdi, axırda hamısı öldürüldü və bütün var-yoxları yağıların əlinə keçdi. Sultanın adamları qala qapısını bağlayıb, istədilər ki, vaxtı uzatmaqla ya aman tapsınlar, ya da amangah. Dəli Məlik öz adamları ilə Ərəş qalası qarşısında yerləşdi. Lakin Gürcüstan və Şirvan iğtişaşını yatırmağa təyin edilən qızılbaş qoşununun gəlməsini eşidərək, Dəli Məlikin tabeləri dağılışıb getdilər. O, Gürcüstan və Dağıstanda avara-vətən və bədbəxt olub adı batdı.

Hicri 1025-ci (=1616) ildə, Şah Abbas özü Gürcüstanı cəzalandırmağa getdi. Yusif xan Şirvan qoşunu ilə Zəyəm tərəfindən hərəkət etdi, çayın kənarında yerləşdi. Bu zaman Zəyəmin xristianları toplaşıb şirvanlılara hücum etdilər. Böyük bir müharibədən sonra Zəyəm əhalisi məğlub oldu və bir çoxları öldürüldü. Sağ qalanları da qaçmağa başladılar. Şirvanlılar Zəyəm şəhərində abadlıqdan bir əsər və əlamət qoymadılar. Qaytaq üsmisi Rüstəm xan, sədaqət izhar etmək üçün şahın hüzuruna gəlmişdi. O, Alget çayı kənarında ehtiramla qəbul edilərək, Dərbənd əyalətinin hakimlik fərmanı ilə geri qayıtdı. Dağıstan və Təbərsəranın sair hakimləri də öz adamlarını layiqli peşkəşlərlə bərabər göndərmişdilər, bunlar da qiymətli xələtlərlə təltif edildilər.

Bu tərəflərin mühüm işləri, istənildiyi kimi yoluna qoyuldu. Şah Gəncə şəhərini köhnə yerindən köçürüb, bir ağac yuxarıda olan indiki yerində bina etdirdi. Buradakı meydan, məscid və karvansara elm və əməldə həqiqətən kamil bir vücud olan Böyük şeyx Bəhaəddin Məhəmməd Amilinin planı üzrə tikilmişdir. Bunlar Şah Abbasdan qalan tarixi abidələrdən bir yadigardır. Şirvan vilayəti bu hadisələrdən sonra Səfəvilər dövlətinin qarışıqlıq zamanına qədər, İran əmirləri və bəylərbəyilərinin hökumət mərkəzi olmuşdur.

Şah Abbas məmləkəti abad etmək və rəiyyətin asayişinə baxmaq işlərində bütün dünyada məşhurdur. Qoymuş olduğu bir çox mülki və əsgəri qanunlar, İran şahları üçün rəhbər olmuşdur. Sultanların ləyaqətini onların xüsusi məziyyətlərinə görə təyin edən Avropa tarixçiləri belə, bu elmi sevən padişaha «Böyük» ləqəbi vermişdilər. O, xalq arasında indi də adil sifətilə tanınmaqdadır. İctimai binalar və xeyriyyə müəssisələri tikdirməkdə islam dövründə, İranda bu padişahın misli və tayı olmamışdır. Bütün İranda o cümlədən Şirvan ölkəsində olan məscidlər, mədrəsələr, uzaq çöllərdəki kəhrizlər və çoxlu karvansaralar bu iddianın doğruluğuna aydın bir sübutdur. Bir çox fazil şəxslər, onun tərbiyəsi sayəsində, elm və fəndə öz dövrünün başçılarından olmuş və bütün dünyada böyük şöhrət

qazanmışlar. İşinin çoxluğuna və bir çox müşkül işləri həll etməklə məşğul olmasına baxmayaraq o, kamil adamlarla müsahib olmağa mail olub, gözəl təbi-şerə də malik idi...

Şah Abbas hicri 1038-ci (=1629) ildə, 54 yaşında, Mazandaranın Əşrəf adlı şəhərində vəfat etdi. O, bu şəhəri özü bina etdirmişdi, gürcülərdən bir qismini köçürüb, burada yerləşdirmişdi. Sam Mirzə ibni-Səfi Mirzə ibni Şah Abbas - atasının vəfatından sonra onun adı ilə adlanıb vəliəhdliyə təyin olunduğu üçün - 18 yaşında Şah Səfi adı ilə taxta oturdu. O, osmanlı qoşunu ilə qalibiyyətli müharibələr etdi. Sultan Murad xanın aldığı İrəvan şəhərinin bir neçə aydan sonra, hicri 1048-ci (=1639) ildə fəth etdi. Rum Xandigarının (Sultan Muradın) İran əleyhinə təşviq etdiyi Üsmi Rüstəm xana qarşı, Qumuq əmiri Surxay Mirzə ibni-Eldar xan ibni-Surxay şamxalı qüvvətləndirib şamxallığa təyin etdi. Bundan bir il qabaq rus padişahı Mixail Fyodoroviç də onun şamxallığını təsdiq etmişdi. Qəbrinin kitabəsinə görə, Surxay Mirzə hicri 1049-cu (=1640) ildə, Buynaqda vəfat etmişdir. Məlum olur ki, ondan sonra şamxalların və vəliəhdlərinin keçmiş hökumət mərkəzi olan Qumuq şəhərində onlardan kimsə hökmranlıq etmişlər.

Qaziqumuqlar bir müddət naib vasitəsilə şamxalın müəyyən olan vergisini vermişlər. Axırda onlar da, dönüklüyə başlamışlar. Şah Səfinin hüzuruna girov olaraq göndərilən Surxay Mirzənin qardaşı Əlqas Mirzə, Səfiqulu xan ləqəbilə əmirlik mənsəbinə yetişdi. O, bir müddət İrəvan və Şirvanda hökmranlıq etdi.

Şah Səfi hicri 1052-ci (=1642) ildə vəfat etdi. Oğlu II Şah Abbas 10 yaşında səltənət taxtına oturdu. O, Gürcüstana səfər açıb, itaət etməyənləri külli surətdə qətl və qarət etdi. Calallı və sərvətli bir padişah olub səltənət işlərini qurmağı da yaxşı bacarırdı. Onun təbi-şeri də var idi...

O da 24 il padişahlıq etdikdən sonra vəfat etdi. Oğlu Şah Səfi İran taxtına sahib olub, bir neçə vaxtdan sonra Şah Süleyman adını aldı. Əmmə xan və Eldar xan övladının, Gəray xan və Surxay şamxal oğlanlarının adına yazılan fərmanların tarix və məzmunlarından məlum olur ki, Şah Süleyman və onun atası, Dağıstan əmirlərinə maaşdan əlavə, Şirvan vilayətindəki kəndlərdən bir neçəsini də veriblərmiş. Onlar da, əvvəlkindən daha çox gediş-gəlişdə olub xidmət göstərməyə başlamışdılar.

O zamanlarda üsmi sülaləsi iki şöbəyə ayrıldı: bunlardan biri Məcalisdə, o biri də Engi-kənddə otururdu. Bu iki şöbənin hər birindən növbə ilə üsmiliyə keçən şəxs Başlıda otururdu. Bu zaman aralarına çəkişmə düşdü. Engi-kənd şöbəsi böyük olan Məcalis şöbəsinə qalib gəldi, Hüseyn xan adlı kiçik yaşlı bir oğlandan başqa hamısını öldürdülər. Bu şöbənin yaxın adamlarından Aydə bəy adlı bir nəfər onu götürüb şamxalın yanına qaçdı. Gənclik dövrünə çatıb, hünərli və igid bir cavan olandan sonra, Hüseyn xan İrana getdi. Bir müddət Səlyan Rudbarında, qazi Axund Molla Məhəmmədin evində qonaq qaldı, qızı Xədicə bəyimi aldı. İsfahana gəldikdən sonra, şahın dərbarına yol tapmayıb, eyş-işrətə qızışdı. Mülazimlərinin bütün libas və silahlarını satdırdı. Bu əsnadə, Qacar əmirləri xanədanından Zöhrə

xanım adlı bir qız, onun şücaətinə və gözəlliyinə məftun oldu. Qız eşqbazlığa başlayıb ona hər cür köməklik edirdi. Hüseyn xanın haqqında yazılmış və bu ölkədə çox şöhrət tapan bu şeri o qıza nisbət verirlər:

Qəzəl

Çəkib rüsxarə yapunci, edər can qəsdin ol yaği,
Könül dərbəndini çapdı, qoyanda başə qeytaği,
Dağıstan dağını gör-gör, sığınmaz dağı göysümə,
Qara geymiş Qumuq xalqı, tutubdur Dəşti-Qıpçağı.
Bitən hər gül olub xoşbu, taalallah bu mənzildə,
Gülüstani-İrəm bulmuş, məgər bu Qübbə torpağı.
Ləbi-lə'li-şəkərbarın, təkəllümdən, təbəssümdən,
Sanasan bağ ara titrər, səbadan lalə yarpağı.
Gözün yaşini mən billəm, yıxar könlüm evin axır,
Olur əlbəttə viran, olsa hər mənzil su oynağı.

Xülasə (Hüseyn xan) o qızı aldı. Layiqli xidmətlərinə görə, padişahın hüzurunda tanındı. Çox şücaət və hünər sahibi olmaqla ad çıxardığından Quba və Səlyan ölkələri ona verildi. Oğlu Əhməd xan bu qızdan olmuşdur. Buna görə, Ağa Məhəmməd şah Şeyx Əli xanı özünə qohum hesab edirdi. Bu yaxınlıq səbəbinə Fətəli şahın anası Xədicə bikə arasında mehribancasına yazışmalar davam edirdi. Rudbar və Səlyan qazisinin qızından da Qəbilə xanım adlı bir qız dünyaya gəlmişdir ki, bu nahiyyənin əmirləri onun nəslindəndir. Hüseyn xan Qubadakı Xudad qalasını təmir edib, özünə hökumət mərkəzi qərar verdi. Burada, İran üslubunda düzəltdiyi bağ indi də vardır. Xanədanı, İranda qəbul etdiyi şiə məzhəbində qalmışdır.

Hicri 1100-cü (=1689) ildə Başlıya gəlib, öz irsi hökumətini üsmi Əli Sultandan geri aldı. Əli Sultan, ətraf və qonşu tayfalardan 30000 qoşun toplayıb, təkrar Qaytaq əmirliyini ələ keçirdi. Hüseyn Xan da Qubaya qayıdıb vəfat etdi.

Bütün tarixçilərinin yazdığına görə, Şah Süleyman ədalətli və ciddi, ölkədarlıq fənlərində mahir, elmi sevən, şəriətpərvər... və qonşu sultanlar ilə dostluq mərasimini gözləyən bir padşah idi. Ömrünün axırlarında, şiddətli ayaq ağrısından yeddi il yataqda yatıb, hicri 1105-ci (=1694) ildə vəfat etdi.

Oğlu Sultan Hüseyn taxta oturdu. Dindar və insaflı bir şəxs idi, həmişə üləma ilə görüşərdi. O, gecələr nafilə namazı qılardı, gündüzlər isə, əlaltıları qafilə soyardılar. Get-gedə ölkə xarabalığa üz tutdu. Hər bir tərəfdən səltənət binasına rəxnə düşdü. Bu tədbirsiz padişahın hökmranlıq dövrünün axırlarında, fəsad əhlinin dilədiyi kimi dövlət işləri nizamdan düşmüşdü. Şirvan və Dağıstan vilayətləri də iğtişaş və qarışıqlıq məhəlli oldu. Üsmi Əli Sultan vəfat edib, Əmir

Həmzə onun yerinə keçdi. Hicri 1107-ci (=1696) ildə onun əmirliyi şah tərəfindən də təsdiq olundu.

O, on ildən artıq üsmi oldu. Axırda, Əhməd xan oğlu, Qaytaq əhalisindən bir çoxunun köməyi ilə gedib Başlını ələ keçirdi. Əmir Həmzə yuxarı mahallara qaçıb, bir neçə ildən sonra, Əhməd xan ibni-Ulu bəy üsmi ibni-Rüstəm xan müdafiəyə qalxıb, bir neçə döyüşdən sonra Başlıda, Əhməd xan ibni-Hüseyn xan da Məcalisdə hökmran oldu. Axırda, Əhməd xan ibni-Ulu bəyin təhrikilə, Əhməd xan ibni-Hüseyn xan üsmini Məcalisdə, indi də mövcud olan evində, mülazimlərindən biri öldürdü. Əhməd xan ibni-Ulu bəy üsmi oldu.

Bu zamanlarda Sultan Hüseyn, irsən 12 il müstəqil baş vəzir mənsəbində olan Fətəli xan ibni-Səfiqulu xan ibni-Eldar xan şamxalın gözlərini çıxartdırdı, onu mülki işlərdən uzaqlaşdırdı. Onun (Fətəli xanın) acığına, o zamana qədər şamxalın ixtiyarında olan Dağıstandakı işlərin nizamını pozdu. Fərman musibincə, hicri 1123-cü (=1710) ildən etibarən, Qaytaq ölkəsinin işlərini Əhməd xana tapşırdı. Ona 100 tümən əvəzində ildə 200 tümən maaş təyin etdi. Əhməd xan gündən-günə öz cəlal və dəbdəbəsini artırıb, çoxlu qoşunla Təbərsəran üzərinə yeridi. Məhəmməd Məsum öz tərəfdarları ilə bərabər onunla barışdı. Rüstəm və Əli bəy isə, öz dəstələri ilə birlikdə vuruşmağa başladılar. Bəzi kəndlər yandırılıb qarət edildikdən sonra, üsmi məktublaşma və müxtəlif vasitələrlə şirvanlıları iğtişaş törətməyə və qızılbaşlar əleyhinə qalxmağa təhrik edirdi. Bu zaman, Car və Tala camaatı Şəki ölkəsi hüdudunda sakin olan Zaxur əhalisilə bərabər üsyana başladı. Onları cəzalandırmaq üçün getmiş olan Şirvan bəylərbəyisi Həsənəli xan, Şəki mahalında öldürüldü. Üsyançılar onun ordusunun mal və sursatını ələ keçirdilər. Sonra gəlib Şamaxı şəhərini qarət edərək öz yerlərinə qayıtdılar. Bundan sonra, mötəbər bir alim və mədrəsə sahibi olan Hacı Davud, Müskür camaatı tərəfindən vəkil edilərək üsminin yanına getdi, iğtişaş qaldırmaq haqqında onunla danışıq apardı. Üsmi, Murtəzaəli Əmir Həmzə oğlu üsminin komandası altında bir dəstə əsgər göndərdi. O tərəflərin sünniləri də toplaşıb Şabran şəhəri üzərinə yürüdülər. Şiddətli müharibədən sonra buranı aldılar və dağıdıb od vurdular.

Üsmi xanədanına aid və bu halisələri təsvir edən bir nüsxədə (salnamədə) yazıldığına görə, onlar beşikdəki uşaqları belə öldürürmüşlər. Şabran çayının sağ kənarında olan bu məşhur şəhərin xarabaları, indi də buranın böyüklüyünü və abadlığını göstərməkdədir.

Bu fəth və müzəffəriyyət xəbəri üsmi Əhməd xana çatdıqda o, Əli Curuq adlı bir nəfəri ayrı bir qoşunla Quba üsyançılarının köməyinə göndərdi. Bunlar Əhməd xanın qaynatası alpanlı Hacı Qaibin və müskürlü Hacı Davudun bacısı oğlu Nəzirin təhriki ilə öz əmirləri Sultan Əhməd xan ibni-Əhməd xan ibni-Hüseyn xana qarşı üsyan etmişdilər. Az bir mühasirədən sonra, Xudad qalası alındı. Sultan Əhməd xan da qaçdığı zaman tərəfdarları ilə bərabər ələ keçib öldürüldü. Onun südəmər körpə oğlu Hüseynəli xanı, tərəfdarlarından bəzisi, gizlicə Axı kəndinə aparıb saxladılar. Hüseynəli xan, rus padişahı Pyotr gələn vaxt, onun əmrilə gəlib

öz irsi mülkünə sahib oldu. Hüseynəli xan, göstərdiyi ixlas və xidmətlərinə görə, Nadir şahın əsrində də, iltifatə nail olmuşdu. Nadir şah Səlyanı da qabaqkı qərar üzrə ona bağışlamışdı. Xülasə, Xudad fəth edildikdən sonra, Əhməd xan üsmi oz qoşunu, mal-dövlətlə öz tərəfinə çəkdiyi aqquşalılar və sair yerlilərlə bərabər, Qaziqumuğun başçısı Surxay ibni-Gəray ibni-Əli bəylə ittifaq edərək, Müskürə gəldi. Ondan da Hacı Davud və Quba əhalisi ilə birləşərək, otuz minə yaxın qoşunla gedib Şamaxı şəhərini mühasirəyə aldı. Lakin o öz məqsədinə çatmayaraq geri qayıtdı, Şamaxı əhalisi, şəhərin ətrafını hasarla möhkəmləndirib, müskürlüləri qarət etməyə başladılar. Əhməd xan üsmi, Xasfulad ibni-Əmir Həmzə üsmini bir dəstə ilə Müskürün mühafizəsinə təyin etdi. Özü isə, qış qurtarandan sonra, Dərbəndin Kafiri adlı səhrasında, Şamaxını almaq üçün Surxay xan və başqaları ilə ittifaq etdi.

Gəray xan şamxal buna mane olaraq xəbər göndərdi ki, mən İran dövlətinin qulluqçusuyam, əgər siz Şamaxının üzərinə yürüsəniz, mən də sizin mülkünüzün üstünə gələcəyəm. Buna görə, Əhməd xan oz mülkünü qorumaq üçün getmədi. Surxay və Hacı Davud isə, öz adamları və üsminin qoşunundan bir dəstə ilə gedib, Şamaxını 15 günlük mühasirədən sonra, sünilərin köməyilə, hicri 1124-cü (=1712) ildə aldılar. Şiələri qətl-qarət etməkdə heç bir şey əsirgəmədilər. Bu hadisə zamanı, Şirvanın yeni bəylərbəyisi Hüseyn xan və 400000 tümən dəyərində malları olan 300 nəfərdən artıq rus taciri öldürüldü, malları da talan edildi.

Bir azdan sonra, Surxay və Hacı Davud əhvalatı Osmanlı dərbarına yazıb bildirərək, o dövlətin himayəsi altına keçdilər. Sadir olan fərman musibincə Hacı Davud bəy Şirvan hakimi təyin olundu. Sarı Mustafa paşa da bir dəstə qoşunla onun köməyinə göndərildi. Beləliklə, Surxay xanın bu işlərə müdaxilə etmək yolu bağlandı. Bu səbəbə onların arasında ziddiyyət və ayrılıq düşdü. Şəki ölkəsinin bir çox mahallarına sahib olan Surxay, Gəncəni almağa yürüş etdisə də məqsədə çatmadan geri döndü. Ondan sonra, Osmanlı dövlətinin fərmanı mucibincə, Zaxurlu Əli Sultan paşa ləqəbilə Şəki məmləkətinin və ona əlavə edilən Zaxur sancağının bəylərbəyisi təyin edildi.

Get-gedə İrəvan, Gəncə, Gürcüstan və Şirvanın bir çox yerləri Rum dövlətinin ixtiyarına keçdi. Əhməd xan üsmi, Hacı Davudun şərrini dəf etmək və osmanlılarla müharibə etmək bəhanəsilə Şirvana gəldi. Şah Təhmasib tərfindən yazılan fərmanın məzmunundan anlaşıldığına görə, o özünü İran dövlətinə tərəfdar göstərmiş, həqiqətdə isə, qarət fikrində idi. Bu zaman rus padişahı Pyotrun gəlməsindən xəbər tutub öz mülkünə qayıtdı.

Qolikov[66], Pyotrun fəaliyyətindən bəhs edən tarix əsərində yazır ki, İran dövlətində səltənət işlərinin qarışıqlığını, Şirvanda rus tacirlərinin qarət edilib öldürülməsini nəzərə alaraq, rus padişahı Pyotr hicri 1134-cü (=1722) ildə, həziran

[66] Qolikov (İvan İvanoviç) - rus tarixçisidir, 1735-ci ildə anadan olmuş və 1801-ci ildə vəfat etmişdir. Əsərlərindən ən məşhuru «Böyük Pyotrun fəaliyyəti» adlı kitabdır.

(iyun) ayının 15-də Hacı Tərxana gəldi, İran vilayətlərinə bu məzmunda bir müraciətnamə yazdı:

«Ləzgilərin əmiri Davud bəy və Qaziqumuq əmiri Surxay öz padişahlarına yağı olub, hicri 1125-ci (=1713) ildə, Şamaxı şəhərini yürüşlə almış, rus tacirlərini qətl və qarət etmişlər. Bu xüsusda, Hacı Tərxan bəylərbəyisi onların yanına adam göndərmişdi, biz də şahın hüzuruna elçi göndərdik, lakin, bu vaxta qədər bir təsiri olmadı. İran padişahı bu fitnəkarların öhdəsindən gələ bilmir. Buna görə, biz özümüz onlara tənbih etmək və intiqam almaq fikrilə o tərəfə gəlirik. Hər kəs öz yerində rahat oturub asayişi pozmazsa, bizim qoşunumuzdan ona heç bir zərər və ziyan toxunmaz; əksinə, fəsad əhlinə kömək edənlər və ya qaçanlar padişahın qəhr və qəzəbinə düçar olacaqlar».

Bu zaman Əmir Mahmud Əfqan, Sultan Hüseyni İsfahanda mühasirə etmişdi. Oğlu Təhmasib Mirzə, vəliəhd və naibüssəltənə sifətilə Qəzvinə gəlmişdi. O, qoşun tədarük edərək, atasını mühasirədən xilas etmək istəyirdi. Lakin süstlüyü və bacarıqsızlığı üzündən heç bir iş görə bilmirdi. Pyotr öz konsuluna, yəni Gilanda sakin olan vəkili Avraamova bir fərman yazdı ki, şah və ya dövlət başçılarından kim ilə mümkün olsa danışıq aparsın. İran hökumətini himayə etmək vədəsilə, sərhəd boyundakı vilayətlərin rus dövlətinə verilməsi xüsusunda bir şərtnamə bağlasın. Bundan sonra, 9000 draqun, 20000 qazaq, 30000 tatar və 20000 kalmıqdan ibarət olan 79000 atlını qurudan yola saldı. Özü də təmiz (iyul) ayının 18-də, içində 22000 nizami piyada yola düşdü. İmperatora Çapartəpə adlı yerdə, Adil Gəray xan Şamxalın itaətini və lazımi yardım göstərəcəyini bildirən ərizəsi yetişdi. Buna görə, həmin ayın 24-də Çeçen adasından poruçik Lopuxini 30 nəfər çaparla Şamxalın yanına göndərdi ki, müraciətnamələri Şirvan və Dağıstan ölkələrinə yaysın. Sonra özü sahilə çıxıb, qoşun çıxarılacaq yeri təyin etdi. Əsgərlər də, həmin ayın 28-də Aqraxan çayının ağzından sahilə çıxdılar. Sulaqdan üç mil uzaqda, ordugah təyin edilib, ətrafı səngərlərlə möhkəmləndirildi.

Padişah özü baş əmirlərlə gecələr gəmidə olurdu, çünki quru yol ilə gələn süvarilərin və atların çatmasını bir neçə gün burada gözləmək lazım idi. Bu süvari dəstəsinin gecikməsinə yolun çətinliyi, su və ələfin azlığı və İndiri kəndinin əhalisilə aparılan müharibə səbəb olmuşdu. Bu kəndi almaq üçün, briqadir Veteraninin komandası altında 4 draqun polku göndərildi, onlara tapşırıldı ki, müqavimət göstərildikdə kəndi alıb dağıtsınlar, şamxala tabe olmaqla, yoldan keçənləri qarət edən o igid tayfanı, başqalarına ibrət olmaq üçün, cəzalandırsınlar.

Kəndin yaxınlığında, dar bir yerdə, yerli əhalidən 5000 nəfər həmin ayın 23-də onların üzərinə töküldü. Draqunlardan 70 nəfərini öldürüb bir qədərini də yaraladılar. Axırda, polkovnik Naumov qoşunu bu dar yerdən çıxartdı, bir az döyüşdən sonra, kəndi alıb dağıtdı və ona od vurdu. Əhalidən 300 nəfəri öldürüldü, sağ qalanları da qaçdılar.

Süvari qoşun və atlar əsas orduya gəlib çatandan sonra, Pyotr 200 nəfər əsgəri və 100 nəfər kazağı, xəstələrlə bərabər, Aqraxan səngərində, qayıqları da

onun sahilində qoydu. Dərbənd üçün təyin edilmiş gəmiləri Soymonovun komandası altında yola salıb köçdü. Avqust ayının 7-də çox çətinliklə Sulaqdan keçdi. Orada, Yaxsay əmiri Sultan Mahmud, şamxalın elçisi ilə birlikdə gəlib, 850 baş qaramal və 9 baş cins at peşkəş gətirdilər, öz ixlas və itaətlərini bildirdilər. Beləliklə, o şanlı padişahdan çox iltifat götürüb, öz hüquqlarının təsdiqinə də nail oldular.

Pyotr hər yerdə ordunun pişdarları ilə qabaqda gedirdi. Şamxalın əmrilə yollar üzərində quyular qazılmasına baxmayaraq yenə bir parça mənzillərdə su azlığından tənglik çəkilirdi. Avqustun 12-də, şamxal Adil Gəray xan, Tarxunun bir ağaclığından istiqbala gəldi; şəhər xaricində ordunun çadırları qurulmuşdu. Padişah qoşunların hamısının toplanmasını gözləyərək, üç gün orada qalacaq idi. Ertəsi gün, şamxal padişahı qonaq çağırdı. Şəhəri və ətrafı nəzərdən keçirdikdən sonra, süfrə başında cürbəcür söhbətlər danışıldı. Şamxal bu səfərdə iştirak etmək üçün qoşun vermək arzusunda olduğunu bildirdi, o isə qəbul etmədi. Şah orduya qayıtdıqdan sonra, Dərbənd naibi, qorçular yüzbaşçısı İmamqulu bəyin vəkilləri hüzura gəldilər. İxlas göstərib padişahın onları himayə edəcəyinə qarşı razılıq etdilər.

Polkovnik Naumov, başqa bir əfsər və 12 kazakla, padişah ordusunun gəlməsi üçün lazım olan işləri yoluna qoymaqdan ötrü Dərbəndə getdi. Naibin göstərişi ilə, iki şimal dərvazasında, həmin gün gəmi ilə gəlmiş olan ruslardan qarovulçu qoydular. Dərbənd qalabəyisi Sultan, bu hadisədən əvvəl İran padişahının dərbarına getmişdi. Məmləkətin naibi həmişə yerli əhalidən olub qalanın mühafizəsi də onun öhdəsində olardı.

Rus padişahı avqustun 16-da Tarxudan hərəkət edib, 18-də Ötəmiş mülkünə gəldi. Bir əfsəri üç nəfər kazakla Qaytaq üsmisinə tabe olan o yerin hakimi Sultan Mahmudun yanına göndərib tabe olmağı ona təklif etdi. Sultan Mahmud isə elçiləri öldürdü; özündən, üsmi və sairlərindən topladığı 16 min qoşunla rus ordusunun üzərinə hücum etdi, nəticədə məğlub oldu. Rus süvariləri, onları Ötəmiş şəhərinin üç milliyinə qədər təqib edərək, bir çoxlarını öldürdülər və beş yüz evdən ibarət olan bu şəhəri 6 başqa kəndlə bərabər qarət edib yandırdılar. 15 min qoyun və qaramal bunların əlinə keçdi. Əsir düşən bir neçə nəfər də padişahın əmrilə öldürüldü.

Rus qoşunu avqustun 21-də Dərbəndə girdiyi gün, istinin şiddətindən, suyun azlığından və tozanaqlı bərk küləkdən çox əziyyət çəkdi. Dərbənd şəhərinin xaricində, naib İmamqulu bəy bir dəstə üləma və sair əsnaf ilə, gümüş açarı bir məcməinin içərisinə qoyub, istiqbal mərasimi ilə təqdim edərək, razılıq və təşəkkür izhar etdi. Pyotr nizami yürüş və əsgəri musiqi ilə qalaya daxil oldu, 203 top ələ keçdi. Piyada qoşun şəhərə yaxın olan dəniz sahilində, draqun, kazak və sairdən ibarət olan süvari qoşun da Mollakəndi çayı kənarında yerləşdi. Bəndər münasib olduğuna görə, gəmilər də bu çayın ağzında dayandı. Dərbənd şəhərini hər iki tərəfdən müdafiə etmək üçün bir neçə gün ərzində təcili olaraq, biri Mollakəndi

çayı, digəri isə Orta Buqam çayı kənarında iki qala tikdirildi. Naib İmamqulu bəy, general-mayor rütbəsi və xanlıq ləqəbilə Dərbənd hökumətinə və yerli qoşun sərkərdəliyinə təyin edildi.

Paruçik Lunin, bir dəstə qoşunla dəniz yolu ilə Bakıya göndərildi ki, yeni müraciətnaməni çatdırmaqla oranın hakimlərini və əhalisini itaətə cəlb etsin. Bir neçə gün ərzində, Yalama ilə Bəlbələ çayları arasında olan bütün Dərbənd və Müskür ətrafı rus əsgərlərinin əlinə keçdi. Müskürün bütün kəndləri əhalinin iğtişaşı üzündən xaraba qalmışdı. Ancaq Dədəli kəndində Hacı Davudun daş hasarlı evi qalmışdı, qarovulçular burada sakin oldular.

Lakin Bakıdan qayıdıb ərz etdi ki, Bakı əhalisi onu şəhərə buraxmadı... Pyotr qəzəblənib istədi ki, onları zorla tabe etsin, qayıtmasına səbəb olan maniələrə görə, o bu işi gələn ilə qoydu.

Dərbənd xaricdən, dağdan dənizə doğru çəkilmiş iki hasarla əhatə edilmişdir. Daxildən isə, dörd hissəyə bölünmüşdür. Bu hissələr bir-birindən divarlarla ayrılır. Birincisi hamıdan yüksək və daha kiçik olan Narınqaladır. Ruslar əvvəlcə buranı aldılar və əhalisini təmamilə çıxarıb kənara göndərdilər. Padişah özü burada sakin oldu. Ortadakı iki hissədə naib, tacirlər və xalq əsnafının evləri, karvansaralar və sair yerləşmişdi. Padişah burada olduğu zaman, boş qalan və Dubaru adı ilə məşhur dördüncü hissədə iki qazarma, yəni saldatxana və bir də sursat ambarı tikildi. Gəmilərdən sursat çıxaran zaman şiddətli bir tufan qalxdı, gəmilər elə zədələndilər ki, onlara dolan suyu kəsmək mümkün olmadı. Axırda lövbərləri kəsdilər, tufan gəmiləri sahilə atdı. Gəmilərdə olan ərzaq isə xarab oldu. Həmçinin Hacı Tərxandan 30 gəmi ilə gətirilən sursat da Araxan bəndərində bu hala düşdü. Azuqə hər cəhətdən çox az qalmışdı. Bu ətrafda da iğtişaş olduğundan, taxıl ələ gətirmək mümkün deyildi. Buna görə, qoşunun Rusiyaya qayıtması lazım görüldü.

Rus padişahına bir nəticə əldə etmədən geri qayıtmaq çox ağır gəlirdi. O, xüsusilə Bakını alıb, Kür çayı ağzında ticarət üçün böyük bir şəhər bina etmək və bu çay ilə yuxarı gedərək, Gürcüstan məsələsini də yoluna qoymaq istəyirdi. Bunlardan başqa o, Astarabad vasitəsilə Hindistan ilə ticarət əlaqəsi yaratmaq fikrində idi. Xülasə, qoşunun bir hissəsini Dərbənd qalasının mühafizinə təyin edib, eylulun (sentyabrın) əvvəllərində geri qayıtmağı qərara aldı. Heç bir hadisə üz vermədən Aqraxan səngərinə çatdı. Aqraxan çayının Sulaqdan ayrıldığı yerdə, Səlib qalası adlı bir şəhər bina etdi. Bu yerin suyu, otu və meşəsi olduğundan dağıstanlıların təcavüzünün qarşısını almaq və Dərbənd yolunu qorumaq üçün böyük əhəmiyyəti vardı. Gəmilərin hərəkətini təmin etmək üçün Sulaq çayında iri sütunlar və ağaclardan böyük bir bənd bağladı ki, Aqraxan çayının suyu artsın. Bu ağacların bəzisi indi də suyun içərisində görünməkdədir.

Don kazaklarının atamanı Krasnoşşekov, 1000 nəfər kazak və yeni gəlmiş 40000 qalmıq ilə Həmri mülkünə gedib, bir çox qətl və qarət edərək 350 nəfəri əsir və 11000 qaramal gətirdi. İmperator Gürcüstan valisinə və ermənilərin böyük

xəlifəsinə də elçi və məktublar göndərdi. Nəvaziş izhar edib, özünün yenə oralara gələcəyi haqqında xatircəmlik verdi. Səlib qalasında mühafizlər təyin etdikdən sonra, bütün süvari qoşunu quru yol ilə yola saldı. Özü də Aqraxan bəndlərini çox möhkəmləndirib, sentyabrın 26-da gəmi ilə təcili surətdə Hacı Tərxana getdi. Onun ardınca piyada qoşunu da general-admiral qraf Apraksini gəmilərlə yola saldı. Qoşun yolda tufana düşərək, çox çətinliklər çəkdi.

Pyotr təşrini-əvvəlin (oktyabrın) 4-də Hacı Tərxana gəlib çatmışdı. Gilan hakiminin himayə xahiş edən ərizəsi yetişdi. 5 gün içərisində gəmilər hazırlandı və səfər tədarükü görüldü. Həmin ayın 10-da polkovnik Şipov və Soymonov iki batalyon saldatla Gilana getdilər. Pirəbazar bəndərinə çatdıqdan sonra, Yazıkov ordunu aparmaq üçün arabadan ötrü Rəştə göndərildi. O zaman, Təhmasib Mirzə tərəfindən rus padişahı dərbarına vəziri-əzəmin mülazimi İsmayıl bəy elçi təyin edilmişdi. O, Talış dağlarından keçərkən, dənizdə rus gəmilərini görüncə, Gilana qayıdıb Rəştə getdi. Buranı əhalisi, Gilan vəzirinin evində məsləhətləşdikdən sonra cavab verdilər ki, İran padişahının icazəsi olmadan, rus qoşunlarını öz ölkələrinə buraxa bilməzlər. Buna görə də, gəmidə qalmağı onlara təklif etdilər.

Ruslar Pirəbazarı aldılar. Gilan vəziri polkovnik Şipov ilə görüşdü. Onların rus padişahı əmrilə, himayə üçün gəldiklərinə xatircəm olunca, polkovniki bir dəstə qoşunla Rəştə aparıb şəhərin kənarında bir karvansarada yerləşdirdi. Lakin sülh etmək meyli olmadığından, elçini (İsmayıl bəyi) cürbəcür bəhanələrlə Rusiyaya getməyə qoymurdu.

Hicri 1135-ci (=1722) ildə, təşrini-axırın (noyabrın) 23-də, Mir Mahmud İsfahanı aldıqdan sonra, Şah Təhmasib Qəzvində taxta oturdu. Vəzir, elçini göndərməmək xüsusda onun hüzuruna bir ərizə yazdı və cavabına müntəzir oldu. Ruslar bu əhvalatdan xəbər tutaraq cürbəcür vasitələrlə elçini gəmiyə aparıb saxladılar. Şah tərəfindən qasid gəldiyi zaman konsul Avramov gizlicə onun istiqbalına çıxdı. Hiylə və təmahsiləndirmək vasitəsilə fərmanın məzmununu bildi. Fərmanda elçinin göndərilməsi əmr olunurdu. Beləliklə, qasid o qədər yubatdı ki, ta Soyvorov elçini kanun-saninin (yanvarın) əvvəllərində, «saat xoşdur» bəhanəsilə gecə yarısı, iki gəmi ilə yola saldı. Gilan vəziri, fərmanı aldıqdan sonra, elçinin göndərilməsindən xəbərdar olub qəmgin oldu. O, həkimlərin və yerli əhalinin məsləhəti ilə, müharibə tədarükü görmək və qoşun toplamaqda idi. Polkovnik Şipov da tədriclə Pirəbazardan müharibə ləvazimatı və sursat gətirib öz işini görürdü.

Mart ayında, Saymonov öz məmuriyyəti mucibincə şəhər üçün yer intixab etməkdən ötrü, gəmilərdə bir dəstə qoşunla Kür çayı ağzına getmişdi. Bu zaman, gilanlılar rus qoşununa geri qayıtmağı təklif etdilər. Polkovnik onlara belə cavab verdi: Əvvəldən, getmək üçün gəmilərimiz yoxdur, ikincisi də, bu təklifi bizə İran padişahı etməlidir. Axırda iş müharibə ilə nəticələndi. Gilanlılar əllərində olan 4 top ilə, bütün günü karvansaranı topa tutdular. Polkovnik gündüz sakit durdu, gecə 1000 nəfər saldat göndərdi. İki tərəfdən şəhərin üstünə elə töküldülər ki, gilanlılar

özlərini toplaya bilmədilər, bir çoxları öldürüldü, qalanları da qaçdılar. General-mayor Levaşovun komandası altında yeni qoşun gəldi, şəhəri aldılar və onun qərb tərəfində, Qəzvin yolu üzərində bir qala bina etdilər. Şərq tərəfdən də karvansaranı qala kimi bərkitdikləri üçün şəhər arada qaldı.

Həmin il təmuz (iyul) ayının 6-da, general-mayor Matyuşkin 9 gəmi ilə Bakı bəndərində lövbər atdı. Bu gəmilərdə 4 polk qoşun var idi; polk o zaman, 1000 nəfərə yaxın əsgərdən ibarət idi. Sonra, İsmayıl bəyin Şah Təhmasib adından Bakı əhalisinə yazmış olduğu məktubu göndərdi. Məktubda qalanın təslimi təklif edilirdi. Sultan və Bakının əyanları elçiləri şəhərə buraxmadılar...

Ayın 21-də general sahilə qoşun göndərdi. Şəhərdən də bir çox süvari bayıra çıxıb, müharibəyə girişdilər və məğlub olaraq geri döndülər. Ruslar səngər düzəltməyə məşğul oldular, yeddi gəmi də yaxınlaşıb, qalanın toplarını susdurdular. Qumbaraların atəşindən şəhərə böyük yanğın düşdü, qalanın hasarı bir yerdən dağıldı. Ayın 26-na təyin edilmiş yürüş, şiddətli tufan nəticəsində mümkün olmadı və gəmilər pərakəndə düşdü. General yenə təslim haqqındakı danışığı təzələdi. Şəhər alındı, 72 top, barıt, güllə və sair bir çox ləvazimat ələ keçdi. 700 nəfərdən ibarət olan qala mühafizləri, öz sərkərdələri Dərgahqulu bəylə Rusiya dövlətinin xidmətinə daxil oldular. Ölkənin hökuməti Dərgahqulu bəyə həvalə edildi. Şəhərin qalabəyisi - sultanı, Dərgahqulu bəyin təhrikilə, Davud bəyin dostudur deyə həbsə alınaraq Rusiyaya göndərildi. Dərgahqulu bəy, axırda xəyanətdə müttəhim edilərək, işdən kənar edildi, rus komendantları hökumət işlərini öz əllərinə aldılar.

Yazılı mənbələr və şifahi xəbərlərdən anlaşıldığı üzrə, Dərgahqulu bəy ibni-Heybət bəy ibni-Məhəmmədhüseyn bəyin keçmiş babaları... gilanlı Xan Əhməd hadisəsi zamanında, hicri 1000-ci (=1592) ildə, Şirvana gəlib Bakıda mülk sahibi və yüzbaşı rəisi olmuşdular. Onların imarət və qalalarının xarabaları Ramana kəndində indi də mövcuddur. Xalq arasında belə bir rəvayət məşhurdur ki, Əmir Hasan, Bülbülə və Ramana kəndləri xan kəndidir.

Dərgahqulu bəy keçmiş zamanda Bakı sultanını öldürüb xan ləqəbilə hakimiyyətə keçmişdi. Cürbəcür tədbir, vəsilə və əhalinin ittifaqı ilə şahın dərbarı tərəfindən də təsdiq olunmuşdu. Buna görə, yeni sultan ancaq qalanın komendantlığı vəzifəsilə kifayətlənirdi.

Davud bəy və Surxay bəy Bakını almaq istəyirdilər. Lakin, Dərgahqulu xan ləzgi qoşununu, şəhərin yarım ağaclığında, o zamandan bəri Qanlıtəpə adlanan bir təpə yaxınlığında pis bir surətdə məğlub etdi. Dərgahqulu xanın qardaşı Hüseyncan bəy də bu davada öldürüldü. Bundan sonra Şabran və Qabıstan mahallarında çapqınçılığa başlayıb, gündən-günə şöhrət tapdı. Ruslar gəldiyi zaman, şəhəri təslim edib, əvvəlki vəzifəsinə təyin edildi. Dərgah xanın hökumət mərkəzi Məşqətə kəndi olub, bağı, imarəti və ovdanları indi də buradadır. Onun qüvvəti və şücaəti xalq arasında məşhurdur. Dərgah xanın, Abdulla bəy Hacı Səlim bəy oğlunu Bakı mahalına hakim təyin etməsi haqqındakı fərmanının tarixindən və sair

maddələrdən anlaşıldığına görə, onun hökmranlığı hicri 1143-cü (=1731) ildə də davam edirmiş. Lakin onun hansı ildə rus dövlətindən üz çevirib, bir dəstə tərəfdarları ilə bir müddət Bakı və Şirvan ətrafını çalıb-çapdığı və sonra gedib İran qoşununun əmirləri sırasına keçməsi məlum deyildir. Hicri 1151-ci (=1738) ildə Nadir şahın qardaşı İbrahim xan Carda öldürüldüyü zaman, o da yaralanıb Zəncanda vəfat etmişdir.

Həmin il eylül (sentyabr) ayının 12-də, bir çox danışıqlardan sonra, hökumət mərkəzi olan Peterburqda, İsmayıl bəy Şah Təhmasib adından rus dövləti başçıları ilə bir müahidə bağladı. Astarabaddan Dərbəndə qədər uzanan bütün sərhəd boyu Rus dövlətinin ixtiyarına keçdi. Rus padişahı da, Şah Təhmasibə kömək etməyi öhdəsinə aldı.

Osmanlı dövləti Şirvan və Azərbaycan ölkələrinə yiyələnmək fikrində idi. Müharibə elan etməklə, rus padişahının sərhəd boyundakı vilayətlərə sahib olmaqdan saxlamaq istəyirdi. Vəziri-əzəm İbrahim paşa isə, Rusiya dövləti ilə dostluq arzusunda olub, müharibəyə razı olmurdu. Buna görə, elçi göndərib Rusiya dövlətindən xahiş etdi ki, İran ölkəsini tutmaqdan çəkinib, Hacı Davud bəyi də Şirvan hakimi tanısın. İmperator, dostcasına mülayim cavablarla elçiləri geri qaytardı. Lakin, Gilanın alınması xəbəri Osmanlı dövlətinə çatınca, vəziri-əzəm vasitəsilə təkrar elçi gəlib, bu hadisənin səbəbini soruşdu. O yenə cavabında dedi: mən Rum dövləti ilə əhdnaməni pozmaq fikrində deyiləm, qoşunu da İran ölkələri ələ keçirmək üçün deyil, bəlkə quldurlardan intiqam almaq və məzlum şahı himayə etmək üçün göndərmişəm. Lakin, gizlicə olaraq, Mlaros vilayətləri bəylərbəyisinə fərman yazdı ki, Rum və Krım sərhədlərində 70-80 min qoşun hazırlasın.

Rumlular (türklər) da o tərəfdən Ermənistanı, Gürcüstanı və Şirvanın bir çox yerlərini tutdular. Axırda bu qərara gəldilər ki, hər iki dövlət sahibsiz İrandan aldıqları torpağı öz əllərində saxlasınlar.

Bu zaman, Osmanlı dərbarında olan rus dövləti səfiri Bonakın vasitəçiliyi və Rum dövləti vəziri-əzəmi İbrahim paşanın bacarığı sayəsində, Qostəntiniyyədə (İstanbulda) hicri 1137-ci (=1725) ildə, həziran (iyun) ayının 27-də, iki dövlət (Rusiya ilə Osmanlı dövlətləri) arasında sülh müqaviləsi bağlandı. Bu müqaviləyə əsasən Astarabad, Mazandaran, Gilan, Bakı, Səlyan və Dərbənd vilayətləri rus dövlətinə verildi, Şirvanın qalan hissəsi, Ermənistan və Gürcüstan da Osmanlı dövlətinə çatdı. Şamaxı ilə Bakı arasında sərhəd təyin edildi.

Bonakın qardaşı oğlu, bu sülh xəbərini imperatorun dərbarına gətirdiyindən, padişahın lütf və ənamına nail oldu. Rumyansev də üç dövlət arasındakı hüdudu təyin etməyə məmur oldu. Ona tapşırıldı ki, İran və Türkiyəyə gedib, gizli olaraq, Gürcüstan yolunu öyrənsin. Kür çayının vəziyyətini təyin etsin. Ermənistan və Gürcüstanın əsgəri qüvvəsini və məzkür yol üzərində azuqə və ot-ələf əldə etmək imkanlarını aydınlaşdırsın. Gürcüstanın Kuban tərəfindən nə vəziyyətdə olduğunu və məsafəsini müəyyən etsin, erməniləri Gilanda, müsəlmanların məskənlərində və yurdlarında vətən salmağa təşviq etsin.

Bu əsnada Səlib qalası tamam oldu, Sulaq çayının suyu Aqraxan çayına axdı. İmperator general-mayor Kurpatova fərman yazdı ki, Terek şəhərin köçürüb oraya aparan və Aqraxan səngərini dağıtsın.

Şamxal Səlib qalasının tikilməsindən qorxuya düşdü. Həm də müahidə bağlayıb, ona vədlər verən osmanlıların təhrikilə 30 min qoşun götürüb gəldi və Səlib qalasını mühasirə etdi. Lakin o, məğlub olaraq geri qayıtdı. Kuropatov onun bütün məmləkətini və hökumət mərkəzini viran etdi. Bu hadisədən sonra, imperator şamxallıq mənsəbini ləğv edərək, onun məmləkətinin ixtiyarını Şirvanda hökmran olan generala həvalə etdi. Rus ordusuna gələn Şamxal Adil Gəray xanın özünü də əsir edib Rusiyaya göndərdilər. Ömrü orada tamam olub öldü.

Hicri 1138-ci (=1725) ildə, təşrini-saninin (noyabrın) 9-da, Rusiyaya getmiş olan bu yerlərin sərdarı general-leytenant Matyuşkin qayıdıb Bakıya gəldi və burada, podpolkovnik Zimbulatovun hadisəsi ilə tanış oldu. Zimbulatov, öz batalyonu ilə gedib Kür çayı sahilində, o yerin hakiməsi, Səlyan sultanı Həsən bəyin hərəmi - Qəbuli xanımın sarayı qarşısında ordugah qurdu. Müəyyən bir şəhər salmaq üçün tədarükdə idi. Qəbuli xanım, dostluq və ixlas göstərib, bir gün onu bütün zabitləri ilə bir yerdə qonaq çağırdı. Xörək yeyildiyi zaman, otağa müsəllah adamlar girib, onların hamısını öldürdülər. Əsgərlər bu halı görüncə, orda qalmış olan bir xəstə zabitlə, öz gəmilərinə minib, Bakıya qayıtdılar. Təəccüblü burasıdır ki, Pyotr qabaqcadan bu xüsusda general Matyuşkinə yazıb bildirmişdi ki, «Səlyan hakiməsi xanım oğruların böyüyüdür. Ondan ehtiyatlı olmaq lazımdır ki, bir bədbəxtlik üz verməsin».

General Matyuşkin 300 nəfərlə Kür dəhnəsinə gedib, şəhərin yerini gözdən keçirtdi və Gilana getdi. General-mayor Levaşovun orada 6 batalyon saldatı, 500 nəfər draqunu, bir neçə dəstə erməni, gürcü və Don kazakı da vardı. Kəskər vəziri 20000 qoşunla qarşıda müharibəyə hazır olmuşdu. General Matyuşkin bir nəfər Ərdəbilə, Şah Təhmasibin hüzuruna göndərib, İsmayıl bəylə bağlanan əhdnaməyə əsasən tələb etdi ki, vəzirləri müharibə etməyə qoymasın. Lakin cavab alınmadı, çünki şahın dövlət başçıları bu sülhü qəbul etməyib İsmayıl bəyi xain hesab edirdilər. İsmayıl bəy də rus himayəsi sayəsində Gilanda qalmışdı. İranlılar karvansaranın üzərinə hücum etdilər. Bir batalyon saldat və üç dəstə draqun onları məğlub edib təqib etdilər və bir çoxlarını öldürdülər. Bundan sonra da Astara vəziri və başqaları bunların köməyinə gəldilər. İranlılar iki ay, neçə gündən-bir müharibə etdilər. Lakin bu müharibələrin hamısında məğlub oldular. Axırda, elə qorxdular ki, əsla müharibəyə gəlmədilər...

Bu zamanlar ruslar Bakıdan gedib Səlyanı da ələ keçirdilər və orada kiçik bir qala tikdilər. Həsən bəy qaçıb Dağıstan və Şirvan quldurlarına qoşuldu. Bu zaman, iqtidar və şövkətcə Hacı Davuddan yüksək və onun Şirvanda hökmranlıq sürməsindən narazı olan qaziqumuqlu Surxay bəy, bir çox vəsilələrlə Osmanlı hökumətindən Şirvana hakim olmaq fərmanını öz adına aldı. Xalq ləqəbilə

hökmranlıq bayrağını yüksəltdi. Sarı Mustafa paşa Gəncəyə təyin olundu. Hacı Davud bəyi Rum ölkəsinə çağırdılar, orada da vəfat etdi.

Hicri 1138-ci (=1725) ildə, təşrini-sani ayının 28-də, Böyük Pyotr 53 yaşında vəfat etdi. O, əzm sahibi və ağıllı, üsuli-idarə və fütuhat fənlərində mahir bir padişah idi. Dəfələrlə Avropaya səyahət edərək, kamalat hesab edib öz şəxsi istedadını artırırdı. O, mülki qanunları və əsgəri intizamı yeni üsul üzrə qurdu. Sülh və müharibə işlərinə fikir verməklə, Rusiyanın qüdrət və şövkətini artırdı. Məşhur Şved kralı (12-ci Kralı) məğlub edərək... Peterburq şəhərini bina etdi. Böyük işlər banisi olduğundan, «Böyük Pyotr» adı ilə məşhur oldu. Vəfatından iki il əvvəl, indiki rus padişahlarına məxsus olan imperator ləqəbini aldı.

Ustryalov[67] öz tarix kitabında yazır: Pyotrun arvadı I Yekaterina ondan sonra Rusiya səltənət taxtına oturdu. O hər xüsusda, o cümlədən İranın dörd vilayətinə aid işlərdə öz ərinin tədbir və qanunlarına əməl edirdi. Mülki işləri inizama salmaq üçün, rusların böyük adamlarından ibarət 6 nəfərlik bir məclis düzəltmişdi. Rum və İran padişahları ilə yeni müahidələr bağladı. Adı çəkilən vilayətlərin bəzi nahiyələri də Rusiyanın ixtiyarına keçdi. Onun vəfatından sonra, hicri 1140-cı (=1727) ildə, may ayının 6-da, Böyük Pyotrun nəvəsi, Alekseyin oğlu II Pyotr 12 yaşında taxta oturdu. İşləri də həmin məclis idarə etməkdə idi. O da, hicri 1143-cü (=1730) ildə, yanvar ayının 18-də vəfat edərək, yerində Böyük Pyotrun dul qardaşı qızı Anna İvanovna səltənətə oturdu.

İran hüdudunda rus hakimiyyətini möhkəmləndirməkdən ötrü, boş yerə məhv olan çoxlu qoşun və puldan başqa, daha bir çox tədarük tələb olunurdu. Çünki bu zaman İranda, adı əməlinə mütabiq olan Nadir adlı bacarıqlı və fateh bir əmir meydana çıxmışdı. O, Azərbaycan və Mazandaran ətrafında, taxtsız və bəxtsiz, sərgərdan və avara dolanmaqda olan Şah Təhmasibin xidmətinə girdikdən sonra, İran işləri başqa bir rövnəq tapdı. Qoşunun intizamı və ölkənin asayişi gündən-günə artıb yüksəldi. Osmanlıların Bağdad yaxınlığındakı külli əsgəri qüvvəsinə elə bir şikəstlik verdi ki, hətta İstanbulun özündə belə qarışıqlıq və inqilab əmələ gəldi: Sultan Əhməd xan taxt və tacından əl çəkdi, Sultan Mahmud xan taxta oturdu.

Bu zaman, İran hüdudundakı əhali həyəcana gəlib, ümumi surətdə hücum edərək, Rusiya ilə müharibəyə başladılar. Ancaq general-mayor Levaşovun bacarığı nəticəsində, Rusiya bu qorxulu hadisədən nicat tapdı. Həmin general öz dövlətindən çoxlu yardım istədi. Lakin imperatriça böyük əmirlərindən Baron Şafirovu sülh arzusu ilə İrana göndərdi. Rəştdə hicri 1145-ci (=1732) ildə, İran vəkilləri ilə olan danışıqdan sonra, bu şəraitdə sülh bağladı: rus qoşunun təxirsiz Gilan və Mazandaran vilayətlərini İran dövlətlərinə qaytarsın, şiddətli bir surətdə

[67] Ustryalov (Nikolay Kerasimoviç) - rus tarixçisidir, 1805-ci ildə anadan olmuş və 1870-ci ildə vəfat etmişdir. Əsərlərindən ən əhəmiyyətlisi «I Pyotrun səltənət tarixi» adlı kitabıdır.

davam edən Rum və İran müharibəsi qurtardıqdan sonra Şirvan və Dağıstandan da əl çəksin.

Bu barışıqda rus dövləti yalnız İran dövləti ilə dostluğu təzələməklə və osmanlıların İrandan çıxarılması ilə kifayətləndi.

## *NADİRİN ƏHVALATI HAQQINDA*

Moğol istilası dövründə, Azərbaycana gəlmiş olan türkmən əfşarlarından Qırxlı tayfası, Şah İsmayıl Səfəvinin zühurundan sonra, köçüb Əbivərd mülkündə, Gürgan çeşməsi ətrafında sakin olmuşdu. Bu tayfadan İmamqulu adlı bir nəfərin hicri 1101-ci (=1689) ildə Nadirqulu adlı bir oğlu oldu. Bu adam, Kosa əhmədli Babaəli bəyin iki qızını bir-birinin ardınca aldıqdan sonra, taytuşları arasında yüksəlib tərəqqi etdi, Nadirqulu bəy adı ilə məşhur olaraq hünər və şücaət tanıdı. Babaəli bəyin vəfatından sonra, sistanlı Məlik Mahmudun xidmətinə daxil oldu. Sonra ondan qaçıb, Əbivərdi ələ keçirdi. Bu iğtişaş dövründə, əfqanlar İran paytaxtını, İraq, Fars və Xorasanı, osmanlılar isə, Azərbaycanın yarısını, Ermənistan və Gürcüstanı ələ keçirmişdilər; ruslar Kaspi sahilindəki vilayətləri tutmuşdular, ləzgilər də Şirvanda asayişi və yolları əmin-amanlığı pozmuşdular...

Bu zaman, Nadirqulu bəy də, təqribən 400 ailədən ibarət Cəəlayir elinin köməyilə hökmranlığa başladı. Tədriclə Əfşar tayfalarını, Əbivərd kürdlərini və elatını, Dərəcəz və Kəlat qalalarını və onların ətrafını ələ keçirdi, Məlik Mahmud və sair ilə müharibə edərək şöhrətləndi, Şah Təhmasibə yaxınlaşıb, Təhmasibqulu xan adı ilə əvvəl qorçubaşı və daha sonra bütün İranın ən iqtidarlı sərdarı və sahib ixtiyar vəkili oldu. Onun fütuhatına mane olan Şah Təhmasibi, hicri 1145-ci (=1732) ildə səltənətdən əzl edərək sikkəni və xütbəni onun südəmər oğlu olan III Şah Abbasın adına vurdurub oxutdu. Özü isə, müstəqil olaraq hökmranlıq etməyə başladı. Rum qoşununu pis bir surətdə məğlub etdikdən sonra, Bağdad hakimi Əhməd paşa vasitəsilə Osmanlı dövləti ilə hicri 1146-cı (=1733) ildə sülh etdi. Həmin dövlətin qanununa müvafiq olaraq, paşalara İran vilayətlərini boşaltmaq haqqında, sultanın mübarək imzasilə bəzənilmiş fərmanlar göndərildi.

Nadirin ordusu Ərdəbilə gəldi. Şirvan hakimi Surxay xana yazılan fərmanı, Astara hakimi Musa xan öz adamı ilə Surxay xana göndərdi. O, fərman gətirən adamı öldürüb, Musa xana nalayiq sözlər yazdı: «Mən Şirvanı ləzgi şirlərinin qılıncı gücü ilə almışam, bağdadlı Əhmədin və başqalarının nə həddi vardır ki, bu cür sözlər danışsınlar». Buna görə əlahəzrət Nadir, bu məğrur adamı cəzalandırmağı lazım bildi. Şirvanı fəth etməyi başqa qalaların alınması üçün açar saydı. Lakin o, Kür çayının kənarına çatanda, Surxay xan Şamaxını buraxıb Dağıstana getdi. Nadir hicri 1147-ci (=1734) ildə, aqustos (avqust) ayının 17-də, Şamaxıya girib, Ərdəbil hakimi Məhəmmədqulu xan Səidlini Şirvana hakim təyin etdi.

Bu zaman eşitdi ki, ləzgilərdən və quldurlardan ibarət bir dəstə, Şamaxının üç ağaclığında olan çətin keçidli və Mici adlanan yerdə toplanıb, fəsad törətmək üçün fürsət axtarırlar. Onları dağıtmaq üçün bir dəstə göndərildi, diri və ölü olaraq onlardan 500 nəfər ələ keçdi. Əsirlərin azad edilməsi haqqında hökm çıxdı. Şirvan bəylərbəyisi onların hamısını sahiblərinə yetirdi.

Bu əsnada xəbər çatdı ki, Surxay xan ləzgilərdən və sairdən mürəkkəb böyük bir dəstə ilə Qəbələdə müharibə tədarükündədir. Nadir ordunun çadırlarını və yüklərini oğlu Rzaqulu Mirzə ilə bərabər Şamaxı qalasında qoydu. Eylul (sentyabr) ayının 6-da, yüngül topxana və 12000 süvari ilə, Surxay xanın sığınağı və qərargahı olan Qaziqumuqu almaq üçün hərəkət etdi. Bu yer Dağıstanın içərilərində, Şamaxının on mənzilliyində idi. Fars sərdarı Təhmasibqulu xana da buyurdu ki, özündən üç gün sonra, 12000 qoşunla Surxay xanı cəzalandırmaq üçün Qəbələyə getsin. Kürə ölkəsi mahalından olan Qəbirekin bir mənzilliyində elə bir xəbər yetişdi ki, Car və Tala ləzgiləri, Mustafa paşa, Nur paşa və Fəth Gəray Sultan səkkiz min rumlu (osmanlı) və tatarla Gəncə valisi Əli paşanın əmri ilə Qəbələdə olan Surxay xanın köməyinə gəlmişlər. Ümumiyyətlə, Surxay xanın başına 20000 qoşun toplanmışdır.

O, Təhmasibqulu xanın eşitməsindən daha əvvəl, Qəbələ ilə Şamaxı arasında, bir tərəfdən dağa, o biri tərəfdən də meşəyə bitişik olan Dəvəbatan adlı yerdə öz tüfəngçilərini yol üzərində yerləşdirdi. Onların arxasını da başqa bir dəstə ilə qüvvətləndirdi. Sərdar qoşununun pişdarları bunların birinci dəstəsilə toqquşdu. Meşə arası olduğundan, düşmən qoşununun çoxluğundan xəbərdar deyildilər. İranlılar qarşıya çıxan adamı Surxay xanın qulamı Qarat zənn edib, cəsarətlə hücum edərək onları məğlub etdilər və onların arxasında olan dəstənin üzərinə töküldülər. Ləzgilər zənn etdilər ki, bunlar Nadirin qoşunudur ki, bu cəsarətlə onların üzərinə hücum etdilər. Onların səbri tükəndi, müqavimətdən üz çevirdilər. Bu dəstənin məğlubiyyətindən, Surxay xan və paşaların qoşununun mərkəzi çaxnaşdı və sıraları pozuldu. Onlardan bir çoxu öldürüldü, rumlular Gəncəyə tərəf qaçdılar, Surxay xan isə, Qaziqumuq tərəfinə qaçdı. Bunların bütün ordu ləvazimatı və təchizatı Sərdar qoşununun əlinə keçdi. Bir dəstə də gedib Surxay xanın bina etdiyi və çox abad olan Xaçmaz qalasını qarət etdi, od vurub külə döndərdi. Nadir bu xəbəri alınca, qaçanların üzərinə bir dəstə göndərdi. Amma Surxay xan onun bu yürüşündən xəbər tutdu, basıldığı üçün heç bir yerdə dayanmayıb, həmin gecə Xosrəkdən yuxarıda olan dağ keçidilə ötüb getdi. Göndərilən dəstə səhər çağı buraya gəlib çatdı. Qaçan ləzgi və tatarlara rast gəldilər, onlardan 300 nəfərə qədər öldürüldülər və əsir etdilər. Yol üzərindəki dağlıq yerlərdə olan bütün ilxılar və qoyun sürüləri qoşunun əlinə keçdi.

Xülasə, Nadir 10 gün içərisində ölkənin çətin gedilən uzaq guşələrini, bir çox yerdə piyada vasitəsilə çiyində daşınan toplarla keçib, Qaziqumuğun bir mənzilliyində olan Xosrək kəndinə gəldi. Ertəsi gün buradan hədəfə doğru hərəkət etdi. Yolda ikən Surxay xanın əfv və aman istədiyini bildirən ərizəsi alındı. Nadir

onun sözünə etibar etməyib, Qaziqumuğun alınmasına çalışırdı. Surxay xan Dağıstan əhlindən çoxlu cəmiyyətlə, şəhərin bir ağaclığında, çayın kənarında yerini bərkitdi. Yeganə keçid olan körpü dağıdıb, müdafiə və müharibəyə başladı. Hər iki tərəfdən top və tüfəng atışması qızışdı. Bu zaman Əfqanın Abdallı tayfasının hakimi Qəni xan, öz dəstəsilə çaydan keçməyə məmur edildi. Çox çalışdıqdan sonra, son dərəcə çətin və dar bir yol tapıb, bir anda çaydan keçdilər. Bu halı görüncə, Surxay xan və ləzgilərin ixtiyarı əllərindən getdi, qaçmağa üz qoydular. Nadir ordusu da Abdallı dəstəsinin ardınca çayı keçdi. Qoşun yetişənə qədər ləzgilər özlərini dağa çatdırdılar. Onlardan bir qədəri qılıncdan keçirildi. Lakin Surxay xan bir neçə nəfərlə öz köl-külfətini götürüb Avar ölkəsinə qaçdı. Qaziqumuq şəhəri alındı, Surxay xanın və yerli əhalinin gizli və aşkarda olan xəzinə və dəfinələri ələ keçdi.

Bu zaman, Dağıstan böyüyü olan Xasfulad ibni-Adil Gəray xan ibni-Mürtəzali Şamxal, Nadirin hüzuruna gəlib, yüksək şamxallıq mənsəbinə nail oldu və faxir xələtlərlə təltif edildi. Qulluğa hazır olduğunu bildirib, ölkə əhalisinin taqsırından keçməyi xahiş etdi.

Qış zamanı yaxınlaşdığı üçün Surxay xanın işini tezliklə bitirmək müşkül ili. Nadir bir həftədən sonra, bu vadidə olan mallar toplanan kimi, ləzgi əsirlərini, kişili-arvadlı, şamxala bağışlayıb geri qayıtdı. Axtıpara mənzilinə çatdıqda, məlum oldu ki, ora ləzgiləri qoşunun keçidi olan Samur çayı körpüsünü dağıtmışlar və dağ başındakı Şəhbani qalasını özlərinə sığınaq edib oturmuşlar. Nadir çayın o biri tərəfində düşdü, körpünü düzəltməyə fərman verdi. Gün batana qədər burada çox möhkəm körpü quruldu, axşam vaxtı bütün qoşun oradan keçərək dağın ətəyində mənzil etdilər. Bir dəstə dağa yürüş etməyə məmur edildi, digər dəstə də dağın ətəyindən onların köç külfətləri sığınan yerə yürüş etdi. Ləzgilər davam gətirə bilməyib qaçmağa üz qoydular. Nadir özü bir dəstə ilə qaçanları təqib etməyə başladı. Səhərdən axşama kimi, o nahiyənin vadi və çöllərində onlardan bir çoxunu öldürdü və əsir aldı. Çadırları və yükləri miskincə və Şah dağı yolu ilə Qəbələyə göndərdi. Özü də ertəsi gün Xaçmaz yolu ilə hərəkət etdi. Bu yol işlək deyildi, Surxay xan dağın belindəki bəzi yerləri daş, kərpic və qumla qarışıq əhəngdən düzəldib bir yol salmışdı. Bu yoldan piyadalar bir-bir çox qorxu və xətərlə keçirdi.

Xülasə, həmin il təşrini-əvvəl (oktyabr) ayının 3-də, Qəbələ mahalının Qutqaşın kəndinə gəldi. 3 gündən sonra, çadırlar və yüklər Şah dağı yolundan, böyük ordu da Şamaxıdan gəlib orada ordugaha yetişdilər. Həmin ayın 11-də, Ərəş qarşısındakı körpüdən keçib, Gəncəni almağa hərəkət etdi. Təşrini-əvvəlin (sentyabrın) 13-də, Gəncənin Kəlisa kəndi tərəfində ordugah saldı. Rumlular (osmanlılar) və tatarlar şəhəri boşaldaraq qalaya çəkildilər. Bu tərəfdən də qalanı almaq üçün tədarük görüb, səngərlər və xəndəklər qazdılar. Birdən-birə, qalanın altına 7 yerdən müxtəlif lağımlar çəkmişdilər. Rumlular bu lağımların birindən xəbər tutub onu dağıtdılar. İranlılar 3500 batman barıtla doldurulmuş qalanı 6 lağıma, tədriclə od vurdular. Bu hadisə zamanı, Gəncə hakimi Əli paşanın oğlu

Ömər ilə mühafizlərdən 700 nəfər öldü. Rumlular da səngərin yanına qədər iki lağım qazmışdılar. Mühasirə edənlər bunlardan birini ləğv etdilər. O biri lağımın yanması nəticəsində, cəzairçilərdən 40 nəfər tələf oldu. Bir neçə dəfə də, iki tərəfin lağımları bir-birinə təsadüf etdi. Lağımçılar bu dar yerdə əlbəyaxa döyüşə başladılar.

Bir gün rumlular əl qumbaraları ilə qaladan çıxıb, onları səngərdəkilərin üzərinə yağdıraraq qılınc və tüfəng ilə hücuma keçdilər. Səngərdəkiləri meydanın sonuna qədər qovdular. Mühasirə edənlər güc gətirərək, mühasirə olunanları səngərdən çıxarıb qalaya soxdular. Dörd aydan artıq, iş bu qayda üzrə davam etdisə də heç bir nəticə əldə edilmədi. Sonra, möhkəm bir sədd bağlayıb, çayın suyunu qalaya tərəf çevirdilər. Şirhaci divarı və cənub-şərq tərəfdəki hasar və burclar uçuldu. Qalanın yarısını su basdı, bu halda suyun gücündən və rumluların top gülləsi zərbəsindən sədd bir yerindən zədələndi və su kənarına axmağa başladı. Bunun yatağı şəhərin yarım ağac şimal tərəfində indi də bəllidir.

Bu əsnada, Car və Tala ləzgilərinin rəislərindən bir dəstə gəlib, söz verdilər ki, 20 günəcən Nadirin ordusuna xidmət etmək üçün bir dəstə adam göndərsinlər. Lakin vədələrini yerinə yetirmədilər, buna görə də ordugahdan bir fovc ayıraraq, Ağdam hüdudundakı qoşun və xanlardan bir dəstə ilə o tayfanı cəzalandırmağa göndərdilər. Kaxetiya gürcüləri də İmamqulu xanın oğlu Əli Mirzəni sərkərdəliyi ilə, o tərəfdən bu işə məmur etdilər. Öz məskənlərini boşaldıb, Əlbürz sıra dağlarında uca bir dağın təpəsində sığınmış olan ləzgilər, qəflətən hücum edərək, göndərilən qoşunun bir hissəsini öldürdülər və özləri də bir qədər tələfat verdikdən sonra geri qayıtdılar. Bir bu hadisəyə görə, bir də ləzgilərin sığındıqları yer çox çətin və yolu ancaq möhkəm ağaclarla tutulmuş buzlu bir keçiddən ibarət olduğu üçün, xanlar yürüşdən əl çəkdilər. O tayfadan tutduqları 150 nəfəri öldürməklə kifayətlənərək, ələ keçən var-yoxlarını qarət edib geri qayıtdılar.

Bu hadisələr əsnasında, Nadir keçmişdə aralarında bağlanan əhdnaməyə görə, Bakı və Dərbənd qalalarının boşaldılmasını, daimi surətdə hüzurunda olan rus elçisindən tələb etdi. Hicri 1147 (=1735) ildə, Novruz günü, Rusiya ilə əhdnamə bağlandı. Səlyana, Bakıya və Dərbəndə hakimlər təyin edildi. Rusiyanın əlində olan əsirlər geri alındı. Rus əsgərləri və onlar ilə əlaqədar adamların da zəhmət və əziyyətsiz iki tərəfin sərhəddi olan Sulaq çayına qədər göndərilməsi qərara alındı.

Şamaxı şəhəri və qalası münasib bir yerdə olmayıb, düşmən hədəfi altında idi. Hicri 1148-ci (=1735) ilin may ayında, buranın 4 ağaclığında, mövqe etibarilə çox əlverişli olan Ağsu adlı yerdə yeni şəhərin əsası qoyuldu. Az bir zamanda hasarlar və burclar tikdirildi. Şəhərin qədim əhalisi bu yeni şəhərə köçürüldü, bura Şirvan hakimlərinin mərkəzi oldu.

Gəncənin mühasirə müddəti uzandı; mühasirədə qalanlar Sərçəkər Abdulla paşaya bel bağlayaraq, qalanı müdafiə etməkdə mətanət göstərdilər. Bu işi bitirmək üçün əvvəlcə Sərsəkərlə məsələni ayrıd etmək lazım idi. O isə Qarsdan hərəkət

etmirdi. Buna görə, Nadir Gəncə mühasirəsini davam etdirmək üçün, orada bir dəstə qoşun saxladı, bir dəstəni də Ağdaşa qoyub əmr etdi ki, əgər Car, Tala və ya Dağıstan ləzgiləri bir fəsad törətsələr Şirvan bəylərbəyisi və o nahiyənin hakimləri ilə onları cəzalandırsınlar. Özü də, 15000 qoşun götürüb, Sərəskər ilə müharibə etmək üçün Gürcüstanın Lori yolundan Qarsa hərəkət etdi.

Sərəskər qarşı durmaqdan çəkinib, Qars şəhərinə çəkilmişdi. Nadir bir gecə, tələsik, şəhərin kənarından köçüb İran tərəfinə qayıtdı. Sərəskər bu hadisədən cəsarətlənib, 100 minə yaxın qoşunla onu təqib etməyə başladı. İrəvan yaxınlığında böyük və şiddətli bir müharibə başlandı. Sərsəkər məğlub oldu, paşalardan və qoşunlardan bir çoxu öldürüldü. Bu parlaq qələbədən sonra Gəncə, Tiflis və İrəvan rumluları aman istədilər. Qalaları topxana və əsirlərlə bərabər təslim edərək çıxıb getdilər.

Bu dövrün hadisələrindən biri də budur ki, Dağıstan ləzgilərindən bir dəstə, üsyan məqsədilə Quba camaatı ilə birləşib, buranın hakimi Hüseynəli xan Sultan Əhməd xan oğlunu Xudat qalasında mühasirəyə aldılar. Şamxal Xasfulad xan və Dərbənd hakimi çoxlu bir cəmiyyətlə köməyə gəldilər, üsyançılardan 300 nəfərə qədər öldürüldü və əsir alındı, sağ qalanları qaçmağa üz qoydular.

Şamxal gəlib Dərbənddə olduğu zaman, Avar üsmisi Əmmə xan onun ölkəsi üzərinə yürüdü. Pəravül kəndi yaxınlığında onun tərəfdarları ilə müharibəyə girişdi. Üsmi özü bir dəstə ilə bərabər öldürüldü, sağ qalanlar nicatı qaçmaqda gördülər.

Nadir hicri 1148-ci (=1735) ilin yay fəslində, İrəvan yaylağında olduğu zaman, Mirzə Kafi Nəsirini, Rusiya səfirliyinə təyin etdi, onunla bir fil və bəzi hədiyyələr də göndərdi. Özü isə Gürcüstan işlərini yoluna qoymaq üçün Tiflisə gəldi. Burada Krım valisinin gəlməsi xəbərini aldı.

Bu hadisənin təfsilatı belədir: Abdulla paşa sərəskərliyə təyin edildiyi zaman, Krım xanı adına da sultanın fərmanı sadir oldu. Onun Dərbənd yolundan münasib qüvvə ilə Şirvana getməsi qərara alındı. Nadir bu işdən xəbərdardı. Şirvan bəylərbəyisi Əliqulu xanı qabaqcadan başqa dəstələrlə Dərbəndə təyin etmişdi ki, əgər Krım xanı o tərəflərə gəlsə, üz-üzə müharibədən çəkinsin və yalnız özünü qorusun. Rum padişahı, Sərsəkər Abdulla paşa məğlub edilib öldürüləndən sonra, öz ölkəsinin hüdudunu mühafizə etmək fikrinə düşdü. Bu məqsədlə Gəncənin keçmiş valisi Əli paşanı vəkil təyin etdi ki, gedib yeni sərəskərin xəbərdarlığı ilə iki dövlət arasında əvvəlki hüdudu müəyyənləşdirsin. Bir fərman da Krım xanına yazıb, həmin xanı saraydakı qardaşı oğlu İslam Gəray Sultan vasitəsilə sürətlə göndərdi ki, o, İran tərəfinə hərəkət etməsin. Həmin xanın Sulaq hüduduna gəlməsi xəbəri yetişdiyi zaman İslam Gəray Sultan da varid oldu. Nadir həzrətləri İslam Gəray Sultana getməyə icazə vermədi. Əbdülbaqi xan Zəngənəni Tiflisdə durmağa məmur etdi ki, barışıq üçün gəlməkdə olan Əli paşanı Gəncəyə aparıb, yeni fərmana müntəzir olsun. Özü təşrini-əvvəlin (oktyabrın) 23-də Dağıstana gedib, böyük ordusunu Qınıq çayı kənarında qoydu, Car və Tala camaatını cəzalandırmaq

üçün bir dəstə ilə oraya hərəkət etdi. Onlar qabaqcadan, ucalığı və yolunun çətinliyi ilə məşhur olan bir dağın təpəsində sığınaq etmişdilər. Tüfəngçilər və cəzairçilər ətrafdan yürüşə başlayıb sığınağın bir tərəfini aldılar. Ləzgilər dağların təpələrinə və bucaqlarına dağıldılar, Avarıstanda avara düşdülər. Onlardan bir çoxu öldürüldü və əsir alındı. Mal-qaraları və mənzilləri qarət edilib yandırıldı. Nadir Şəki və Ərəş yolu ilə Şamaxıya gəldi. Burada ikən xəbər yetişdi ki, Krım xanı Dərbənd xaricinə gələndən sonra, Eldar Mürtəzaəli oğlu Şamxalı Dağıstan şamxallığına təyin etmiş, Şirvan əyalətini Surxay xana və Dərbənd hökumətini də üsmi Əhməd xana vermişdir. Öz tərəfdarlarına da 2500 tümən nağd və bir parça qiymətli şeylər bağışlamışdır. Surxay xan da öz oğlunu 500 ləzgi ilə həmin xanın hüzurunda qalmaq üçün təyin etmişdir. Bu əsnada, Krım xanı Nadirin hərəkət xəbərini eşidib, sürətlə Krıma qayıtdı.

Nadir şiddətli qış vaxtında, dağ yolları və mənzillərini qar və buz tutmasına baxmayaraq, Dağıstan xalqını cəzalandırmaq fikrində idi. Bu məqsədlə Altıağac yolu ilə gedib, Dərəkəndi mənzilinə çatdığı zaman, Dağıstan sərdarına bir fərman yazdı. Ondan tələb etdi ki, Dərbənddən Təbərsəranın Dərə mahalına gəlib ərzaq toplamaqla məşğul olsun. Yükləri və çadırları oğlu Rzaqulu Mirzə ilə Şabran yolu ilə göndərdi, özü isə, bir dəstə qoşunla Buduq və Xınalıq qaçaqlarını cəzalandırmağa getdi. Qoşundan 6000 nəfərini Doqquzpara və Axtıpara tərəfinə göndərdi, bir dəstəni də, Qəbir tərəfindən qaçaqların yolunu kəsməyə təyin etdi. O tayfanı qətl-qarət etdikdən sonra, qayıdıb Qurbanın Gilyar adlı mənzilində öz ordusuna yetişdi.

Təşrini-saninin (noyabrın) 11-də Dərbənd qalasının şimal tərəfində onun çadırları quruldu. Burada məlum oldu ki, yeni şamxal Eldar, üsmi və Surxay Qazanış adlı yerdə toplaşıb, Xasfulad xan Şamxalın üzərinə yürümək fikrindədirlər. Buna görə, gecəyə salıb, əvvəlcə Məcalisə yürüdü. Burada olan üsminin oğlu Xan Məhəmməd, ləzgilərlə bərabər Məcalis dərəsinin başını kəsib döyüşə başladı. Onların bir qismi öldürüldü, bir qismi əsir düşdü, qalanları da qaçıb qurtardılar. O mahalın hamısı paymal oldu, çoxlu qənimət və azuqə ələ keçdi.

Nadir ertəsi gün oradan hərəkət edib, mənzilbəmənzil qətl-qarət edərək, Xasfulad xan Şamxala mənsub Kübdən kəndinə gəlib çatdı. Surxay, üsmi və Eldar hər biri bir tərəfə qaçdı. Xasfulad xan isə, öz tərəfdarları ilə hüzura gəldi. Nadir buradan Surxay xanı cəzalandırmaq üçün Qaziqumuq tərəfə yola düşdü. O, kanuni-əvvəlin (dekabrın) 20-də Qaziqumuğun üç ağaclığında olan Şərrat adlı yerə çatdı. Surxay xan da, çoxlu cəmiyyət toplayıb, dağların təpələrini səngər edərək, qoşun keçə bilən bir dərəni tutmuşdu. Nadir dörd tərəfdən yürüş etməyə əmr verdi. Əvvəlcə Əfqan dəstəsi dağın təpəsini ələ keçirdi və müharibə alovu şiddətlənməyə başladı. O biri dəstələr də dağın ətəyindən yenicə hərəkət etməkdə idilər ki, ləzgilər qaçmağa başladılar. Onlardan bir çoxu diri olaraq ələ keçdi.

Vaxt olmadığından Nadir həmin yerdə düşüb, cəzairçilər dəstəsini dağların təpəsini mühafizə etməyə məmur etdi. Eldar, dağıstanlılar və avarlardan mürəkkəb bir dəstə ilə Surxayın köməyinə gəlirdi. O, cəzairçiləri Surxay xanın qoşunu zənn edərək, onların arasına gəldi, adamlarından bir hissəsi öldürüldü və əsir düşdü. İrəli getmək çətin idi. Nadir, Qumuq əhalisindən bir neçə nəfərin aman istəmək üçün gəlməsilə kifayətləndi. Ertəsi gün oradan üsmini cəzalandırmaq məqsədilə Qüreyş qalasına tərəf hərəkət etdi.

Nadir Qaziqumuğa yürüş etdiyi zaman, Aqquşa qazisi əhali ilə bərabər aman istəyərək təslim olmuşdu. Sonra isə, qazi bir dəstəni gizlicə olaraq Surxayın köməyinə göndərmişdi. Buna görə də onu cəzalandırmaq lazım idi. Nadir bir dəstəni bu işə məmur etdi. Qazi də öz adamları ilə döyüşə çıxaraq məğlub edildi. Onlardan bir çoxu qırıldı, qalanları da əsir alındı. Ertəsi gün, qazi etdiyi əməldən peşman olaraq, Nadirin dərbarına gəlib əfv istədi və onun tərəfindən bağışlandı. Aqquşa əsirləri də azad edildilər.

Nadir Qüreyş qalası ətrafına çatdıqda, üsmi öz qızını onun hərəmxanasına yola saldı, mötəbər adamlardan bir neçəsini də əfv diləməyə göndərdi və Nadir tərəfindən bağışlandı. Nadir bu qızı Hüseynəli xan Sultan Əhməd oğluna verdi. Bir müddətdən sonra o dəli olub Qubadan Başlıda olan Əmir Həmzə üsminin evinə getdi.

Doqquzpara ətrafının ləzgiləri peşkəş olaraq 1000 baş at və mötəbər ailələrdən bəzi adamları girov tərzilə Nadirə təqdim etdilər. Təbərsəran kəndxudaları da tələb olunan ailələri vergi toplayanlara (mühəssillərlə) birlikdə Dərbəndə göndərib, xidmət və itaətə hazır olduqlarını bildirdilər.

Nadir, Dağıstan işlərini bu surətlə bitirib, Xasfulad xanı və o ölkənin sair başçılarını ləyaqətli təltifata nail edərək, qayıtmalarına icazə verdi. Sonra, atının cilovunu Muğan səhrasına çevirdi. Qubanı «Həsənqala»sına gəldikdən sonra, bir neçə nəfər yaxın adamları ilə ordudan qabağa düşüb, çətin keçidli altı mənzillik bir yolu bir gecə-gündüzlə keçib, Ağsu qalasına yetişdi. Buradan da kanuni-saninin (yanvarın) 13-də, Muğan səhrasındakı ordugahına gəldi.

Qabaqcadan ölkənin hər bucağına fərmanlar göndərilmişdi ki, hakimlər, əyan, üləma və hər vilayətin rəisi kanuni-əvvəlin 15-də Muğan səhrasında hazır olsunlar. Həmçinin hökm olunmuşdu ki, Kür və Araz çaylarının qovşağı olan Cavad keçidi yaxınlığında, ağac və qamışdan karvansara, məscid, hamam və ali imarətlərlə bərabər 12 min ev tikilsin.

Vilayətlərdən gələnlərin sayı təqribən 100000 nəfərə yaxın idi. Bir aydan ziyadə çəkən müşavirə və danışıqlardan sonra, Nadir həzrətləri hicri 1148-ci (=1736) ildə, şübat (fevral) ayının 26-da İranın səltənət taxtına oturdu.

İran üləmasının ittifaqı ilə ümumxalq qarşısında belə bir qərar çıxarıldı: bəzi məsələləri dəyişdirmək və şərəfli (dini) şəraiti sabitləşdirməklə, iki məzhəb - şiə və sünni məzhəbləri arasındakı ixtilafa nəhayət verilib islam əhalisi arasındakı ədavət

qaldırılsın. Lakin bu məsələ dəfələrlə Osmanlı dərbarına təqdim edildisə də qəbul olunmadı.

Nadir şah mülki işlərdə yeni təyinlər icra etdi, öz qardaşı İbrahim xanı, Qaplankuh hüdudundan başlayaraq Arpa çayına, Dağıstan və Gürcüstanın axırına qədər hökmran təyin etdi. Bu vilayətlərin bütün hakimlərini və əmirlərini onun ixtiyarına verdi. Zənburəkçi xorasanlı yüzbaşı Mehdi bəyi də, xanlıq və əmirül'üməralıq ləqəbi ilə Şirvan əyalətinə təyin etdi.

Bir il sonra, hicri 1149-cu (=1737) ildə, Şirvan bəylərbəyisi Mehdi xan, bir para işləri yoluna qoymaq üçün Dərbəndə getmişdi. Dərbənd hakimi Ustacallı Muradəli Sultanın, keçmişdə onunla ədavəti odduğundan, əhalini həyəcana gətirib onu öldürtdü. Bu işdə iştirak edənlərdən bir parası gedib Əhməd xan üsmiyə pənah apardı, bəzisi də Dərbəndin Narınqalasına çəkildi. Dərbəndin bu işdə iştirak etməmiş qalan əhalisi isə, Narınqalaya çəkilən adamları, hücum edib öldürdülər, Muradəli Sultanı da həbsə alıb şahın dərbarına göndərdilər. O, dərbara gətirilən kimi cəzasına çatdı. Şah tərəfindən Sərdar bəy Qırxlı, xanlıq ləqəbilə Şirvan əyalətinə, Nəcəf Sultan Qaraçorlu isə, Dərbənd hökumətinə təyin edildi və cəzairçilərdən bir dəstə ilə Dərbənd işlərini intizama salmaq üçün oraya getdi.

Şah, üsmi Əhməd xana pənah aparmış olan Dərbənd qaçqınlarının həbsə alınıb Sərdar xana göndərilməsi haqqında bir fərman verdi. Üsmi, fərmana əməl edərək, o dəstənin hamısını sair bir neçə şərir adamlarla bərabər öldürdü. Sərdar xan dərbəndlilərdən bir qismini köçürüb yeni Ağsu şəhərinə göndərdi. Sorsor tayfasını Şirvandan gətirib, Dərbənd qalasında onların yerində oturdu.

Hicri 1151-ci (=1739) ildə, Nadir şah Hindistan səfərində olduğu zaman, Car və Tala ləzgiləri yerlərinin möhkəmliyinə güvənərək üsyan etdilər. Zəhirüddövlə İbrahim xan onları cəzalandırmağa getdi. O, əvvəlcə qalib gəldi, lakin o tayfanın dağ başında səngərlərdə pusquda duran dəstəsi, ətrafdan hücuma keçdi. İbrahim xanın qoşununu məğlub etdilər və onlardan bir çoxu öldürüldülər. İbrahim xanın özü də, tüfəng gülləsi ilə öldürüldü. Bu xəbər Pişavərdə Nadirə yetişdi. O, Əmiraslan xan Qırxlını Azərbaycan əyalətinə və Gürcüstan sərdarı Səfi xan Baqayirini də Azərbaycan sərdarlığına təyin etdi. Əmr verdi ki, özü gələnə qədər həmin tayfanı o tərəfin qoşunları ilə lazımınca cəzalandırıb, nahiyələri mühafizə etsinlər.

Nadir şah Hindistanı fəth etdikdən sonra, Əfqanıstana gəldi. Hicri 1152-ci (=1740) ildə, Nadirbaddan Qəni xan Abdallını, öz tayfası ilə Türküstan səfərindən azad edib Şirvana göndərdi. Ona tapşırdı ki, qış zamanı, Əlbürz dağlarının gediş-gəliş yolları bağlandığı bir zamanda, Car və Tala camaatını cəzalandırsın. Kosaəhmədli Fətəli xanı və Azərbaycanın yeni sərdarı Qırxlı Məhəmmədli xanı da bir dəstə hakim və 15 min Xorasan qoşunu ilə bu işə təyin etdi. Gürcüstan hakimlərini də bunlara qoşdu. Göndərilmiş olan bu qüvvə, hicri 1153-cü (=1741) ildə, şübat (fevral) ayının 23-də, Qanıq çayı kənarına yetişdi. Ləzgilər də Car, Gavıx və Ağzıbir adlı üç yeri möhkəmləndirdilər. Əvvəlcə döyüşə birinci səngər

olan Carda başladılar. Burada müqavimət göstərə bilməyib, Gavıxa çəkildilər. Bir neçə günlük şiddətli və arası kəsilməyən böyük müharibədən sonra ləzgilər üçüncü səngərə çəkilib döyüşə başladılar. Bu yer ağaclıq, meşəlik və uca bir dağ üzərində olub ancaq bir yolu vardı.

Abdallı igidləri könüllü olaraq, qoşunun ön dəstəsində gedirdilər. Səhərdən axşama qədər şiddətli döyüş davam etdi. Hər iki tərəfdən bir çox adam tələf oldu. Ləzgilər daş yumbaladıb, tüfəng atmaqla özlərini müdafiə etdilər, ancaq bundan bir fayda hasil olmadı. Abdallılar gecə yarısına qədər, həmin dağa qalxıb, 100 nəfər tələfat verməklə, o səngəri də tutdular. Şimal tərəfdən qaçmaq yolu ləzgilərin üzünə bağlanmışdı. Onların bir hissəsi başlarını itirib, özlərini dağdan ataraq həlak oldular, qalanları da qılıncdan keçirildi və ya əsir edildi. Yalnız bir neçə nəfəri çıxıb qaça bildi. Onların bütün yurdları və məskənləri talan və təxrib edildi. Əhl və əyalları ilə dağın təpə və dərəsindən qaçmaqda olan camaat Samur çayının kənarındakı Kəsruxi adlı yerə qədər təqib edildi. Onların bir qismini öldürdülər, qalanlarını da köç-külfətlərilə əsir aldılar. Bu nahiyədə abadlıqdan bir əsər və nişanə qalmadı. Dağdan qayıtdıqda, şiddətli tufan nəticəsində qoşundan iki yüz nəfəri məhv və tələf oldu.

Hicri 1154-cü (=1742) ilin baharında, Nadirin qoşunu Buxara və Xarəzmi fəth etdikdən sonra, Dağıstana gəlirdi. Mazandaranın Səvadkuh adlı yerində, Övlad qalası yaxınlığında, bir ağac dalından ona tüfəng atıldı. Güllə sol əlinin baş barmağını yaraladı. Zübdətüttəvarix sahibi münşi mirzə Əbdülkərimin yazdığına görə, təhqiqat nəticəsində məlum oldu ki, bu işdə onun böyük oğlu Rzaqulu Mirzə taqsırkardır. Nadir Hindistan səfərinə getdiyi zaman, Rzaqulu Mirzə İranda naib idi. O, şəxsi mülahizəsinə əsasən, Mirzə Məhəmmədhüseyn Qacarı göndərib Səbzvarda yaşamaqda olan taxtdan salınmış Şah Təhmasibi öldürtdü. Buna görə o, atası tərəfindən məzəmmət edilib, böyük işlərdən kənar edildi. Rzaqulu Mirzə öz gəncliyinə qürrələnib, Tayəminli Nikqədəm adlı qulamı bu işə (atasını öldürməyə) vadar etdi. Nadir şah atalıq şəfqətini toplayıb, şahzadəni kor etdirdi və özünün dövlət çırağını söndürdü. Bundan sonra, Nadir şah hamıdan bədgüman olub, məmləkəti idarə etmək işlərində məsləkini dəyişdi.

Nadir şah, yazın əvvəllərində Qaracadağ və Bərdə yolu ilə Qəbələyə gəldi, buradan da Şah dağı yolu ilə Qaziqumuğa getdi. Bu səfər əsnasında, o hüdudda yaşayan ləzgi tayfalarının bütün rəisləri və sərkərdələri hüzura gəldilər. Təslim və itaət məqsədilə qoşuna lazım olan şeyləri tədarük etməyə başladılar. Nadir təmuz (iyul) ayının 2-də, Qaziqumuğa gəldi və bir ay burada qaldı. Xasfulad xan, Surxay xan, Əhməd xan üsmi, Dağıstan əhalisi və başçılarından bir dəstə hüzura gəlib, qiymətli xələt, at və qızıl şeylərlə təltif edildilər.

Nadir aqustos (avqust) ayının əvvəllərində, Avar üsyançılarını cəzalandırmağa getdi. Onların məskənləri Dağıstanın qurtaracağında, dağların ən çətin yerlərində idi. Əndələl nahiyəsində, Çux kəndi yaxınlığında, şiddətli döyüş vaqe oldu. Bir nəticə hasil olmayıb, çox adam qırıldı. Payız vaxtı yetişmiş

olduğundan, dağlarda gediş-gəliş də çətinləşdi. Buna görə, oradan Dərbəndə hərəkət etdi. Surxay xanı da, köç-külfətilə bərabər öz yanınca buraya gətirdi.

Hərəkət etdiyi zaman, üsmi Əhməd xanı bir dəstə qoşunla Qaziqumuqdan Qaraqaytağa göndərdi ki, Qaraqaytaq qulluqçularının mülazim və ailələrini Dərbəndə gətirsin. Çıraq ətrafında belə bir xəbər çatdı ki, Hapqay dərəsində, Başlıdan iki ağac yuxarıda, üsminin özünün təşviqilə, Qaytaq əhalisindən bir dəstə qoşun üzərinə tökülmüşdür. Bir çoxunun öldürərək, avadanlıq və heyvanlarını soymuşlar. Buna görə Nadir şah üsyançıları cəzalandırmağı və Dağıstan işlərini yoluna qoymağı qət etdi. Tiflis hüdudundan başlayaraq, ta Təbriz və Ərdəbil hüduduna qədər müxtəlif yerlərə adamlar təyin etdi ki, ordu üçün azuqə toplayıb göndərsinlər.

Nadir şah təşrini-əvvəlin (oktyabrın) 1-də Dərbəndə gəldi və ayın 9-da Qaraqaytaq mahalına hərəkət etdi. Dərbənddən başlayaraq Şamxal vilayəti sərhəddinə qədər hər yerdə bir-birindən 2-3 ağac aralı, möhkəm qalalar tikdirdi. Qaytaq ləzgilərini düzə buraxmamaq üçün qalalarda əsgəri qüvvələr qoydu. Təşrini-saninin (noyabrın) 4-də, Dərbəndin üç ağaclığında, şimal tərəfdə qışlaq üçün sulu və ələfli bir yer seçdi. Hərəmxananı, yükləri və çadırları Dərbənddən buraya köçürdü. Burada ağac və qamışdan evlər tikdirib sakin oldular. Bu yer o vaxtdan etibarən İrani-xərab deyə adlanır, çünki İran qoşunu burada çox çətinliklərə düçar olmuşdu. Ətrafdakı ləzgilər, xüsusilə qaraqaytaqlılar, ordunun xaricində və daxilində oğurluq və qarətlə məşğul olub, gediş-gəlişə və ləvazimat tədarükünə mane olurdular. Nadir şah bahar fəslində, mayis (may) ayının 17-də, əvvəlcə Təbərsəran əhalisini cəzalandırmağa başladı. Əlindən gəldiyi qədər, yurdlarını yandırıb qarət etdi və əkinlərini dağıtdı. Bundan sonra, Dağıstanın sair mahallarında sığınaq və məskənləri olmaqla məşğul oldu. Nadirin qoşunları, qurdun sürüyə və selin binalara tutduğu toyu onlara tutdu.

Şamxal və Surxay xan çox vaxt Nadirin yanında idi. Üsmi Qüreyş qalasında gizlənmişdi. Dağ başında olan bu qalanın ətrafı meşəlik və ağaclar olub, keçilməz dar bir yolu var idi. Nadirin ordusu onun üzərinə yürüş etdi. Şiddətli hücumdan və üç gün davam edən qanlı müharibədən sonra, üsmi Avarıstana qaçdı. Qaladakılar və Qaraqaytaq əhalisi də təslim olub aman istədilər. Daş və kərpicdən tikilmiş bu möhkəm qala (Qüreyş qalası), yer ilə yeksan edildi. Məhəmmədəli xan Qırxlını Dərbənd hakimi təyin edib, qoşunun bir hissəsini də onun ixtiyarına verdi.

Nadir hicri 1155-ci (=1743) ildə, kanuni-sani (yanvar) ayının 28-də Muğana tərəf yola düşdü. Bu zaman qar, yağışın və palçığın çoxluğundan qoşunun çətin vəziyyəti bir dərəcəyə çatmışdı ki, Dərbənddən Kür çayı kənarına qədər olan məsafə 40 mənzil olmuşdu. Nadir burada Heydər bəy Əfşarı xanlıq ləqəbilə Şirvana hakim təyin edib, özü Rum hüduduna getdi.

Bu zaman, keçmişdə Azərbaycan hüdudunda özünü Şah Sultan Hüseynin oğluyam deyə qələmə verən, əsl-nəsəbi naməlum Sam adlı bir nəfər ortaya çıxdı. Azərbaycanda hökmranlıq etməkdə olan İbrahim xan, onu tutaraq burnunu siyirib

buraxdı. O da Dağıstana getdi. İtaətsizlik göstərərək, Avarıstana qaçmış olan Surxay xanın oğlu Məhəmməd burnukəsik Samı əldə bəhanə edərək, başına bir qədər cəmiyyət topladı. Təbərsəran və Dərbənd əhalisini təhrik edərək, Şirvan əhalisilə danışığa və məktublaşmağa başladı. Məhəmmədəli xan əhvalatı Nadirin dərğarına bildirincə, Heydər xan onun köməyinə göndərildi. Dağıstan və Dərbənd əhalisinin vəziyyəti şirvanlılara da təsir etmişdi. Heydər xanı Şabran və Şamaxı arasında tutub həbs və bir neçə gündən sonra öldürüb mallarını qarət etdilər.

Onların dəvətinə görə, Surxay xanı oğlu Məhəmməd xan, Sam Mirzə ilə gəlib, Şabran qalasını mühasirə etdi (bu qalanın hasarlarından bəzisi çayın sol kənarında indi də qalır). O, lağım vasitəsilə, bu gün də asarı görünməkdə olan qala hasarının bir hissəsini dağıtdı. Beləliklə, qalanı alıb Ustacallı Abdal xanı tərəfdarları ilə bərabər öldürdü. Məhəmməd xan, Abdal xanın qızını aldı və ondan II Surxay xan doğuldu. Məhəmməd xan buradan gedib, Şirvanın mərkəzi olan Ağsu şəhərini aldı. Şabran və Təbərsəran əhalisi də, istər-istəməz ona təslim oldu.

Bu zaman, Dərbənd nahiyəsindəki Qəbir qalasının mühafizəsinə təyin edilən muğanlı bir dəstə, yoldaşları olan bir dəstə əfşarı öldürdülər və qalanı ləzgilərin ixtiyarına verib, özləri Məhəmməd və Sama qoşuldular. Məhəmməd xan bu hadisədən sonra, Dərbəndin rəis və şərirlərindən və onların muğanlı yoldaşlarından bəzisini öldürdü, digərlərini də kor edərək Muğana göndərdi, çünki o, muğanlıların fəsad salmasından şübhələnməkdə idi. Özü isə, Dərbəndin qala və bucaqlarını möhkəmləndirməklə məşğul oldu.

İrəvanda olan Azərbaycan sərdarı Aşur xan Əfşar, bu xəbəri eşidincə başındakı cəmiyyətlə Şirvana yürüş etdi. O, Gəncə bəylərbəyisi Camışgəzək Hacı xanla bərabər Kür sahilində Kərim xan Əfşar Muğana məmur edildi, bir dəstə qoşun da Aşur xanın köməyinə göndərildi. Onun ardınca, Şahzadə Nəsrulla Mirzə və Fətəli xan Əfşar 15 min qoşunla Şirvana yürüş etdilər. Əmr mucibincə, Fətəli xanı qabaqca göndərdi ki, Aşur xana qoşulsun. Hicri 1155-ci (=1743) ildə, kanuni-əvvəlin (dekabrın) 24-də, Məhəmməd və Sam, ləzgilər və şirvanlılardan mürəkkəb külli cəmiyyətlə, Şah bağı yuxarısındakı dağın təpəsindən aşağı enib, döyüşə hazırlandılar. Fətəli xan və Aşur xan da buraya çatıb müharibəyə başladılar və qalib gəldilər. Bayraq və naqaraxanaları ilə bərabər 1000 nəfərdən artıq əsir ələ keçirildi. Bu müharibədə Surxay xanın oğlu Məhəmməd yaralandı və sağ qalanlarla bərabər Dağıstana qaçdı. Sam da azacıq bir dəstə ilə Gürcüstana getdi. Xanlar Ağsu qalasını mühasirə edərək, bir neçə gündə aldılar. Qalanı mühafizə etməyə təyin olunan ləzgilərin bir çoxunu əsir tutub şəhəri qarət etdilər. Bu hadisə indi də «Allahdad» adı ilə məşhurdur.

Bundan bir az sonra, Nadir şah Rum hüdudundan qayıdıb, Bərdə ətrafında ələfli və sulu bir yer seçərək, Qışlaq yeri təyin etdi. Burada ağac və qamışdan neçə min ev və ali imarətlər saldırıb yerləşdi. Qışın şiddətli olmasına baxmayaraq, kanuni-saninin (yanvarın) 11-də, subay əsgərlərdən bir dəstə ilə Dağıstana hərəkət etdi. Cavad körpüsündən keçərək, hər yerdə iki mənzili bir etməklə, sürətlə

irəlilədi. Kanuni-saninin (yanvarın) 24-də, Dərbənddən keçib, qoşunu 4 dəstəyə böldü. Buralarda tam xatircəmliklə sakin olan bütün tayfalar, belə bir fəsildə onun buraya gəlib çıxmasını təsəvvür etmirdilər. Nadir şah bu tayfaların hamısını qarət edib, saysız-hesabsız qaramal və qoyun ələ keçirdi. 3-4 gün çalınıb-çapıldıqdan sonra Dağıstan rəisləri və qoşun başçıları Nadir şahın hüzuruna gəlib, onun nəvaziş və ehsanına nail oldular.

Nadir şah qurban bayramı günü, Dərbəndə qayıdıb, buranın işlərini də nizama saldı. Sonra Təbərsəran yolu ilə şübatın (fevralın) 5-də, orduya varid oldu. 20 gün də burada qalıb, ot və ələf az olduğundan, Kürün şimal tərəfinə keçərək, Ərəş mahalında çadırlarını qurdurdu. Hicri 1157-ci (=174) ilin baharında, buradan Şəki yaylaqlarına getdi. Bir zaman orada qaldıqdan sonra, Qurban oğlu Hacı Çələbi ilə bərabər öz məliklərini öldürərək Gələsən-Görəsən qalasına çəkilmiş şəkililərin üzərinə yürüdü və onlarla müharibəyə başladı. Yerin keçilməz və çətinliyinə görə, heç bir nəticə əldə edilmədi. Cevzanın (mayın) axırında və həziranın (iyunun) əvvəlində Qarabağın Xaçın yolu və Miyakuh təriqilə İrəvanın Göycə yaylağına gəldi. Buradan da Rum qoşunlarına qarşı müharibəyə gedib qalibiyyətdən sonra onlarla barışdı.

Həmin il Şirvanda şuluqluq oldu. Şərir və dələduz adamlar əlsiz-ayaqsızların malına və canına qəsd edirdilər. Hakimlər bunların öhdəsindən gələ bilmirdilər. Bu zaman, ixtilal səbəblərindən və Nadirin əhvalından törəyən dəyişiklikdən əlavə, Rum Xandigarı da, məzhəb ixtilafını əldə bəhanə edərək, Dağıstan əhalisini İran hökumətinin əleyhinə təhrik edirdi. Verilən fərmanlar mucibincə o, Əhməd xan üsmiyə vəzirlik mənsəbi, onun oğlu Xan Məhəmmədə paşalıq ləqəbi, Cənqutay bəyi Əhməd xana silahşurluq, şamxallıq mənsəbi və 20 kisə nağd pul, Məsum və Qadı adlı Təbərsəran hakimlərinin hər birinə iki tuğ və 200 tümən nağd pul, zaxurlu Məhəmməd bəyə Zaxur sultanlığı ilə bərabər iki tuğ və bir qədər də nağd pul verərək, bu ölkənin işlərini qarışdırmaq və iğtişaş salmaq fikrində idi...

(Nadir şah) Xarəzm səfərindən qayıtdıqdan sonra, onun beyninə xudbinlik və fatehlik qürurundan əlavə, bədgümanlıq fikri və cürbəcür vəsvəsələr yol tapmışdı. Tərəfdarları ilə gözəl rəftarı tərk edərək, zülm və şiddət göstərməyə başladı. Fədakar əmirlər, xanlar və sədaqətli məmurlar səbəbsiz çək-çevirə salınırdılar, amansız cəlladların qılıncı ilə öldürülürdülər, iqtidarlarından artıq tələbat nəticəsində vergi toplayanların (mühəssillərin) çubuğu altında can verirdilər. Mülki işlər tamamilə nizamdan düşdü. Rəiyyətin əlsiz-ayaqsızları, zalımların təpikləri altında əzildi, bədəfkarların və düşmənlərin arzuladığı kimi, ölkənin hər bir tərəfində iğtişaş və hər bir işdə nizamsızlıq əmələ gəldi. Nadir şahın abad etdiyi İran ölkəsi, özünün zülmündən viranəliyə çevrildi.

Nəhayət, hicri 1160-cı (=1747) ildə, mayis (may) ayının 9-cu gecəsi, Xorasanın Fəthabad adlı mənzilində, Xəbuşanın iki ağaclığında, onun qəhr və

qəzəbinə düçar olmuş qardaşı oğlu Əliqulu xanın təhrikilə, əmirlərindən və yaxın adamlarından bir neçə nəfər onu öldürdülər.

Bu hadisədən sonra, İranın bütün vilayətlərinə iğtişaş düşdü. Şirvan ölkəsi hamısından artıq qarışıqlıq və şuluqluq mənbəi oldu. Buranın hər bir diyarı müstəqil olaraq bir əmiri hökumət mərkəzinə çevrildi.

## BEŞİNCİ FƏSİL

### *NADİR ŞAHIN VƏFATINDAN «GÜLÜSTAN» ADLI YERDƏ VƏ İRAN DÖVLƏTLƏRİ ARASINDA BAĞLANAN SÜLH MÜAHİDƏSİNƏ QƏDƏR*

Nadir şahın öldürülməsi xəbəri ordu içərisində yayıldı. Əfqan və özbək tayfaları sonradan Əfqanıstan şahı olacaq Abdallı Əhməd xanın sərkərdəliyilə, Nadir şahın qatilləri əfşarlarla müharibəyə girib qalib gəldilər. Ordunu qarət edərək öz yerlərinə getdilər.

Nadir şahın qardaşı oğlu Əliqulu xan İbrahim xan oğlu Heratdan Məşhədi-müqəddəsə gəldi və Zöhrab adlı qulamını dünyanın qəribə asarından sayılan Gəlat qalasına göndərdi. O da qalanı qəflətən alıb Rzaqulu Mirzəni böyüklü-kiçikli on beş nəfər Nadir övladı ilə bərabər öldürdü. Nadir şahın oğlanları Nəsrulla Mirzə və İmamqulu Mirzəni, Rzaqulu Mirzənin Şah Sultan Hüseynin qızından olan oğlu Şahrux Mirzə ilə Məşhədə gətirdi. Nadirin oğlanlarını öldürərək, 14 yaşlı Şahrux Mirzəni də, gizlicə qalada həbs edib, öldürdüyü xəbərini yaydı. Bu tədbirlə o, belə xəyal edirdi ki, əgər iranlılar onun səltənətinə razı olmasalar, iki tərəfli bu səltənətə layiq olan şahzadəni əldə saxlamış olsun. Özü də Əlişah adı ilə taxta oturdu. Cavahirat və sair qiymətli şeylərdən başqa, on beş kürurluq nağddan ibarət olan Nadirin xəzinələrini Gəlatdan Məşhədə gətirib israfla puç etməyə başladı.

Bu zaman İsfahan hakimi olan qardaşı İbrahim xan üsyana başladı. 7 ay artıq Mazandaranda olan Əlişah, qardaşını cəzalandırmaq üçün hərəkət etdi. Zəncan ilə Sultaniyyə arasında müharibə vaqe oldu. Bu müharibədə Əlişah məğlub olub Tehrana qaçdı. Qardaşının əmrilə tutulub gözləri çıxarıldı. İbrahim xan, Şahrux Mirzəni Nadirin xəzinələri ilə bərabər ələ keçirmək xəyalilə, öz qardaşı Hüseyn bəyi əmirlərdən bir neçəsilə bərabər Xorasana göndərdi. Xəbər verdi ki, onun bu işdə məqsədi, Şahrux həzrətlərini ata-baba taxtına əyləşdirməkdir; yenə təklif etdi ki, şahzadə gəlib İraqda taxta otursun. Lakin kürd xanları və Xorasan rəisləri şahzadənin getməsini lazım bilməyib, istəmədiyi halda, onu hicri 1161-ci (=1748) ildə, aqustos (avqust) ayının 17-də taxta oturtdular. «Sultani-əzəm» tərkibi (əbcəd hesabilə) onun taxta oturmaq tarixi oldu. İbrahim xan da həmin il təşrini-sanı (noyabr) ayının 24-də Təbrizdə taxta oturdu.

İbrahim xan hər bir ləyaqətsiz adamı işə cəlb edib ona xanlıq ləqəbi verirdi və bunu «təlifi-qülub» (ürəkləri ələ almaq) deyə adlandırırdı. O, Xorasana getmək qəsdilə Azərbaycandan çıxıb yükləri və çadırları, yanında məhbus saxladığı kor Əliş ilə bərabər Qum şəhərinə göndərdi. Simnanın Sürxə adlı mənzilinə çatdıqda, qoşunu dağılmağa üz qoydu. Labüd qalıb yanındakı əfqan tayfası ilə Quma getdi. Qumun mühafizləri dərvazaları onun üzünə bağladılar. O, şəhəri güclə alıb qarət etdi. Qalapur qalasına çəkildi. Qala əhli onun əl-qolunu bağlayıb, hadisəni şahın dərbarına bildirdilər. Şahrux tərəfindən onun və Əlişahın Xorasana gətirilməsi

haqqında hökm verildi. İbrahim xan yolda, Əlişah isə Məşhəd-müqəddəsdə öldürüldü. Şahrux Mirzə də bir neçə vaxtdan sonra dövlət başçılarının əlilə kor edilərək səltənətdən qovuldu.

Şah Sultan Hüseynin qız nəvəsi olan Məşhəd-müqəddəs mütəvəllisi Mirzə Seyid Mühəmməd sədri, II Şah Süleyman adı ilə taxta oturdu. Dövlət başçıları bir neçə vaxtdan sonra onu da kor edib səltənətdən çıxdılar. Şahrux Mirzəni yenidən taxta oturtdular.

Azad xan Əfqan, Xorasanda yüksəliş fikrilə çapalayırdısa da, dövlət və hökumət qapıları onun üzünə açılmırdı. Məhəmmədhəsən xan Qacar İraq, Təbəristan və Azərbaycanı istila edib sikkə və xütbə sahibi olmuşdu. Bu zaman Əlimərdan xan bəxtiyari Kərim xan Zənd ilə İsfahan üzərinə yeridilər. Buranın hakimi Əbülfəth xan qarşıya çıxdısa da, məğlub olub şəhərə qayıtdı. Bəzi danışıqlardan sonra, əhdnamə bağlandı və üçünün ittifaqı ilə Şah Sultan Hüseynin qız nəvəsi Mirzə Əbutürab, III Şah İsmayıl ləqəbilə taxta oturdu. Əlimərdan xan divan vəkalətinə (nazirliyinə), Əbülfəth xan İsfahan əyalətinə, Kərim xan da bütün ölkənin sərdarı təyin edildi.

Kərim xan İsfahandan kənara çıxdığı zaman, Əlimərdan xan Əbülfəth xanı öldürdü. Öz adlı-sanlı, lakin ixtiyara malik olmayan padişahını götürüb, Şiraza hərəkət etdi və Fars vilayətini ələ keçirdi.

Əbülfət xanın öldürülməsindən qorxuya düşən Kərim xan, əvvəlcə Şahrux ölkəsinin sərdarı Məhəmmədəli xanın üstünə gedib onu məğlub etdi, topxanasını və ordu ləvazimatını alıb Kürdüstana üz qoydu. Bu yerləri də fəth etdikdən sonra, İsfahanı almağa yürüş etdi.

Əlimərdan xan Şirazdan müdafiəyə çıxdı, lakin məğlub olub öldürüldü. Kərim xan onun yerinə divan vəkalətinə (nazirliyinə) keçdi. Sonra gedib, Astarabad nahiyələrinin çoxunu aldısa da qacarlar tərəfindən məğlub edilərək İsfahana qayıtdı. Bu zamanlar Şah Təhmasibin oğluyam iddiası və II Şah Sultan Hüseyn adı ilə naməlum bir şəxs zühur edib, Mustafa xan Bekdilinin köməkliyilə İraqa yürüdü. Kərim xan ona qarşı çıxmaq məqsədilə Kirmanşaha gedib qalibiyyət qazandı. Nəsəbi məlum olmayan şah müharibədə öldürüldü. Bundan sonra, Azad xan Urmudan İraqa hərəkət etdi. Kərim xan bu döyüşdə məğlub olaraq İsfahana qayıtdı. Azad xan Pəri qalasını mühasirə edib, sülh ilə aldı. Kərim xanın burada olan qohumlarını, anasını və qadınını min nəfər süvarilə Urmuya göndərdi. Mənzillərin (düşərgələrin) birində, zənd qadınları öz ərlərinin buxov və zəncirlərini qırıb qorovulları dağıtdılar və Kərim xana qoşuldular.

Azad xan qoşununun gəlməsilə Kərim xan İsfahandan Kazrana qaçdı, buradan da gedib Şirazı alaraq yenə İsfahana qayıtdı. Bu zaman Məhəmmədhəsən xan Qacar onun üzərinə yeridi, Kərim xan məğlub olub Şiraza qayıtdı. Məhəmmədhəsən xan gedib, onu mühasirə etdi. Lakin əfqanların dönüklüyünə görə, Mazandarana qayıtmağa məcbur oldu və öz nökərlərinin əlində öldürüldü. Kərim xan yenə gəlib İsfahan, Yəzd və Tehranı alaraq Azərbaycana hərəkət etdi.

İndi də Nadir şahın ölümündən sonra Dağıstan və Şirvanın nə halda olduğunu nəzərdən keçirək. Nadir şahın vəfatından sonra, İran qoşunu bu ölkədən çıxıb getdi. Hər bir vilayətdə bir həşəmət sahibi baş qaldıraraq, istiqlaliyyətdən dəm vurub başqasına tabe olmurdu. Quba və Səlyan hakimi Hüseynəli Xan Sultan Əhməd xan oğlu, Xudad qalasını köçürüb, indiki Quba şəhərinin Qudyal adlı yerində tikdirməyə başladı. İğtişaş zamanında bu ölkənin özbaşına qalan bir çox mahallarını itaətə məcbur etdi.

Dərbəndlilər İmamqulu xanın oğlu Məhəmmədhəsən bəy Qorçunu xanlığa seçdilər.

Nadir şahın yaxın əmirlərindən sayılan bakılı Mirzə Məhəmməd xan Dərgah xan oğlu, Bakı ölkəsini müstəqil olaraq ixtiyarına keçirdi. Şamaxı əhalisi sursat təhvildarı olan Hacı Məhəmmədəli Sufi Nəbi oğlu Zərnəvaini hökumətə keçirdi. Xançobanı tayfasından olan Əskər bəy Allahverdi bəy oğlu Sərkarın oğlanları, Şirvan elatı arasında hakimiyyət bayrağı qaldırdılar. Nuxulu Hacı Çələbi Qurban oğlu istiqlaliyyət bayrağı qaldıraraq, Şəki, Ərəş və Qəbələ mahallarını özünə tabe etdi. O, Nadir şah dövründə Şəkidən göndərilən həvaləcatın (vergilərin) yerinə çatdırılması xüsusunda camaatın vəkili idi. İşinin axırında qaçaq düşüb, 3 il Gələsən-Görəsən qalasında gizlənmişdi.

Nadir dövrünün axırlarında qaçıb Şəki və Şirvan ölkələrində keçinən Pənah bəy İbrahim Xəlil oğlu Cavanşir, ardıcıl davam edən müharibələr nəticəsində xanlıq ləqəbilə Qarabağda hökmranlıq bayrağını yüksəltdi. Əvvəlcə Bayat və daha sonra Tərnaut qalasını bina etdi. Bu qalanın hasar və dükanlarının asarı I Şah Abbasın qışlağı yerində, Şah bulağı adlı çeşmənin yanında, indi də mövcuddur. Bir neçə vaxtdan sonra, erməni məliklərilə düşmənçilik edən Məlik Şahnəzər Vərəndəinin xahişinə görə, indiki Şuşanın yerində Pənahabad qalasını bina etdi. Erməniləri özünə tabe edərək, gündən-günə qüvvətləndi. Xudafərin körpüsündən başlayaraq Kürək çayına və Bərgüşat mahalına qədər yerləri ələ keçirtdi. Bundan əlavə, Qaradağa aid Mığrı və Güney mahallarını, Naxçıvana aid Tatif və Sisyanı, İrəvana aid Tərtər Kolanını və Təbrizə aid olan Zəngəzur və Qapanı tutdu. O bəzən Ərdəbil və sair kimi qonşu ölkələri də özünə tabe edirdi.

Şahverdi xan Ziyad oğlu, Gəncəni öz ixtiyarına almışdı. Qaziqumuqlu Surxay xan, Nadir şah dövrünün sonlarından bəri, hökuməti öz oğlu Məhəmməd xana tərk edərək, şəhərin (Qaziqumuğun) on ağaclığında olan Ketrux kəndində izlətə və ibadətə çəkilmişdi. Üsmi Əhməd xan tez vəfat etdi, şücaət və mətanətilə məşhur olan nəvəsi Əmir Həmzə Xan Məhəmməd oğlu onun yerində üsmi oldu. Şamxal Xasfulad xan, öz hökmranlığında qaldı. Novsal xan Əmmə xan oğlu, Avar mülkünü müstəqil olaraq idarə edirdi. Bunlardan başqa yenə böyük əmirlər var idi ki, onlar da bu qərar üzrə idi; Mehdi bəy Əhmədxan bəy oğlu Cenqutayi, Mehdili əmirliyində bərqərar idi. O, Avar şahları dudmanı şəcərəsindən və bəzi xəbərlərə görə, moğol və tatar nəslindən idi. Hüseynxan bəy Zaxur və İlisu nahiyələrində əmir idi. Sultan Bud övladı İndiri və Yaxsayda hökmranlıq sürürdü. Terlavın

vərəsələri isə, Mıçıqıçda mülkədar idilər. Mürtəzaəli Məhəmməd Məsum oğlu məsumluqda və Mürtəzaəli Rüstəm oğlu Təbərsəran qaziliyində paydar idilər.

Buynaq əmiri Mehdi Mürtəzaəli oğlu o zaman, Xasfulad xan ilə pis rəftar etdiyi və çəkişdiyi üçün Nadir şah tərəfindən Astarabada göndərilmişdi. Nadir şahın vəfatından sonra, Qıpçaq çölünə getdi. Oradan da kalmıq qoşunu ilə gəlib Qazanışın yaxınlığında, iki çay arasında şiddətli müharibə edərək qalib gəldi. Axırda Xasfulad xan ilə barışıb, qabaqkı kimi Buynaq əmirliyinə keçdi.

Hicri 1162-ci (=1749) ildə, Şahsevən Əhməd xan, Ali-Sərkarın oturağı olan qədim Şamaxı şəhəri üzərinə gəldi. Ağa Rəzi bəy Əsgər bəy oğlu üz-üzə döyüşdə onun qardaşı Məhəmmədrza xanı öldürdü. Əhməd xan özü intiqam almaq üçün meydana atıldısa da Ağa Rəzi bəy tərəfindən bərk yaralandı, məğlub olub geri qayıtdı və şəhərin yarım ağaclığında vəfat etdi.

Bu zaman, Gürcüstan valisi İrakli xan, Hacı Çələbinin dəfi xüsusunda məşvərət və məsləhət bəhanəsilə, Gəncəli Şahverdi xan, qarabağlı Pənah xan, qaradağlı Kazım xan, İrəvanlı Hüseynəli xan və naxçıvanlı Heydərqulu xanla Gəncənin yaxınlığında görüşüb, hamısını bir yerdə yaxaladı və əsir etdi. Hacı Çələbi bu xəbəri eşidən kimi, şücaət və igidliyilə Sərkar xanədanının hökmranlığına vasitə olan Ağa Rəzi bəylə ittifaq edib, Gürcüstan valisinin üzərinə hücum etdi. Gəncənin yarım ağaclığında, Qızıl Qaya adlı yerdə onu məğlub edərək, həmin xanları xilas etdi. Sonra valini təqib edib, Qazax və Borçalı mahallarını ələ keçirdi. Oğlu Ağakişi bəy, iki ilə yaxın bu hüdudda hökm sürüb, zülm etməklə məşğul oldu. Tiflis şəhərinin dörd ağaclığında, Paydar adlı yerdə, onun tərəfindən tikdirilən qalanın yeri indi də mövcuddur.

Nəhayət, Gürcüstan valisi çərkəzlərdən və sairədən kömək alıb öz dəstəsini düzəldincə, Ağakişi bəy Şəkiyə qayıtdı. Bir zaman keçəndən sonra, İrakli xan külli tədarüklə Car əhalisinin Gürcüstandan aldığı Nikli tayfasını geri almaq üçün getdi. Hacı Çələbi, Car camaatının köməyinə gəlib, Qanıq çayının sol sahilində, çox şiddətli bir müharibəyə girişdi. Gürcüstan valisi əvvəlkindən daha ciddi məğlub olub geri qayıtdı.

Hicri 1168-ci (=1755) ildə, Hacı Çələbi külli qoşunla Şirvanı almaq məqsədilə gəlib, Ağsu şəhərini mühasirə etdi. Burada olan Hacı Məhəmmədəli xan Quba hakimi Hüseynəli xandan kömək istədi. O da 3000 nəfər Quba qoşunu və 500 nəfər qüvvəyə malik olan Əmir Həmzə üsmi ilə bərabər iki düşməni barışdırmaq üçün gəldi. Hacı Çələbi, Hacı Piri adlı bir nəfəri elçi göndərib, onu hədələdi və geri qayıtmağı ona təklif etdi. Beləliklə, iş müharibə ilə nəticələndi. Şəkinin külli qoşunu bu azacıq camaatın qarşısında məğlub olub, qarət edildi və çoxu öldürüldü.

Hüseynəli xan 3 gün qonaqlıqdan sonra öz hökumət mərkəzinə qayıtdı və hicri 1169-cu (=1756) ildə oğlu Fətəli ağanı qoşunla göndərib, ata-baba mülkü olan Səlyan nahiyəsini, öz qohumu rüdbarlı İbrahim xanın əlindən geri aldı.

Hüseynəli xan hicri 1171-ci (=1758) ildə vəfat etdi. O, cəsarətli, ali himmətli bir əmir idi. Həmişə ölkənin abadlığı və rəiyyətin asayişi fikrində idi. Şirvanlı Ağa Rəzi bəy Əsgər bəy oğlu dərhal gedib Qubanın Bərmək mahalını qarət etdi və 200 ailəni köçürüb gətirdi. Hüseyəli xanın oğlu Fətəli xan, qisas almaq məqsədilə Şirvana hərəkət etdi. Ağa Rəzi bəy qarşıya çıxdı və qədim şəhərin xaricində məğlub edilib öldürüldü. Fətəli xan, bir neçə aylıq mühasirədən sonra, qətl-qarətdən əlavə öz elatının iki mislini götürüb geri qayıtdı.

Dərbəndlilər, Məhəmmədhüseyn xanın qardaşı Tahir bəyin pis rəftarından təngə gəlmişdilər. Fətəli xan onların təşviqilə, hicri 1172-ci (=1759) ildə, Dərbəndin üzərinə gedib, azacıq mühasirədən sonra oranı da aldı. Məhəmmədhüseyn xan öz istəyinə görə Bakıda yurd saldı.

Əzmdə, hünərdə və rəiyyətpərvərlikdə mumtaz olan Hacı Çələbi, həmin məğlubiyyətdən (Şirvan məğlubiyyətindən) az zaman sonra vəfat etdi. Onun cəsarətli və hünərli oğlu Ağakişi bəy hökumət başına keçdi. Bu zaman qaziqumuqlu Məhəmməd xan, ərəşli Məlik Əlinin təhrikilə Ərəş mahalına gəlib, Ağakişi bəyi görüş və məşvərət bəhanəsilə yanına çağırdı və öldürdü. Beləliklə, Şəki ölkəsini ələ keçirdi. Ağakişi bəyin əyalı olan öz qızını ilisulu Alxas bəyə verdi. Əhməd xan da bundan doğuldu.

Məhəmməd xan Şəkidə 40 gün hökmranlıq etdi. Hacı Çələbinin bütün dəfinələrini ələ keçirdi və olmazın zülm törətdi.

Hacı Çələbi nəvəsi Ağakişi bəy öldürüldükdən sonra Hüseyn ağa Həsən ağa oğlu Qəbələ yolu ilə Dərbəndə, Fətəli xanın yanına getmişdi. Quba qoşununun köməkliyi və Şəki əyanının ittifaqilə, Məhəmməd xanı buradan çıxararaq öz mülkünə sahib oldu. Bu hadisədən üç il sonra hicri 1175-ci (=1762) ildə, Nadir şahın böyük əmirlərindən Fətəli xan Əfşar Azərbaycanı aldı, hökmranlıq iddiası ilə Gəncə və Qarabağa hərəkət etdi. Pənah xan onunla itaət edər kimi sazişə girdi, oğlu İbrahim Xəlil ağanı ona girov verdi, ərəşli Məlik Əli də, Şəki hakimiyyəti təmənnasilə onun hüzuruna getdi. Lakin bu zaman Hüseyn ağa, qutqaşınlı Kəlbəli Sultan və sair tərəfdarları ilə Fətəli xanın yanına gəldi. Xanlıq ləqəbi alaraq qayıdıb Məlik Əlini öldürdü.

Hicri 1176-cı (=1763) ildə, Şirvanda və xüsusilə Ağsu şəhərində şiddətli taun xəstəliyi baş verdi. Bu xəstəlikdən çox adam tələf oldu. Bu zaman, Vəkil Kərim xan Azərbaycanı istila etmək məqsədilə gəldi. Qarabağlı Pənah xan öz oğlunu xilas etmək üçün ona qoşuldu və Urmu şəhərini almaqda, həmçinin Fətəli xanı öldürməkdə çox yardım göstərdi.

Vəkil, Pənah xanın oğlu İbrahim Xəlil ağanı xanlıq ləqəbilə Qarabağa göndərdi, özünü isə, həmişə yanında saxlayırdı. Pənah xan Şirazda vəfat etdi, nəşi də Qarabağa göndərildi. Deyirlər ki, Pənah xan cəsarətli, sadə, xoşrəftar və tədbirli bir əmir olmuşdur.

Xülasə, Vəkil Kərim xan Azərbaycanı ələ keçirdikdən sonra, məlumat aldı ki, Zəki xan Zənd səltənət iddiasındadır və Bəxtiyari tayfasının təşviq və təhriki ilə

İsfahana gəlmişdir. Vəkil Kərim xan bütün əmirlər və qoşunla bərabər onu dəf etməyə getdi. Zəki xan İsfahanın əyanlarını köçürüb, Dəştə apardı. Nəzərəli xan Zənd, Vəkilin hökmü ilə gedib, ona qalib gəldi və Luristanın son hüduduna qədər onu təqib etdi. Zəki xan naçar qalıb, Vəkilin töyləsinə pənah apardı və aman tapdı.

Gürcüstanda məğlub edilərək soyulmuş olan Azad xan Əfqan da Vəkilin dərgahına aman gətirdi və mehribanlıqla qəbul olundu. Bu qayda üzrə İran ölkəsi rəqabətsiz Vəkil Kərim xanın ixtiyarına keçdi.

Hicri 1178-ci (=1765) ildə, Əsgər bəyin oğlanları Məhəmməd Səid xan və Ağası xan elat arasında Vəkildən xanlıq ləqəbi qazanıb, Ağsu şəhərini aldılar və cəhi-cəlalı sevib dinc yaşamaq istəyən Hacı Məhəmmədəli xanı öldürdülər. Bu zaman, Fətəli xan Əmir Həmzə üsminin bacısı Tutu bikəni aldı. Üsmi də Fətəli xanın Hüseyn xan Rudibarının qızından olan bacısı Xədicə bikə üçün elçi göndərdi. Lakin Fətəli xan öz bacısını bakılı I Mirzə Məhəmməd xanın oğlu Məlikməhəmməd xana verdi. Məlikməhəmməd xanı, atası öz sağlığında hökumət başına keçirmişdi.

Xədicə bikənin üstündə Əmir Həmzə ilə Fətəli xanın arasında ədavət düşdü. Bir zaman keçdikdən sonra, üsmi öz bacısını görmək bəhanəsilə Dərbəndə gəlib, Narınqalanı almaq fikrinə düşdü. Fətəli xan bundan xəbər tutaraq, Quba qoşunu ilə Dərbənd üzərinə gəldi. Üsmi üç gün top və tüfəng ilə müdafiəyə qalxmışdı. Axırda, müqavimət göstərə bilməyib, dayanmadan Carçı-qapıdan çıxıb, öz mülkünə qayıtdı. Üsmi bu andan etibarən daima kin və ədavət saxlayıb, Fətəli xandan intiqam almaq pusqusunda idi.

Bundan əlavə, öz əmisi qaziqumuqlu Məhəmməd xandan üz döndərmiş Eldar bəy, Fətəli xanın etimadını qazanıb Dərbənd naibi olmuşdu. O, yersiz və münasibətsiz danışıqları və hərəkətləri ilə üsminin ədavətini qazanmışdı. Üsmi də, düşmənçilik vəsaitini hazırlayıb, öz bacısı oğlu olan Təbərsəran qazisi Rüstəm Mürtəzaəli oğlunu qüvvətləndirdi. Bu zaman, Mirzə oğlu Şeyx Əli bəy, Məhəmməd məsumun oğlu Mürtəzaəli məsumu öldürüb, özü məsumluğa keçdi. Lakin, onun işi baş tutmadı. Üsmi və qadinin təhrikilə xalq üsyan qaldırıb, onu çıxartdı. O da, Fətəli xanın yanına gəldi. Bundan sonra, yuxarıda adı çəkilən Mürtəzaəlinin oğlu Novruz bəy məsumluğa təyin edildi. Bu lal olduğu üçün, anası Xanım, kişi kimi hökmranlıq edirdi. O, məsumlar nəslindən Qaraxanın qızı idi.

Hicri 1181-ci (=1767) ildə Fətəli xan Şəki xanı Hüseyn xanla birlikdə iki tərəfdən gəlib, Məhəmməd Səid xan və Ağası xanın yenidən abad etdikləri qədim Şamaxı şəhərini mühasirə etdilər. Məhəmməd Səid xan çarəsiz qalıb Fətəli xanın, Ağası xan isə, Hüseyn xanın yanına getdi. Hüseyn xan Ağası xanı kor etdi. Fətəli xan da Məhəmməd Səid xanı həbsə alıb Dərbəndə göndərdi, şəhəri də Ağsuya köçürdü. Hər iki tərəfdən iki naib təyin etdilər. Ölkəni iki hissəyə böldülər. Sədari və Qəsani mahalları Hüseyn xana, Şirvanın qalan hissəsi isə, Fətəli xana çatdı.

Bir neçə vaxt keçdikdən sonra, Fətəli xan bütün Şirvan ölkəsini aldı və qədim şəhəri yenə abad etdi. Kür çayının kənarında, Kotevan qalasında sakin olub,

ölkəsini geri almağa çalışan kor Ağası xan, Hüseyn xana pənah apardı. Hüseyn xan, Avar xanzadələrindən Bulac və Məhəmməd Mirzənin sərkərdəliyilə Avardan qoşun götürüb Şirvana, Fətəli xanın üstünə gəldi. İki qoşun qarşılaşdığı zaman, araya barışıq məsələsi düşdü. Gözlənilmədən, hər iki tərəfdən bir neçə nəfərin birdən-birə çəkişməsi nəticəsində arada şiddətli döyüş və vuruşma başladı. Bu müharibədə Bulac və Məhəmməd Mirzə öldürüldü, Hüseyn xan məğlub olub Şəkiyə, Ağası xan da yenə Kotevana getdi.

Hicri 1187-ci (=1773) ildə, Şamxal Xasfulad xan vəfat edərkən, öz bacısı oğlu Buynaq əmiri Mürtəzaəli Mehdi oğlunu öz yerinə təyin etdi. Xasfulad xan zabitəli, igid və səxavətli bir əmir idi. O öz qohum-əqrabasilə pis rəftar edirdi. Onun qardaşı oğlu və Qazanış əmiri ağıllı və cəsarətli Dişsiz Məhəmməd, Mürtəzaəli ilə çəkişməyə başladı. İndiri əmirləri, avarlı Novsal xan Əmmə xan oğlu və Əmir Həmzə üsminin köməkliyilə gəlib Mürtəzaəlini Tarxu və Buynaqdan çıxarıb, şamxallığa oturdu. Mürtəzaəli şamxal Qoysuboy və Aqquşa mahallarında yaşayan əhalinin köməyilə, bir aydan sonra gəlib, məmləkəti təsərrüfünə keçirdi. Bu mahalların əhalisi həmişə böyük işlərdə şamxala tabe olub, onun müavini hesab edilirdi. Yeni şamxal təyin edildiyi zamanda, onların iştirakı lazım idi. Dişsiz şamxal və ondan sonra oğlu Xasfulad, əvvəlki kimi, Qazanış əmirliyinə qane oldular.

Hicri 1188-ci (=1774) ildə Ağası xan, Fətəli xanın qan düşməni və Qarabağa gəlmiş olan avarlı Novsal xanı özünə müttəfiq edib, Şamaxı şəhərini aldı. Fətəli xan Quba və Dağıstandan külli qoşun toplayıb, bakılı Məlikməhəmməd xanla birlikdə onlara qarşı müharibəyə girdi və müharibədən qalib çıxdı. Ağası xan qaçdı, Novsal xan isə, qədim şəhərin yuxarı hissəsində çıxılmaz və çətin bir sığınaqda gizləndi. Axırda, Fətəli xan aman vədəsilə Novsal xanı öz yanına gətirdi. Xanların hər üçü bir yerdə oturmuşdular. Bu zaman, Aqquşa qoşunu toplaşıb, Fətəli xandan yanlarına gəlməsini, Novsal xan ilə keçmişdə ədavətləri olduğu üçün, onun öldürülməsini xahiş etdilər. Fətəli xan çarəsiz qalıb, əmr verdi ki, çadırın arxa tərəfini yarıb, Məlikməhəmməd xanı bayıra çəksinlər. Novsal xanı isə, öz tərəfdarları ilə birlikdə öldürdülər. Əmir Həmzə üsmi, belə bir firsəti qənimət saydı. Dişsiz Məhəmməd şamxal və damadı qaziqumuqlu Məhəmməd xan ilə əlbir olub Fətəli xana qarşı müharibəyə çıxdı. Fətəli xan bu hadisəyə görə Qubaya gəldi. Ağası xan onun getməsindən istifadə edib Şirvanı tutdu.

Gavduşan düzündə çox şiddətli bir müharibə oldu. Bir-birilə əhd bağlamış iki qoşun məğlub edilmək ərəfəsində ikən, yuxarıda adı çəkilən üsminin oğlu Əli bəy, bir dəstə igidlə özünü qoşunun mərkəzinə yetirdi. Zəfər yenə də onun şücaət və mərdanəliyilə birləşdi. Dişsiz şamxal, Məhəmməd xanın qardaşı oğlu Eldar bəy və Şeyx Əli məsum iki tərəfdən öldürüldü. Məğlub olan Fətəli xan da Qubada qalmağı münasib görməyib Sələyana getdi. Üsmi şamxalın nəşini götürüb apardı. Dərbəndin yaxınlığında yalandan Fətəli xanın öldürülməsi xəbərini Tutu bikəyə göndərdi, qalanın təslimini tələb etdi. Tutu bikə ona inanmayıb özü gecə-gündüz

burcların üzərində qalanı mühafizə etməyə məşğul oldu. Məhəmməd xan Qubanı aldı, Üsmi də Bakının üzərinə yürüdü. Qalanı almaq mümkün olmadığından, Məlikməhəmməd xanın ilxısını və kəndlərin mallarını qarət edib geri qayıtdı.

Fətəli xan, himayə edilmək xahişilə dərbəndli Mirzə bəy Bayatı elçi olaraq Rusiya imperatoriçəsi II Yekaterinanın dərbarinə göndərdi. Özü isə, gizlincə Şabrandan və Müskürdən keçib Dərbəndə gəldi. Bir az keçincə, tərəfdarları onun ətrafında toplaşmağa başladılar. Bu zaman, Məhəmməd xan Qubanı tərk edib, öz mülkünə qayıtmağa məcbur oldu.

Bir il sonra, hicri 1189-cu (=1775) ildə, general-mayor De-Medemin komandası altında olan bir dəstə rus qoşunu Fətəli xana köməyə gəldi. Eyni zamanda o, keçən il məşhur rus səyyahı Qmelini həbsə aldırıb, öldürmüş Əmir Həmzə üsmini cəzalandırmağa məmur edilmişdi. Üsmi Başlının bir ağaclığında bütün qoşunu ilə ruslara hücum etdi. Lakin məğlub oldu, qoşunun çox hissəsi öldürüldü. Fətəli xanın qoşunu da tərəkəmə kəndlərini qarət edib yandıraraq, Dərbəndə qayıtdı. Bundan sonra, Kürə nahiyəsində Məhəmməd xanın külli qoşunu məğlub etdi. Onları qarət etdikdən sonra, Yuxarı Təbərsəranı tabe etmək üçün Qaluq adlı yerə yürüş etdi. Təbərsəranlılar da dağlara və meşələrə arxalanaraq meşələrə çıxdılar və məğlubiyyətdən sonra tabe oldular. Həmin il Rusiya qoşunu Qızlara qayıtdı. Rusların bu köməyi Fətəli xanın şöhrətli iqtidarının daha da möhkəmlənməsinə səbəb oldu.

Ali-sərkar Fətəli xana xeyirxah və tərəfdar olduqlarını izhar edərək, onunla dost olmaq istədilər. Bunun nəticəsində, 7 ildən bəri Dərbənddə dustaq olan Məhəmməd Səid xan azad edildi. O, Ağsu şəhərində hakimliyə başladı, Ağsu xan da Əlvənddə oturub, bütün Şirvana hökmran oldu. Bu zaman, Əmir Həmzə üsmi 3000 igid qoşunla Dərbənd, Quba və Şirvan ölkələrindən keçib, Ərdəbilə getdi. Buraları çalıb-çapdıqdan sonra, Qarabağdan keçib, Gəncəyə gəldi. Buranı da Ərdəbildən daha pis qətl-qarət etdi, hədsiz qənimətlə Şəki, Axtı və Kürədən keçib, öz mülkünə döndü. Adı çəkilən ölkələrin əmirləri ona qarşı durmağa cürət etmədilər. Bunlardan bəzisi, hədiyyə göndərmək vasitəsilə özünü onun şərrindən qurtarmaq istəyirdi. Fətəli xan Məhəmməd bəyi öz tərəfinə çəkdi. O, yuxarıda adı çəkilən üsminin qardaşı oğlu olub, igidlikdə şöhrət tapmışdı. Fətəli xan Qubadan 100 ev köçürdüb, Dərbəndin üç ağaclığında ona məxsus bir qala tikdirdi. Xan Məhəmməd bəy cürbəcür vasitələrlə üsminin işinə əngəl törədirdi. Bundan əlavə, mənfəət verdiyi və əlaqəyə girdiyi üçün, Dağıstan əmirləri, əyanları və əhalisi gündən-günə Fətəli xanın dövlətinə daha artıq meyl göstərdilər. Üsmi artıq böyük işlərə qarışa bilmədiyindən, naçar qalıb, barışmağa məcbur oldu.

Məhəmməd xanın oğlu Şah Mərdan bəy, ögey anasından olan qardaşı Surxay ilə ədavətli idi. Buna görə, atası Məhəmməd xandan inciyib, Fətəli xana meyl göstərərək xidmət edirdi. Fətəli xan da Dərbənd üstündə sayılan Kürə nahiyəsinin aşağı hissəsini Qəbərək kəndinə qədər və Qurbanın Güney mahalını ona verdi. Ayrıca bir camaat olan Qurah mahalını da Şah Mərdan bəy özü ələ

keçirdi. Beləlikdə, Məhəmməd xan da müxalifət iqtidarında olmayıb, müdara ilə keçinirdi.

Bu zaman, Təbərsəran əmirəsi Xanım vəfat etdi. Mirzə nəvəsi Əliqulu Sail oğlu qulluq göstərmək bəhanəsilə lal məsumla dostlaşdı. Rüstəm qadinin köməyilə onu iki oğlu ilə öldürüb, məsumluğa keçdi. Fətəli xanın xidmətində Gavduşan döyüşündə öldürülmüş qardaşı Şeyx Əli məsumun oğlanları: Məhəmmədhüseyn bəy, Söhrab bəy, Şamxal bəy və Mustafa bəy Qubay getdilər. Fətəli xan bir müddətdən sonra, Əliqulu məsumu Dərbəndə gətirib həbs edərək Səlyana göndərdi. Özü isə qoşunla gedib, Məhəmmədhüseyn bəy Şeyx Əli oğlu məsumu, keçmiş məsumların oturağı olan Çıraq kəndində məsumluğa oturtdu. Ondan sonra qardaşları: Söhrab məsum, Şamxal məsum və oğlu Qırxlarqulu məsum bir-birinin ardınca əmirlik etdilər.

Şəki hökmranlığında müstəqil olan Hüseyn xan, aralığa düşən ədavətə görə, əmisi Cəfər ağanı öldürüb, öz xanədanında ədavət toxumu əkdi. Hacı Çələbinin oğlu Hacı Əbdülqadir, öz tərəfdarları ilə ondan üz çevirdi. İbrahim xanın köməyilə Kür çayı kənarında, Dardoqqaz adlı yerdə sakin oldu. Hüseyn xan bir neçə dəfə onun üzərinə gedib vuruşdusa da məqsədə nail olmadan geri qayıtdı. Bu müvəffəqiyyətsizlikdən sonra o, Hacı Əbdülqadirin tərəfdarları olan qutqaşınlı Kəlbəli Sultanı, qışlaqlı Hacı Ağanı və Hacı Rəsul bəy Hacı Şeyx Əli oğlunu həbsə aldı. Bir az keçəndən sonra, Hacı Rəsul qaçdı, o biri iki nəfər isə öldürüldü.

Həmin hicri 1193-cü (=1778) ildə, ədalətli və hünərli bir əmir olan Vəkil Kərim xan vəfat etdi. O, qoşununun intizamına və ölkəsinin asayişinə çalışıb, 30 ilə yaxın İranda hökmranlıq etdi. O çox insaflı olub səltənətin qədr və qiymətini gözlədiyindən, ancaq Vəkil ləqəbilə kifayətlənmişdi. Zəndiyyə dövləti də əmirləri arasında düşən ixtilaf nəticəsində tez puç olub aradan çıxdı.

Hicri 1194-cü (=1779) ildə, Hacı Əbdülqadir, Hacı Çələbinin əmisi oğlu Hacı Rəsul bəy Hacı Şeyx Əli oğlunun köməkliyi, Ərəş mələkzadələri və Şəki əyanının ittifaqilə qəflətən Nuxu qalasına soxuldu. 22 il hökmranlıq sürməkdə olan Hüseyn xanı öldürüb, hökumət bayrağını qaldırdı. Hüseyn xan hünərli, şücaətli, gözəl tədbirli və düzgün fikirli olmaqla bərabər, təbiətən rəhimsiz bir adam idi.

Ağa Məhəmməd xan Qacar hüdud boyunu tutduğu zaman, Gilan hakimi Hidayətulla xan məğlub olub, kömək tələbilə Bakıya, buradan da, Qubaya gəldi. Fətəli xan Səlyan və Talış yolu ilə, Mirzə bəy Bayatın komandası altında 9.000 qoşun göndərib, onu Rəştdə əvvəlki yerində oturtdu.

Hicri 1196-cı (=1781) ildə, dindar, ədalətli bir əmir olan bakılı Hacı Məlikməhəmməd xan Hacı Mirzə Məhəmməd xan oğlu, 11 yaşlı oğlu II Mirzə Məhəmməd xanı dayısı Fətəli xanın himayəsi altında Bakı hakimi təyin etdi. Özü Ətəbatə (Kərbəla və Nəcəfə) ziyarətə gedib, Nəcəf-əşrəfdə vəfat etdi.

Bu zaman, Məhəmmədsəid xan, Fətəli xanın bacısı Fatma xanımı öz oğlu Məhəmmədrza bəy üçün istədi. Fatma xanımı keçmişdə Vəkil Kərim xan da öz oğlu Əbülfəth xana namizəd etmişdi. Onun qardaşı Ağası xan, Fətəli xanın Şirvan

iddiasında olduğunu bilib, bu işdən narazı idi. Özü də Əlvənddə sakin idi. Füzulinin bu beytini yazıb ona göndərdi:

Kuhkən Şirinə öz nəqşin çəkib vermiş firib,
Gör nə cahildir yonar daşdan öziçün bir rəqib.

Məhəmmədsəid xan da, cavabında, Füzulinin bu beytini yazıb göndərdi:

Kuhkən künd eyləmiş bir tişəni bir dağ ilə,
Bən qoparıb atmışam bin dağı bir dırnaq ilə.

Xülasə, Fətəli xanın bacısını almaq səbəbinə, iki qardaşın arasına ayrılıq düşdü. Hicri 1198-ci (=1784) ildə Fətəli xan Ağası xana kömək edən İbrahim xanın üzərinə getdi, Ağdamı dağıtdı və Qarabağın aşağı mahallarını talan etdi. Hacı Əbdülqadir xan da Şəki qoşunu ilə onunla yoldaş idi. Bu səbəbə İbrahim xan, atası öldürüldüyü zaman Qarabağa qaçıb, məhbus olan Məhəmmədhəsən ağa Hüseyn xan oğlunu gizlicə azad edib, Cara göndərdi. Məhəmmədhəsən ağa Car ləzgilərinin köməkliyilə Şəkinin üzərinə yürüş etdi. Birinci dəfə məğlub oldu. İkinci dəfə isə, qalib gəldi. Hacı Əbdülqadir xan da Əlvəndə Ağası xanın yanına qaçdı. Ağası xan onu tutub, qoşunla onu təqib və tələb edən Məhəmmədhəsən xana verdi. Məhəmmədhəsən xan, atasının intiqamı üçün onu yeddi oğlu ilə bərabər öldürdü. Deyirlər ki, o (Hacı Əbdülqadir xan) igid və cəsarətli bir əmin olub, amma cüzi işlərdə çox şiddət göstərərmiş.

Fətəli xan hicri 1199-cu (=1785) ildə, Ağası xan və onun müttəfiqi Məhəmmədhəsən xan ilə müharibə etmək qəsdilə Şirvana getmişdi. Bu zaman, qardaşı qarabağlı İbrahim xandan üz çevirmiş olan Mehrəli bəy Fətəli xanın yanında idi. Bir gecə, Bakıdan Şirvana getdiyi zaman, yolda Ağası xanın böyük oğlu Əhməd bəyə rast gəldi, aralarında müharibə oldu, Mehrəli bəy öldürüldü. Fətəli xan onun cənazəsini kamal-ehtiramla Qarabağa göndərdi. Bu hadisədən sonra, İbrahim xan Fətəli xanla dostlaşmağa başladı, Ağası xana qarşı hər iki tərəfdən qoşun göndərildi. Ağası xan məcbur qalıb Fətəli xanın hüzuruna gəldi, oğlanları ilə bərabər məhbus olaraq, Qubaya göndərildi. Bundan sonra, Fətəli xan Şəki üzərinə yürüş etdi. Bu müharibədə məğlub olan Məhəmmədhəsən xan, öz bacısını Fətəli xana verib barışdı. Fətəli xan da ittifaqı möhkəmləndirmək məqsədilə öz bacısı Huri Peykər xanımı ona verdi. Həmin il cəsarətli, xoş rəftar və eyni zamanda xasiyyətcə vüqarsız və kinli bir şəxs olan Mürtəzaəli şamxal vəfat etdi. Qardaşı Məhəmməd şamxallığa oturtdu. Hicri 1201-ci (=1787) ildə Fətəli xan Məhəmməd şamxalın qızı Kiçik bikəni, üsminin bacısından olan Əhməd ağa adlı oğlu üçün aldı, çoxlu cehiz və böyük bir dəbdəbə ilə Dərbəndə gətirdi. Əmir Həmzə üsmi də həmin il vəfat etdi və qardaşı Ustar xan onun yerinə təyin olundu.

Öz qardaşının ələ keçməsindən qorxuya düşən Məhəmmədsəid xan, gizlincə keçmişdəki işlərin əvəzini almağa çalışırdı. Fətəli xan, Ağası xanı Əhməd bəy və Məhəmməd bəy adlı iki böyük oğlanları ilə hakim təyin etmək bəhanəsilə, Qubanın Qonaqkənd kəndinə gətirdi. Məhəmmədsəid xan, Qəsaniyə və buradan da Qəbələyə getdi. Fətəli xanın damadı Məhəmmədrza bəy onu qarşıladı. Fətəli xan, Ağası xanı oğlanları ilə Bakıya göndərdi. Özü isə, Ağsuya gələrək Məhəmmədrza xanı Şirvana hakim təyin etdi. Lakin həqiqətdə özü hökmranlıq edirdi.

Bu zaman Fətəli xan bir nəfər göndərib, Məhəmmədsəid xanı oğlanları ilə bərabər və Ağası xanın oğlu Mustafa bəyi Məhəmmədhəsən xandan istədi. Məhəmmədsəid xan, işi arzusu xilafinə görüncə, naçar qalıb, Fətəli xanın yanına gəldi. O, iki oğlu - Mahmud bəy və İskəndər bəylə Səlyana və Məhəmmədrza xan da Qubaya göndərilərək, həbsə alındılar.

Bu hadisə zamanı, Məhəmmədsəid xanın oğlanları - Əsgər bəy, Qasım bəy və Ağası xanın oğlu Mustafa bəy Qarabağa qaçmışdılar. Ərəşli Məlikəlinin qardaşı oğlu Şəhabəddin Sultan, Məhəmmədhəsən xan onları üçünü də buxovlayıb, Fətəli xanın elçisi Məhəmmədkərim bəy Hacı Səfərli bəy oğlu və öz inanılmış adamı Hacı Seyid bəylə Şirvana göndərdi. Təsadüfi olaraq, Göyçay yolu kənarında, Şəki və Şirvan sərhəddində, Ali-sərkar tərəfdarlarından bir nəfər, belə bir yalan şayiə buraxdı: guya Fətəli xan Şəki tacirlərini soyub həbsə almışdır, özü də müharibəyə hazırlaşır. Hacı Seyid bəy Şirvan xanzadələrini buraxıb, Məhəmmədkərim bəyi buxovlayaraq geri qayıtdı. Bu 3 nəfər Cara, buradan da Avara getdilər. Novsan xanın qardaşı oğlu və damadı Əmma xanı, əmilərinin qanını almaq üçün Şirvana gətirdilər. Yanında hazır qoşunu olmayan Fətəli xanı, Ağsu şəhərində 9 ay mühasirəyə aldılar. Axırda, Fətəli xan öz qızı Pəricahan xanımı və Səlyan nahiyəsini Əmma xan Avara, Şirvan xanzadələri isə Qarabağa, oradan da osmanlı Axalkalakına getdilər.

Bu zamanlar Mürtəzaqulu xan Qacar öz qardaşı Ağa Məhəmməd xandan üz çevirib, Bakıya və mühasirədən iki ay əvvəl Şirvana gəlmişdi. O, qalanı müdafiə etməkdə Fətəli xana böyük xidmət göstərdi. Mühasirə bitəndən sonra da, kömək istəmək üçün, Rusiya imperatoriçəsinin dərbarına getdi.

Hicri 1202-ci (=1788) ildə, Ali-sərkarın məhbusları olan saf qəlbli, dəyişkən məcazlı Məhəmmədsəid xan iki oğlu ilə Səlyanda, iş bacaran cəsarətli və eyni zamanda etimada layiq olmayan Ağası xan, iki oğlu ilə Bakıda, Məhəmmədrza xanda Qubada öldürüldü. Ağası xanın övladından iki-üç nəfəri kor edildi.

Məhəmmədhəsən xan Əmmə xanın hadisəsindən və şirvanlıların təhrikindən cəsarətləndi. Əli Sultan bəy Mehdi bəy oğlu Cankutay ilə ittifaq edərək, qəfildən Ağsu şəhəri üzərinə gəldi. Müharibədə ondan qalibiyyət nişanələri zahir oldu və hətta qoşunundan bir hissəsi də şəhərə daxil olmuşdu. Bu zaman, Fətəli xan Quba və Dərbənd dəstəsi ilə hücuma keçdi. Əvvəlcə döyüşdə zəiflik göstərən ləzgilər də Mehdi bəy Məhəmmədoğlu şamxalın komandası altında hücuma başladılar. Məhəmmədhəsən xan məğlub olub Şəkiyə qaçdı, Əli Sultan

bəy də, Mehdi bəyin vasitəçiliyilə, məğlub və qarət edilmiş qoşunu ilə Quba və Dərbənd yolundan vətəninə qayıtmağa izn aldı.

Həmin il, Fətəli xan gedib Ərdəbili aldı və Şahsevən əmirləri ona tabe oldular. Muğanlı Həsən xan da ona səmimiyyət göstərməkdə idi. Əvvəlcə Qubada məhbus olan Mir Mustafa xan, Qara xan oğlu, sonralar onun himayəsi altında Talışda, həmçinin Hidayət xan da Gilanda hakimiyyət sürürdülər. Yalnız qarabağlı İbrahim xan, olduğu yerin möhkəmliyinə görə düşmənlikdə davam edirdi. Lakin Qarabağın aşağı mahalları Fətəli xanın hücumundan rahat deyildilər: Şamxal, üsmi və Qaziqumuq xanı ona qarşı ixlas göstərirdilər. Avar xanı və Mehdili əmiri çarəsiz qalıb, onunla sülh ilə keçinirdilər. Təbərsəranın məsum və qadisi onun itaətkar xidmətçisi idilər. Dağıstanın azad xalqının əyan, qazi əmirlərinin çoxu onun sədaqətli tərəfdarları idilər. O, özünə məxsus olan Quba, Dərbənd və Səlyan ölkələrindən başqa, Şirvan ölkəsini də tamamilə ələ keçirdi. Bakının kiçik yaşlı xanı da onun himayəsi altında idi. İran dövlətinin üsul-idarəsindən olan qarışıqlıq səbəbilə Azərbaycan əmirlərindən bir çoxu, məsələn, Qaradağ, Təbriz və sair əmirləri Ağa Məhəmməd xan Qacarla düşmən olduqları üçün, himayə ediləcəkləri ümidilə ona səmimiyyət göstərməyə başladılar. Axırda, bütün istiqlal və ehtişam vəsaitinə malik olan Fətəli xan, Azərbaycan və bəlkə də, bütün İran işlərini intizama qoymaq xəyalilə, Gürcüstan valisi İrakli xanla görüşüb məsləhətləşmək binasını qoydu. İrakli xan da öz dudmanlarından Sadıq bəy Yadigar oğlunu səfir sifətilə Fətəli xanın yanına göndərdi. O, qədim Gürcü valiləri nəslindən yadigar qalıb, doqquzuncu babası, İranın qüvvətli padişahları dövründə, müsəlman olmuşdu. Onun oğlu və nəvələri indi də Tiflisdə yaşamaqdadır. Səfir Sadıq bəy Nuxuda xanın hüzuruna gəlib, hədsiz lütf və mərhəmətə nail oldu.

Məhəmmədhəsən xan öz əməlindən peşman oldu, əyalı olan Fətəli xanın bacısını əfv və aman diləməyə göndərdi. Özü də Fətəli xanın hüzuruna gəldi. Fətəli xan cəh və cəlalla Nuhu şəhərinə getdi. Bir neçə gün qonaqlıq və şadlıqla keçirib, Gəncəyə yola düşdü. Cavad xan ibni-Şahverdi xan Ziyad oğlu Qacar, ölkənin bütün əyanı ilə bərabər Kür çayının kənarında onu pişvaz edib qalanın qapılarını üzünə açdı. Fətəli xan da Cavad xanın əlindən çıxmış Şəmsəddinli mahalını Gürcüstan valisindən alıb ona verdi.

Xülasə, yüksək mərtəbəli iki vali, Şəmkir yaxınlığında bir-birilə görüşdülər. Rusiya dövlətindən himayə görmək ümidilə tədbirlər gördülər. Geri qayıtdığı zaman, Fətəli xan şiddətli bir qızdırmaya tutuldu. Xəstəliyi gündən-günə şiddətləndi. Buna görə sürətlə Şirvana, buradan da Bakıya, bacısının yanına getdi. Hicri 1203-cü (=1789) ildə mart ayının 22-də, 54 yaşında ikən vəfat etdi.

Fətəli xan tədbirli, mərhəmətli, əzmində sabitqədəm, məmləkəti idarə etmək işlərində mahir bir adam idi. O, könülləri ələ almaq və düşməni aldatmaqda xüsusi bir məharətə malik idi.

Hünərli bir əmir olan qaziqumuqlu Məhəmməd xan da həmin ildə vəfat etdi. Oğlu II Surxay xan onun yerinə keçdi.

Fətəli xanın böyük oğlu Əhməd xan hökumət bayrağını yüksəltdi. Onun başında gənclik ehtirası və hökmranlıq qüruru var idi. O, ölkəni idarə etmək işlərindən bixəbərdi. Bir ildən sonra, Məhəmmədhəsən xan köhnə ədavətə görə, onun əleyhinə olaraq şirvanlılarla ittifaq bağladı. Osmanlı ölkəsindən Qarabağa gəlmiş Əsgər bəyi, Qasım bəyi və Mustafa bəyi öz yanına çağırdı. Hacı Məhəmmədəli xanın oğlu Manaf bəylə Şirvan üzərinə hərəkət etdi. Əhməd xan müqavimət göstərə bilməyib Qubaya getdi.

Məhəmmədhəsən xan Ali-sərkarı, elat arasında, Manaf xanı isə Ağsu şəhərində hakim təyin etdi. Cürbəcür vasitələrlə tacirlərdən və başqalarından çoxlu mal topladı və orada bir neçə gün qaldıqdan sonra Şəkiyə qayıtdı.

Bir həftədən sonra Ali-sərkar gəlib Ağsu şəhərini aldı, zəif təbiətli və tədbirsiz Manaf xanı öldürdü. Bunların hamısından böyük olan Əsgər xan Məhəmmədsəid xan oğlunu hökumətə oturtdular. Mustafa bəy Əlvəndə gedib Qətran səngərində oturdu.

Hicri 1205-ci (=1791) ildə Əhməd xan ilə bakılı II Mirzə Məhəmməd xan arasına ədavət düşdü. Əhməd xan, ona xəracgüzarlıq vədə verən I Mirzə Məhəmməd xanın oğlu Məhəmmədqulu ağanın təhrikilə, bir dəstə qoşunu Səlyana getmək bəhanəsilə Bakıya göndərdi. Məhəmmədqulu ağa da gizlicə Bakıya gəlib, öz tərəfdarlarının köməyilə, azacıq döyüşdən sonra şəhəri aldı. Mirzə Məhəmməd xanı Qubaya göndərdi. Məhəmmədqulu xan müstəqil olub, Əhməd xana vergi vermədi. Əhməd xan da öz gördüyü işdən peşman olub, Mirzə Məhəmməd xana kömək üçün, Bakıya bir dəstə qoşun göndərdi. Məhəmmədqulu xan naçar qalıb, Mirzə Məhəmməd xanın evində Nadir şah dövründən qalan malların talan edilməsi haqqında ölkə əhalisinə əmr verdi. Bu vəsilə ilə əhalinin çoxu Mirzə Məhəmməd xandan qorxub, Məhəmmədqulu xana tərəfdar oldu. Mirzə Məhəmməd xan naçar qalıb bir sıra mühasirə və müharibədən sonra Qubaya döndü.

Məhəmmədhəsən xan da Manaf xanın öldürülməsi münasibətilə Ali-Sərkardan incimişdi. Əhməd xanın yanına üzr üçün bir elçi göndərdi və Şirvanın alınmasında ona kömək edəcəyini vəd etdi. Əhməd xanla Məhəmmədhəsən xan, öz qoşunları və Dağıstan ləzgilərilə gəlib, Ağsu şəhərini iki tərəfdən mühasirə etdilər. Mühasirə xeyli uzandı, istilər də şiddətləndi. Əsgər xan Məhəmmədhəsən xanın ordusundakı ləzgilər üçün, gizli olaraq, nağd və mal ilə 5000 tümən göndərdi. Beləliklə, qoşunun arasına ayrılıq düşdü.

Bu hadisədən bir az sonra Əhməd xan vəfat etdi. Onun Səlyanda naib olan 13 yaşlı qardaşı Şeyx Əli ağa, hökmran olmaq üçün Qubaya gəldi. Yeddi yaşlı Həsən ağa adlı qardaşını naib adı ilə Səlyana göndərdi.

Əsgər xanın hökmranlığından 6 ay keçmişdi. Təbiətindəki süstlüyə görə, Şirvan əyanı ondan üz çevirib qardaşı Qasım bəyin hökumət başına keçməsində ittifaq etdilər. Əsgər xan bu müddət dustaq olub, sonra Şəkiyə qaçdı. Qasım xan, Mustafa bəyin səngərinə hücum etmək üçün Əlvəndə getdisə də məğlub olub geri qayıtdı. O, əhəmiyyətsiz şeylərə çox fikir verdi. Verdiyi hökmdə aşağı təbəqələr ilə

sinif arasında təfavüt qoymurdu. Bu cəhətdən, şirvanlılar ondan incimişdilər, o da Şirvan əhlini özünə bədxah sayırdı. Qasım xan hədiyyə və sovqat göndərmək, Məhəmməd şamxalın oğlu Şahbaz bəyi bir dəstə ləzgi ilə gətirdib, xalqa məsləhət etdi. O bu hərəkətilə hökuməti əldə saxlamaq və ölkənin asayişini mühafizə etmək fikrində idi.

Nəhayət, hicri 1206-cı (=1792) ildə, Şirvan əyanının və xüsusilə Yüzbaşı bəy Hövzu və Ömər Sədarinin təklifilə, Mustafa bəy Əlvənddən gəlib şəhərdə hökumət bayrağını yüksəltdi. Qasım xan isə, öz tərəfdarlarından bir dəstə ilə Qəbələ yolundan Qubaya getdi.

Həmin ildə Ustar xan üsmi vəfat etdi. Əli bəy Əmir Həmzə oğlu üsmi oldu. Səxavətli, lakin bərk ürəkli bir əmir olan bakılı Məhəmmədqulu xan da vəfat etdi. Qardaşı oğlu Hüseynqulu ağa Hacı Əliqulu ağa oğlu, bir neçə bəyin dayısı oğlu və damadı Qasım bəy Mənsurxan bəy oğlunun və sair tərəfdarlarının səyilə hökumət başına keçdi. Mirzə Məhəmməd xan, Quba qoşunu ilə yenə Bakı üzərinə gəldi. Hüseynqulu xan şəhərdə, Mirzə Məhəmməd xan isə kəndlərdə gah müharibə, gah da sülh edib, ölkəni və mədənləri öz aralarında bolüşdürdülər.

Bu zaman, Mustafa xan Göyçayın kənarına və Surxay xan da Xaçmaza gəlib, Qəbələnin üç mahalını üsyana qaldırdılar. Ərəşli Şəhabəddin Sultan da qarabağlılardan bir dəstə gətirdib, Məhəmmədhəsən xanın əleyhinə qaldırdı. Lakin Məhəmmədhəsən xan özünü igidcəsinə müdafiə edərək Surxay xanı, Mustafa xanı və qarabağlıları tədricən geri qayıtmağa məcbur etdi. Gözəl tədbirlərlə ölkəni aram etməklə məşğul oldu.

Şəhabəddin Sultan, qalanın möhkəmliyinə və qonşu əmirlərin himayəsinə arxalanaraq düşmənçilikdə inad edir, Ərəş və Ağdaş mahallarını rahat qoymurdu. Məhəmmədhəsən xan bir neçə dəfə onun üstünə yeridi, ancaq qalib gələ bilmədi. Axırda, Şəhabəddin Sultan təslim olmaq və Məkkəyə getmək arzusu ilə, Məhəmmədhəsən xanın yanına gəldi. Övlad və əqrabasından bir çoxu ilə bərabər öldürüldü.

Hicri 1208-ci ildə (=1794) ildə, Məhəmmədhəsən xan və Şeyx Əli xan, Qasım xana yardım üçün Ağsu şəhəri üzərinə gəldilər. Bir neçə aylıq mühasirədən sonra, bir gün güclü yağış və şiddətli seldən çadırlar xəsarətə uğradı. Ordunun vəziyyəti xarablaşdı. Mühasirədəkilər Sədari Ömər Sultanın sərkərdəliyi ilə hücuma keçib, mühasirə edənləri məğlub etdilər. Şeyx Əli xan və Məhəmmədhəsən xan oz mülklərinə qayıtdılar. Qasım xan da Quba ilə Şəki arasında olan Qaraburqa dağında özünə oturaq seçdi.

Hicri 1209-cu (=1795) ildə, cəsarətli və saf qəlbli üsmi Əli bəy vəfat etdi. Mamay ləqəbilə məşhur olan Rüstəm xan ibni-sultan ibni-Xan Məhəmməd ibni-Əhməd xan üsmi əmirliyə oturdu. II Mirzə Məhəmməd xan, arif və dinclik sevən bir əmir olduğundan, çox vaxt mülki işlərlə məşğul olmurdu. Hüseynqulu xan bundan istifadə edərək bir gecə Şirvan qoşununun köməyilə gizlicə gəlib, neft

mədəni olan Bəlxanı qalasını aldı. Bura o zaman Mirzə Məhəmməd xanın hökumət mərkəzi idi. Mirzə Məhəmməd xan yenə Qubaya getdi.

Cənubi Qafqaz ölkələri iğtişaş və inqilab məhəlli olmuşdu. Belə qarışıq bir zamanda, İran ölkəsinin hökmranlığı şövkətli Qacar sülaləsinə keçdi. Ağa Məhəmməd xan bu ölkəni almağa hərəkət etdi...

Əbdürrəzzaq bəy Məasiri-sultaniyyə[68] adlı əsərində deyir: Abaqa xanın əmrilə bu tayfanın rəislərindən Sərtaq adlı bir nəfər, Arqun xana ətabəy təyin edilib, Xorasan və Təbəristanda əmirül'üməra olmuşdu. Onun Qacar adlı bir oğlu vardı, bu tayfanın çoxu onun nəslindəndir. Onlardan (qacarlardan) bir çoxu da zaman keçdikcə Rum və Şam vilayətlərinə getmişlər. Əmir Teymur onlardan 50.000 ailəni gətirib İrəvan, Gəncə və Qarabağ nahiyələrində yerləşdirdi. Onlar gündən-günə artıb, cəh və cəlal sahibi oldular. Qacar əmirlərindən bir çoxu da Səfəvilər dövründə etibarlı hökumət adamları olub, Ermənistan və Şirvanda yüksək iqtidara malik idilər. İrəvan hakimləri həmin nəsildən olmuşdur. Gəncə və Qarabağ hakimləri də Ziyad oğlu ləqəbi ilə, Xudafərin körpüsündən başlayaraq Sınıq körpüdən yuxarı olan Şülaver kəndinə qədər hökmranlıq edirdilər. Bunlar, Muğanın böyük şurasında Nadir şahın səltənətinə razılıq verməyib Səfəviyyə dövlətinin bərqərar olmasını tələb edirdilər. Buna görə, Nadir şah İran səltənəti taxtına oturunca, onların əzəmət və iqtidarını qırmaq istəyərək, Qarabağ əhalisinin bir çoxunu Xorasana köçürdü. Bərgüşat və Xəmsə məliklərini onların ixtiyarından çıxarıb, Azərbaycan sərdarına tapşırdı... Qazax və Borçalı mahalı əhalisini Gürcüstan valisinin ixtiyarına verdi. Bu səbəblə həmin xanlar çox zəif düşüb, ancaq Gəncə ətrafının hökmranlığı ilə kifayətlənirdilər.

Hicri 1218-ci (=1804) ildə, Rusiya sərdarı knyaz Sisiyanov hücum ilə Gəncəni aldı... İrəvan, Gəncə və Qarabağ əhalisi və əmirlərinin çoxu, qacar nəslindən olduğu üçün, onlar çox vaxt Şirvan ölkəsində sakin və hökmran olmuşlar. Buna görə, Dağıstan əhalisi bu hüdud sakinlərinə indi də qacar deyirlər.

I Şah Abbas Səfəvi 30.000 qacar ailəsini buradan köçürdüb, Xorasanın Mərv nayihəsində və Astarabadın Mübarəkabad qalası ətrafında yerləşdirdi. İranda hökumət sürən indiki şahların sülaləsi Astarabad qacarları nəslindəndir. Doğrudur, Məasiri-sultaniyyə müəllifi bu sülaləni Astarabadın qədim qacar sakinlərindən sayır, lakin bunların babalarının Gəncə Şəmkiri ətrafında olmaları xalq arasında məşhurdur. Şəmkir şəhəri xarabalarının aşağı tərəfində, çayın sol sahilində, onların yurdları, ev və səkilərinin yeri Mehdibəyli adı ilə indi də görünməkdədir.

Bu sülalədən olan Fətəli xan, Şah Təhmasibin yanında çox cəh və cəlala, əzəmət və iqtidara malik idi. Nadir şah, Şah Təhmasibə yaxınlaşınca, şahın məzacını ondan çevirdi. Hətta hicri 1139-cu (=1726) ildə onun işini bitirdi. Onun

---

[68] Məasiri-sultaniyyə - qacar tarixi haqqında yazılmış ilk əsərlərdən biridir. Müəllifi Əbdürrəzaq bəy ibni-Nəcəfquludur. «Məasiri-sultaniyyə» mətbəə üsulilə İranda çıxan birinci kitablardan olub, hicri 1241-ci (=1825/26) ildə Təbrizdə çap olunmuşdur.

iki oğlu qaldı. Biri Məhəmmədhəsən xan idi. Nadir şah dövründə Astarabad nahiyələrində üsyan qaldırıb məğlub oldu və türkmən çöllərində dolanmağa başladı. O, Nadir şah öldürüləndən sonra gəlib Təbəristan, İraq və Azərbaycanı aldı, sərdarlıq ləqəbi ilə sikkə və xütbə sahibi oldu, Azad xan və Kərim xan Vəkil ilə müharibə etdi. Axırda, hicri 1178-ci (=1759) ildə, öz nökərlərinin əlində öldürüldü. Kiçik qardaşı Məhəmmədhüseyn xandan iki oğlan qalmışdı: biri Ağa Məhəmməd xan, o biri Hüseynqulu xan. Kərim xan Vəkil, girov adı ilə bunları həmişə öz yanında saxlayırdı. Bu böyük əmirin vəfatından sonra, Ağa Məhəmməd xan Astarabada gedib, gündən-günə cəh-cəlalını və səltənət büsatını artırdı. Zəndiyyəyə qalib gəlib, tədricən İraq, Təbəristan, Gilan və Azərbaycan ölkələrini fəth etdi. Hicri 1209-cu (=1795) ildə Qarabağı fəth etmək məqsədilə Xudafərin körpüsünü təmir edib, Pənahabad (Şuşa qalası) üzərinə yürüş etdi. İbrahim xan İran qoşununun bu tərəfə keçməsinə yol verməmək üçün bu körpünü xarab etmişdi. Ağa Məhəmməd xan Topxana mənzilində yerlışib, qalanı mühasirə etməyə başladı. Təqribən bir aydan sonra Gürcüstana hərəkət etdi. Qətl və qarətdən və Tiflis şəhərini xarab etdikdən sonra, qayıdıb Muğanın Çehilnam adlı yerində qışladı. Şirvan, Bakı, Şəki Quba və Dərbənd hakimləri ərizə və hədiyyələr göndərib sədaqət izhar etdilər. Şəki hakimi Məhəmmədhəsən xan Hüseyn xan oğlu, Ağası xanın oğlu Mustafa xanın əleyhinə təbliğat aparmaq üçün, öz inanılmış adamı, Hacı Seyid bəy adlı bir nəfəri Ağa Məhəmməd xanın hüzuruna göndərdi. Lakin o, Məhəmmədhəsən xanın özündən şeytanlıq etdi. Sərdar olan Qacar Mustafa xan Dəvəli, Mustafa xanı cəzalandırmaq üçün təyin olundu. Məhəmmədhəsən xan da Şəki qoşunu ilə zahirdə onun köməyinə təyin edildi. Şirvanlı Mustafa xan, Xançobanı tayfasını toplayıb, Ağsu şəhərini Fit dağına köçürməyi əmr verdi. Yaşayış vəsaitinin azlığından və soyuğun şiddətindən əhalinin bir çoxu fəlakət və zillətə məruz qaldı, bir çoxu da Qubaya və Dərbəndə dağıldı. Sərdar gəlib şəhərdə qalan malları qarət etdi. Bundan sora o, Ağdaş mahalına, buradan da Xaçmaz mahalına gəlib, Tərkəş kəndində dayandı. Məhəmmədhüseyn xanın qardaşı Səlim ağa bu hadisədən 8 ay qabaq Cara qaçmışdı. O, Car və Avar qoşunu ilə Əliskəndər Hüzzatinin sərkərdəliyi ilə Şəkini almağa hərəkət etdi. Məhəmmədhəsən xanı məğlub edib, şəhəri Gələsən-Görəsən adlanan yerə köçürdü. Məhəmmədhəsən xanın yeddi oğlunu öldürtdü. Bunlardan biri qubalı Fətəli xanın bacısı oğlu idi. Öz bacısını qarabağlı İbrahim xana verib, onun qızını da özü üçün aldı. Məhəmmədhəsən xan yardım almaq ümüdiylə, Sərdarın yanına gəldi. Sərdar, əksinə olaraq, Məhəmmədhəsən xanın gözlərini çıxardıb, dustaq olaraq Təbrizə göndərdi, çünki qabaqcadan Ağa Məhəmməd xan Şəki əhalisinin şikayətinə və Hacı Seyid bəyin böhtan və iftirasına görə, Məhəmmədhəsən xanı kor etmək xüsusunda ona fərman göndərmişdi. Bu hadisədən xəbər tutmaq üçün Ağa Məhəmməd xan onu öz yanına çağırdı. O da, 200 və ya 300 nəfərlə orduya gedərkən bir dəstə şirvanlıya rast gəldi. Sərdar döyüşdə öldürüldü.

Bu zaman, rus qoşununun gəlməsi xəbəri alındı. Quba, Səlyan və Dərbənd hakimi Şeyx Əli xan, dərbəndli Xızır bəy Hacı bəy oğlu Qorçunu göndərib, Ağa Məhəmməd xandan kömək istədi. Lakin onun qoşunu azuqə azlığı, heyvanların qırılması və qışın şiddətindən çox pərişan bir halda idi. Həm də, ola bilsin ki, bəzi mülahizələrə görə ruslarla müharibə etmək istəmirdi. Buna görə o, Xorasanı almaq məqsədilə Tehrana hərəkət etdi. Rus qoşunu da Şirvana daxil oldu.

Bu hadisənin təfsilatı belədir: Nadir şah ilə sülh bağladıqdan sonra, Rusiya ilə İran dövlətləri arasında həmişə dostluq əlaqəsi vardır. Rus imperatriçəsi Anna İvanovna, hicri 1152-ci (=1740) ildə təşrini-əvvəlin (oktyabrın) 17-də vəfat etdi. Sonra Böyük Pyotrun qardaşının qız nəvəsi III İvan iki aylıq uşaq ikən səltənətə təyin edildi. Anası Anna, oğlunun əvəzində dövlət işlərini idarə etməyə başladı. 7 ay keçəndən sonra, Böyük Pyotrun qızı Yelizaveta ona qarşı üsyan qaldırıb, bölüklərin köməyilə taxta oturdu. Anna oğlu və əri ilə bərabər həbsə alındı. Yelizaveta 20 ildən artıq ölkənin abadlığına və millətin asayişinə çalışıb, Rusiya padişahı oldu. Hicri 1174-cü (=1761) ildə kanuni-əvvəlin 25-də vəfat etdi. Vəliəhdi, Böyük Pyotrun qızı Annadan olan III Pyotr taxta oturdu. 6 aydan sonra onun arvadı II Yekatrina padişahlığa keçdi. O, ölkənin mülki vəziyyətini və qanunlarını aqilanə bir tərzdə möhkəmləndirdi. Sülh və müharibə işlərini nizama salmaqla, öz dövlətinin əzəmət və iqtidarını artırdı.

Qafqazın cənub tərəflərində asayişi bərpa etmiş olan Fətəli xan öləndən sonra, hər bir işdə iğtişaş əmələ gəldi. Bu zaman, İranda yüksək bir iqtidara malik olan Ağa Məhəmməd xan Qacar, bu ölkəni tutmaq fikrinə düşdü. Gürcüstana girib qətl-qarətə başladı.

Hicri 1210-cu (=1796) ildə, imperatriçə İran ilə müharibəyə başladı. Qraf Zubovun baş komandası altında güclü bir qoşun göndərdi. General-mayor Sobolev, itaət edib, yanına gəlmiş olan Məhəmməd xan şamxal, Rüstəm xan üsmi və Təbərsəran qadisi Rüstəm ilə bərabər Dərbəndin 8 ağaclığına gəldi. Keçən il Rusiya dövlətinə ixlas göstərmək mərasimini təzələmiş olan Şeyx Əli xandan tabe olmağı tələb etdi. O isə, gözlənilmədiyi halda müxalifət göstərdi. General həmin il şübatın (fevralın) 11-də Dərbəndin xaricinə çatıb, şimal tərəfdən mühasirəyə başladı.

Bundan bir zaman keçəndən sonra Şeyx Əli xan, Kürə və Qaziqumuq hakimi Surxay xan, süvari və piyada olaraq, 20 min qoşun hazırlayıb, rus ordusuna hücum etmək istədilər. General, mühasirəni faydasız görüb, neysanın (aprelin) ikinci gecəsi qayıdaraq, Dərvaq çayı kənarında yerləşdi. Neysanın (aprelin) axırında, rus sərdarı Qraf Zubov külli qoşunla Dərvaq çayı kənarına yetişdi. Ertəsi gün Dərbənd üzərinə hərəkət etdi. Quba və Dərbənd süvariləri şəhərin bir ağaclığında kazaklarla müharibəyə girişdilər, məğlub olub geri qayıtdılar. Şəhər dərvazalarını bağlayıb, qalanı müdafiə etməyə başladılar. Təbərsəran qadisi Rüstəm, general-mayor Bulqakovu 10 min qoşunla Təbərsəranın ortasından, Dərvaq dərəsindən və bərk meşəlik yollardan keçirmişdi. O, mayısın (mayın) 3-də

Dərbəndin cənub tərəfində göründü. Şimal tərəfində də Şeyx Əli xanın tikdirdiyi böyük burc hücumla alındı. Burada dərbəndlilərdən bir çoxu öldürüldü və yerdə qalanları qaçdılar.

Ertəsi gün iki tərəfdən şəhərə top, tüfəng gülləsi və qumbaralar yağmağa başladı. Dərbənd əhalisi müqavimət göstərə bilməyib, Xızır bəy Hacı bəy oğlu Qorçunu camaat tərəfindən vəkil göndərdilər. O da aman istəmək üçün sərdarın hüzuruna gəldi, xahişi qəbul olundu. Qraf Zubov, Şeyx Əli xanı Dərbənd və Qubanın əyan və mötəbər adamları ilə hüzuruna çağırdı. O bir neçə nəfərlə gəlib orduda saxlandı. 6 gündən sonra, Fətəli xanın qızı Pəricahan xanım Dərbənd və Qubanın müvəqqəti hakimi təyin edildi. Xızır bəyin təhrikilə Dərbəndin mötəbər adamlarından 10 nəfəri Hacı Tərxana göndərildi. General Sobolev Dərbəndi mühafizə etməyə təyin edildi. Sərdar özü isə, Qubaya yola düşdü. Quba şəhərinin yarım ağaclığında, Tənələr adlı yerdə üç gün dayanıb Şabrana gəldi.

Bir gün səfər zamanı, Pirə Xəlil çölündə Şeyx Əli xan at çapmaq bəhanəsilə qoşunun içindən çıxıb qaçdı. Bu əhvalatdan Quba şəhərində həyəcan əmələ gəldi. Xanın köçü və ailəsi Buduq mahalında onunla birləşdi. Qraf Zubov general Bulqakovu 5 min qoşunla Quba əhalisini sakit etməyə göndərdi. Şəhərin və kəndlərin əhalisi öz yurdlarına qayıtdılar. Şeyx Əli xan Qrız kəndinə gəlib, buradan Qəbələ yolu ilə Axtıya və Miskincəyə getdi. Rus sərdarı Bakıya getdi. Oranın hakimi Hüseynqulu xan pişvaza çıxıb təltif edildi. Şəhərin mühafizəsi üçün bir dəstə saldat təyin olundu. Sərdar özü isə, Şirvana hərəkət etdi. Şivan hakimi Mustafa xan, ona tabe olmayaraq, Ağsu şəhərini Fit dağına köçürtdü. Şirvanın qabaqkı hakimi Qasım xan, öz damadı Yüzbaşı bəy Səfərli bəy oğlu Hövzinin köməyilə Qaraburqa dağından enib gəldi. Mustafa xan qarşı dura bilməyib, Qarabağa getdi. İbrahim xan buna razı deyildisə də, oğlu Məhəmmədhəsən ağa onun tərəfini saxlayırdı. Qasım xan ölkənin mötəbər adamlarını toplayıb, Kür çayı kənarında Rusiya sərdarının hüzuruna gəldi. Bu xidməti əvəzində Şirvan hökumətinə təyin edildi.

Pəricahan xanım da sərdarın əmrilə, öz ana qohumlarının yanına, İlisuya getmiş olan kiçik qardaşı Həsən ağanı Qubaya gətirdi. Ölkənin əyanlarilə bərabər sərdarın hüzuruna göndərdi. İmperatorun əmri mucibincə, ona qiymətli daşlar nəsb edilmiş cıqqa verildi və Quba hökumətinə təyin edilərək geri qayıtdı.

Bu zaman Şeyx Əli xan Surxay xanın köməyilə 10 min nəfərlə Quba şəhərinin yarım ağaclığında olan Alpan kəndinə gəldi. Bulqakov onun qarşısına min nəfər saldat və bir neçə top göndərdi. Aralarında şiddətli döyüş oldu. Mövqeyin çətin olması üzündün hər iki tərəfdən bir çoxu öldürüldü, ruslar geri çəkildilər...

General Bulqakov Həsən xanla birlikdə Qubadan, Sobolev isə, Rüstəm xan üsmi, Məhəmməd şamxalın oğlu Mehdi bəy və Rüstəm xan üsmi, Məhəmməd şamxalın oğlu Mehdi bəy və Rüstəm qadi ilə bərabər Surxay xanı cəzalandırmaq qəsdilə Dərbənddən Samur kənarına gəldilər. Surxay xan naçar qalıb, aman istədi

və sədaqətlə rus dövlətinə itaət edəcəyinə and içib söz verdi. Qraf Zubov Kür çayı kənarında qışladı, oradan Gəncəyə bir dəstə qoşun göndərdi. Ora hakimi Cavad xan Ziyad xan oğlu tabe olmaq fikrilə qabağa çıxıb, qalanı təslim etdi. Qarabağlı İbrahim xan və şəkili Səlim xan da, elçilər və məktublar göndərməklə ixlas və itaət göstərdilər.

Həmin il təşrin-saninin (noyabrın) 9-da, imperatriçə II Yekatrina vəfat etdi. Oğlu I Pavel rus səltənəti taxtına oturdu. Onun, səltənət işlərini nizama salmaq uğrundakı tədbirlərindən, dövlətin xarici və daxili məsələlərindəki dəyişikliklərindən biri də bu idi ki, İran ilə müharibəni dayandırdı və qoşuna geri qayıtmaq əmri verdi.

Hicri 1211-ci (=1797) ilin baharında, vəzifədən kənar edilmiş olan Qraf Zubov, İran taxtına keçmək arzusu ilə, bu səfərində onunla yoldaşlıq edən Mürtəzaqulu xan Qacar ilə bərabər, Bakıdan gəmi ilə Hacı Tərxana getdi. General Bulqakov bütün qoşunu ilə Dağıstan yolundan Qızlara hərəkət etdi. Pəricahan xanım, həmin il atası Məhəmməd şamxalın ölümü münasibətilə onun yerinə şamxallığa keçmiş olan Mehdi bəyə ərə getdi. Fətəli xan sülaləsinin əsrlər boyu toplanmış olduğu bütün malları və qiymətli şeyləri özü ilə apardı, sair vərəsələri bundan məhrum etdi. Bacısı Çimnaz xanımı da, Şeyx Əli xandan icazəsiz Rüstəm qadinin oğlu Abdulla bəyə verdi. Həsən xan Qaytağa getdi. Rüstəm xan üsmi, İlisu əmirləri xanədanından olan onun anası Hürzad xanımı aldı. Rus qoşunu hələ Kafiri səhrasında idi ki Şeyx Əli xan Qaziqumuqdan Dərbəndə gəldi.

Gəncəli Cavad xan, hünərli və elm sevən bir adam olmaqla bərabər qan içən və günah işdən çəkinməyən bir əmir idi. Ölkə əhalisi ondan üz çevirmişdi və qonşu əmirlər də onun məhv olmasını arzu edirdilər. Buna görə, ruslar qayıtdıqları zaman, Gəncə ölkəsini Gürcüstan valisinə verdilər. Vali İrakli xan, qarabağlı İbrahim xan və şəkili Səlim xan qoşunla Gəncənin xaricinə gəldilər. Şəmsəddinli Əli Sultanı vali tərəfindən naib sifətilə Gəncə hökumətinə təyin etdilər. Cavad xan çarəsiz qalıb, qaçmaq fikrinə düşdü, lakin onun arvadı Şükufə xanım adam göndərib, Əli Sultan ilə mehmannəvazlığa başladı. Keçmişdə Cavad xanın etmiş olduğu yaxşılıqları və onu həbsxana cəzasından necə azad etdiyini ona xatırlatdı. Əli Sultan da, zatında olan vəfadarlıq və insanlığı üzündən, Cavad xanın hüzuruna gəlib, ixlas və təzim ilə qalanın açarını təslim etdi və onun xidmətində durdu. Bu hadisədən sonra Gəncə əhalisi ona tabe oldu. Ətrafa dağılmış xanlar da öz mülklərinə qayıtdılar.

Digər tərəfdən Ağa Məhəmməd xan hicri 1210-cu (=1796) ildə, Tehrana varid olandan sonra səltənət tacını başına qoyub, Xorasana hərəkət etdi. Məşhəd şəhəri asanlıqla alındı. Şahrux Mirzə Nadirin xəzinələrini ona verdikdən sonra vəfat etdi. Oğlu Nadir Mirzə Qəndəhara qaçdı, Teymur övladından Əfqan şahına pənah apardı.

Sonrakı il, şah Şuşa qalasını almaq və Şirvan ölkəsini fəth etmək qəsdilə 100.000 qoşunla səfərə çıxdı. Araz çayını keçəndən sonra, İbrahim xan Car

nahiyəsinə qaçdı. Şuşa qalası maniəsiz və zəhmətsiz zəbt edildi. Əliqulu xan Sərdar Şirvana təyin olundu. Qasım xan zahirdə itaət göstərdi. Ruslar Qarabağdan qayıdandan sonra, Qətran səngərinə gəlmiş olan Mustafa xan, oradan şahın hüzuruna getdi. Bundan qorxuya düşən Qasım xan, Şirvanı boşaldıb Şəkiyə qaçdı.

Gəncəli Cavad xan və bakılı Hüseynqulu xan da şahın hüzuruna gəlib töhmət edildilər. Hələ bu üç nəfərin işinin axırı məlum deyildi. Bu zaman, hicri 1211-ci (=1797) ildə həziranın (iyunun) 12-də, səhər açılanda, həyatları qorxu altında olan saray xidmətçilərindən iki-üç nəfər, qaniçən şahın qəzəbindən qorxub onu öldürdülər. Keşik əmirlərindən və sairədən bir neçə nəfər cəvahir və qiymətli şeylərdən ələ keçəni götürüb Tehrana qaçdı.

Ağa Məhəmməd xanın aşağıda yerləşmiş böyük ordusu da onun baş əmirlərindən Sadıq xan Şəqaqinin başına toplandı. Şahın qatilləri onun qılınc, xəncər, bazubənd və sandıqçasını Sadıq xanın yanına aparmışdılar. Sadıq xan Azərbaycanı fəth etdikdən sonra Qəzvin üzərinə gəldi. Lakin şəhərə girə bilmədi. Öldürülən padişahın vəliəhdi və qardaşı oğlu Fətəli şah Hüseynqulu xan oğlu ilə olan müharibədə Sadıq xan məğlub olub Səraba qayıtdı. Fətəli şah Zəncana gəldi, Hacı İbrahim xan Şirazini Sadıq xanın yanına göndərib təklif etdi ki, itaətə gəlib, dövlətə aid qiymətli şeyləri təslim etsin. Sadıq xan bütün şeyləri ərizə ilə göndərib üzr istədi. O, şah tərəfindən bağışlandı. Gərmrud və Səraba hakim təyin olundu.

Ağa Məhəmməd şah öldürüləndən sonra, Şuşada Pənah xan nəvəsi Məhəmməd bəy Mehrəli bəy oğlu bir neçə gün hökmranlıq iddiasında oldu. Lakin o, İbrahim xan gələn kimi Şəkiyə qaçdı. Şəki hakimi Məhəmmədhəsən xan onu həbsə alıb, şirvanlı Mustafa xanın yanına göndərdi. Məhəmməd bəy qubalı Fətəli xanın əmrilə, onun atasını və qardaşlarını Bakıda öldürmüşdü. Buna görə, o da Məhəmməd bəyi intiqam məqsədilə öldürdü.

İbrahim xan şahın cənazəsini böyük ehtiram və alimlərin (ruhanilərin) müşayiətilə yola saldı. Səmimiyyət və ixlas tərzilə yeni şahın hüzuruna bir ərizə yazdı və nəvazişə nail oldu. Oğlu Əbülfəth ağanı da padişahın hüzurunda qalmaq üçün göndərdi.

Mustafa xan Şuşadan Şirvana qayıtdığı zaman, şahın Təbrizdən gətirib Muğanda saxladığı kor Məhəmmədhəsən xanı özü ilə aparıb Şirvanı aldı. Buradan da Şəki üzərinə getdi. Səlim xan Qarabağa qaçdı. Məhəmmədhəsən xan yenə hökumət başına keçdi. Mirzə Məhəmməd xan şahın öldürülməsi xəbərini alınca, Qubadan Bakını almağa hərəkət etdi. Hüseynqulu xan ondan qabaq gəlib, qalanın müdafiəsi ilə məşğul oldu. Axırda aralarında barışıq olub məmləkəti böldülər. Hüseynqulu xan şəhərdə, Mirzə Məhəmməd xan Məşqətə kəndində bir qala tikdirib, hökumətə oturdular.

Bir zaman sonra şahın yaxın adamlarından olub, Xoy və Təbriz əyalətlərini idarə edən Cəfərqulu xan Dünbüli, Sadıq xana qarşı köhnə ədavətinə görə, bir bəhanə ilə gəlib Sərabı xaraba qoydu.

Sadıq xan Muğan yolu ilə Şirvana, Mustafa xanın yanına qaçdı. Bir müddət keçəndən sonra, Cəfərqulu xanın başına dönüklük havası düşdü. Bunu eşidən Sadıq xan Şirvandan Sərabə qayıdıb, onunla birləşdi və bir neçə başqa əmirlə üsyana başladı. Cəfərqulu xanı məhz bir xain kimi qələmə verən Sadıq xan, özü şahın sarayına gəldi. Lakin o, boş bir otaqda həbs edildi və burada da acından öldü.

Cəfərqulu xan Xoya getdi. Lakin, şaha sadiq olan qardaşı Hüseyn xan onu qəbul etmədi. O, bir neçə müddət avara gəzdi, qardaşı öləndən sonra isə, gəlib Xoyu ələ keçirdi. Bir vaxtdan sonra, şahın istəkli oğlanlarından olub, Azərbaycan işlərini inizama salmağa təyin edilən Abbas Mirzə tərəfindən məğlub edildi. Makuya və oradan da Rum sərhəddinə Koroğluya nisbət verilən Çənlibel adlı yerə gedib sakin oldu.

Rus hadisəsində Həsən xan Qubaya gəldikdən sonra, İbrahim xan Rudbarinin qardaşı oğlu Məhəmməd xan, Səlyanı ələ keçirdi, Əmir Kəlbəli Sultanın oğlu naib Mir Qubad Sultanı oradan çıxartdı.

Hicri 1213-cü (=1799) ildə, Şirvan vilayətinə və xüsusilə Ağsu şəhərinə şiddətli taun xəstəliyi düşdü, bir çox adam tələf oldu. Bu zaman Quba qoşunu rus qayıqları ilə gedib Səlyanı aldılar. Şeyx Əli xan 4000 ləzgi ilə oraya getdi. Rəməzan ayında öz yaxın adamlarının təhrikilə, zülmkarlığa və günah işlər görməyə başladı. O, qayıdandan sonra, şirvanlı Mustafa xan Rudbar əmirlərinin köməyi və Səlyanlıların təklifi ilə gedib Səlyanı aldı. Şəhəri köçürüb, dörd ağac yuxarıda, indiki yerində bina etdi. Hakimliyini də İbrahim xanın oğlu Əli xana verdi. Bir müddətdən sonra, buranı bölüşdürüb Əli xana və onun əmisi oğlu Məhəmməd xana verdi. Lakin Əli xan tez bir zamanda Məhəmməd xanı həbsə alıb, Talış Mir Mustafa xanın himayəsi altına keçdi.

Digər tərəfdən Şeyx Əli xan Səlyandan qayıdandan sonra Dərbənddə bərk xəstələndi. Qaziqumuqlu Surxay xan bu hadisədən istifadə edərək, bir gecə gizlincə öz oğlu Nuh bəyi Həsən xan adı ilə göndərib Quba qalasını aldı. Özü də qoşun ilə Qubanı Qullar adlı kəndində oturub, ay yarım hökmranlıq etdi. Şeyx Əli xan Şamxaldan, Aqquşa və Qoysuboy mahallarından 10.000 nəfər kömək aldı. Surxayı Qubadan çıxardıqdan sonra, Kürə üzərinə yürüdü. Şiddətli müharibə oldu. Surxay xan məğlub edildi, o nahiyədə ta Çıraq kəndinə qədər tamamilə qarət olundu. Şeyx Əli xan buraya qayıdaraq, ləzgiləri altı ay Qubada qonaq saxladı. Onların tələbatı üzündən qubalılara çox haqsızlıqlar edildi. Hətta əhalidən diş kirayəsi belə alınırdı. Şeyx Əli xan 8000 nəfərin məsarifini Quba maliyyatına verib, qalan 2000 nəfər ləzgini Dərbəndə gətirdi ki, onların maaşlarını da oranın mədaxilindən ödəsin.

Qubadakı kimi olan iki günlük qonaqlıq dərbəndlilərin ümumi iğtişaşına səbəb oldu. Xalq Şeyx Əli xanın eyş və işrət düşkünü olduğundan narazı idi. O, çıxılmaz bir vəziyyətə düşdü. Axırda, Şeyx Əli xanın görüşünə gəlmiş olan bakılı II Mirzə Məhəmməd xan, dərbəndlilərin yığıncağına gedib ləzgiləri buradan

çıxarmaq vədilə onları sakit etdi. Şeyx Əli xan bu məsələdən inciyib Qubaya üz qoydu.

Hicri 1214-cü (=1800) ilin əvvəllərində, Dərbənddə şiddətli taxıl qəhətliyi oldu. Taxıl gətirmək üçün şamxal mülkündən Qubaya gedən 400 arabanı dərbəndlilər döyüş və söyüşlə geri qaytardılar. Bu məsələ Şeyx Əli xanın xoşuna gəlmədi və bundan bərk incidi. Dərbəndlilər Sultan bəy Bayatın təhrikilə üsyan qaldırıb, Dərbənd naibi olan Məhəmmədhüseyn bəy Əhməd bəy oğlu Bayatı qovdular. Şeyx Əli xan Dərbəndə gəlib Sultan bəyin ətrafında çoxlu cəmiyyət toplandığını gördü. Labüd qalıb, öz bacısı və II Mirzə Məhəmməd xanın arvadı olan Xan bikə xanımı Dərbəndin sahibi ixtiyarı (hakimi) və Sultan bəyi də onun kargüzarı (müavini) təyin etdi.

Şeyx Əli xan Qubaya qayıdandan bir az sonra II Surxay xan Fətəli xanın oğlu Həsən xanı cürbəcür vasitələrlə Qaytaqdan öz yanına gətirdi. Aralarında bir çox ixtilaf olan dərbəndlilər ilə ittifaq etdikdən sonra, həmin ilin mayis (may) ayında Həsən xanı Dərbənd hökumətinə oturtdu.

Bir gecə Sultan bəy Bayat, Xızır bəy Qorçu ilə xan sarayında dava saldı. Hər iki tərəfdən bir çox adam tələf olub, Xızır bəy öldürüldü. Sultan bəy də, yaralı olaraq, aradan çıxıb getdi. Ertəsi gün, xanın əmri və dərbəndlilərin ittifaqı ilə Sultan bəy cəzalandı. Bu hadisədən sonra, Şeyx Əli xan Şirvan, Şəki və Bakı xanlarından, həmçinin şamxaldan və Aqquşa camaatından kömək aldı, hər iki tərəfdən Dərbəndin mühasirəsinə başladı. Yalnız Təbərsəran qadisi dərbəndlilərin tərəfini saxlayırdı. On iki günlük mühasirədən sonra, Şeyx Əli xan məqsədə çatmadan Qubaya qayıtdı. Ağır xəstə olduğundan onun ölüm xəbəri ətrafa yayıldı. Surxay xan qoşunla Eniq kəndinə gəldi və qarşısına çıxan Quba qoşununu məğlub etdi. Özü də Şeyx Əli xanın sağ olduğunu bilincə, vətəninə qayıtdı.

Bundan sonra, Quba hakimiyyətini Həsən xana vəd edərək qəflətən külli qoşunla Quba şəhərinin bir ağaclığındakı Zizik kəndinə gəldi. Şeyx Əli xan azacıq sağalmış olsa da, müdafiə üçün bir tədarükü yox idi. Arvadı, bakılı Hacı Məlikməhəmməd xanın qızı Zeybünnisa bəyim ruslardan qaçdığı zaman Surxay xanla ata - qızlıq peymanı bağlamışdı. Ziyafət mərasimini yerinə yetirməklə və dostluğu bildirən peyğamlar göndərməklə Surxay xanı geri qayıtmağa razı etdi. Həsən xan da çarəsiz qalıb Dərbəndə getdi.

Bir zaman keçəndən sonra, Şeyx Əli xan qəflətən gedib Dərbəndin Ulus nahiyəsinin 9 kəndini köçürüb Qubaya gətirdi. Beləliklə Həsən xanın əlində Dərbənd şəhərindən başqa heç bir yer qalmadı.

Həmin ilin axırlarında, Gürcüstan valisi Gürgin xan vəfat etdi. Bu ölkənin əyani və əmirləri daxili qarışıqlardan və xarici müdaxilələrdən xilas olmaq ümidilə, Rusiya imperatoru III Pyotrun oğlu I Pavelin dərbarına vəkillər göndərib, onun himayəsinə keçməyi xahiş etdilər. Bu xahişin qəbulunun bildirən imperator fərmanı, hicri 1215-ci (=1801) ildə, kanuni-saninin (yanvarın) 18-də sadir oldu. General-leytenant Knorrinq Gürcüstan hökumətinə təyin edildi. Bundan başqa

həmin ayın 23-də ayrıca bir fərman verilərək, ona tapşırıldı ki, onlardan vergi toplanmasın və daxili işlərinə qarışmasın. Yalnız o zaman müdaxilə etsin ki, onlar öz razılıqları ilə mənim himayəmi qəbul etmiş olsunlar, çünki, sülhpərvər müttəfiqlərə malik olmaq, etibarsız rəiyyəti başa toplamaqdan daha yaxşıdır.

Bundan sonra martın 12-də imperator Pavel birdən-birə vəfat etdi. Oğlu I Aleksandr səltənət təxtinə oturdu. Qafqazın işləri həmin qayda üzrə intizama düşməkdə idi. Keçən il Dərbəndli Həsən xan tərəfindən Hacı Tağı, qubalı Şeyx Əli xan tərəfindən Mirzə Əsgər, bakılı Hüseynqulu xan tərəfindən Mirzə Hadi bəy, Talış Mir Mustafa xanın və Dağıstan əmirlərindən Mehdi xan şamxalın, Rüstəm xan üsminin, avarlı Əmmə xanın və təbərsəranlı Rüstəm qadinin elçiləri ilə bərabər, himayə edilmək üçün səfarətlə Rusiya imperatorunun dərbarına göndərilmişdilər. Aqustos (avqust) ayının 28-də, bu əmirlərdən hər birinin adına imperatorun fərmanı sadir oldu. Bu fərmanda deyilirdi ki, onlar bir-birlərilə həmişə müdara edərək sülh ilə yaşasınlar və bölüşdükləri kimi Qubaya Şeyx Əli xan, Dərbəndə Həsən xan sahib olsun. Beləliklə iki qardaş çay kənarında bir-birlərilə görüşüb, qardaşlıq və xüsusiyyət mərasimini təzələdilər.

Bu qayda üzrə Aleksandrın səltənətindən iki ilə yaxın keçdi. Gürcüstana sahib olmaq Rusiya dövlətindən böyük məsarif və çox səy tələb edirdi. Başaçıq (İmeretiya) valisi və Minqreliya əmirləri Rusiya padişahı Aleksey Mixayloviçin zamanında, yardım almaq arzusu ilə həmin dövlət ilə əlaqə və rabitə qapısını açmışdılar.

Tarxu şamxalı, Bakı və Dərbənd xanları onun oğlu Böyük Pyotra tabe olmuşdular. Şirvan, Şəki Qarabağ və Gəncə xanları Qraf Zubov gəldiyi zaman himayə xahiş etmişdilər. Bunların bir çoxu təzədən yenə elçilər vasitəsilə tabe olmaq fikrində idilər. Buna görə, imperator Aleksandr bu böyük və mühüm işlərin sərəncamını əslən gürcü olub, Rusiyada yaşayan general-anşef knyaz Sisiyanova tapşırdı. Bu əmir daxili işlərin intizamına, ədalətin bərpa edilməsinə və xarici fütuhata son dərəcə səy edirdi.

Hicri 1217-ci (=1803) ildə Həsən xan çiçək xəstəliyindən ölümcül bir halda xəstələndi, dərbəndlilər onun görüşünə gələn Şeyx Əli xanın arvadı Zeybünnisa bəyimə vasitəçilik üçün yalvardılar. O da and içərək öz əri tərəfindən onları xətircəm etdi və vəziyyəti bildirmək üçün Qubaya bir qasid göndərdi. Şeyx Əli xan Həsən xanın vəfatını eşidən kimi, Dərbəndə gəlib, matəm mərasimini yerinə yetirdi. Sonra İmamqulu bəyi Dərbəndə naib qoyub Qubaya qayıtdı.

Bu zaman, bakılı Hüseynqulu xan, şirvanlı Mustafa xanın köməyilə Məşqətə qalasını aldı, Mirzə Məhəmməd xan Qubaya qaçdı və öz mülkünü geri almaq üçün vəsait toplamağa başladı.

Həmin il avarlı Əmmə xan Car nahiyəsində vəfat etdi. Zatən hünərli olan Əmmə xanın şən və şöhrətli, Fətəli xan dövrünün axırlarından başlayaraq daha da artmaqda idi. O, ətrafa etdiyi basqınlardan başqa, dəfələrlə Gürcüstana gəlib, Gümüşxananı talan və qarət edərək, Axısqaya getmiş və oradan Balakənə qayıtmış

idi. O, Gəncənin ətrafını qarət edərək, öz damadı qarabağlı İbrahim xanın köməyilə Naxçıvanı ələ keçirmişdi. Lakin tez bir zamanda Naxçıvan xanı tərəfindən məğlub edilərək Qarabağa qayıtmışdı. Gürcüstan valisi İrakli xan, öz mülkünün ətrafını qorumaq üçün, hər il ona 5000 manat verərək, onunla müdara edirdi. Keçən il Rusiya dövlətinin himayəsinə girdikdən sonra da, onun aldığı bu pul maaş şəklində yenə ona verilirdi. Heç bir vərəsəsi yox idi. Ögey qardaşı Gebek əmirlik arzusu ilə onun arvadı və Novsal xanın qızı olan Gehlini almaq istədi. Lakin, Gehli gizlicə Əmmə xanın bacısı oğlu Sultan Əhməd bəy Əli Sultan bəy oğlu Cənguqayi ilə əlbir olub, bir gecə Gebeyi aldadaraq öldürdü. Sultan Əhməd, Əmmə xanın bacısı oğlu olub, onun başqa arvaddan olan qızı - Paxu bikəni almışdı. Sonra gehli Avar xanı Sultan Əhmədi əmirliyə qəbul etdi. Sultan Əhmədin kiçik qardaşı Həsən xan öz ata-baba mülkü olan Mehdili əmirliyində qaldı.

Sonrakı il, Gürcüstanın ən böyük düşmənlərindən olan Cavad xan ibni-Şahverdi xan Ziyad oğlu, əvvəlcə Rusiyaya və daha sonra İrana zahiri itaət göstərməklə Tiflis tacirlərini qarət edirdi. Knyaz Sisiyanov Gəncəni almaq məqsədilə hərəkət etdi. Yuxarıda adı çəkilən Əli Sultanın qardaşı oğlu şəmsəddinli Nəsib Sultan onunla birləşdi. Cavad xan şəhərin xaricində müharibə edərək məğlub olub qalaya çəkildi.

Hicri 1218-ci (=1804) ildə, kanuni-sani (fevral) ayının 3-də, Rəməzan bayramı günü, sübh çağı qala hücum ilə alındı, Cavad xan bir neçə övladı və əhalidən bir çoxu ilə bərabər öldürüldü. Gəncə Yelizavetapol adı ilə adlandırıldı. Rus sərdarı, general-mayor Qulyakovu buradan Car nahiyəsinə göndərdi. O, çətin keçilən yerlərdə düşmənə hücum edib, məğlub edildi və özü də öldürüldü. Lakin bura ləzgilərinin gözü elə qorxmuşdu ki, bu hadisədən bir az sonra, Tiflisə vəkillər göndərib, üzr istədilər və səmimiyyət göstərdilər. Minqreliya, Abxaziya əmirləri və Başaçıq (İmeretiya) valisi Süleyman xan da sədaqətlə tabe oldular. İran dövləti bu cür fütuhatdan qorxuya düşüb, Gürcüstanı geri qaytarmaq ümidilə İran dövlətinə sığınan İrakli xanın oğlu Aleksandr Mirzəni, əmirləri və əhalini üsyana qaldırmaq üçün Gürcüstana göndərdi. Onun işini qüvvətləndirməyi, İrəvan və Qarabağı mühafizə etməyi isə, Abbas Mirzəyə tapşırdı.

İrəvan hakimi Məhəmməd xan Qacar, batində İran hökumətindən narazı idi. İrəvan elatının çoxunu Rum ölkəsinə göndərdi, özü də qalaya çəkilib, Rusiyadan kömək istədi. Knyaz Sisiyanov İrəvanı almaq qəsdilə yola düşdü. Üçkəlisa (Eçmiadzin) yaxınlığında, Qırxbulaq adlı yerdə, ruslardan dörd dəfə artıq qoşunu olan Abbas Mirzəni məğlub etdi. Bu zaman, sədri-əzəm Mirzə Şəfi, İrəvan qalasına gedib Məhəmməd xanı cürbəcür nəsihətlərlə İran dövlətinə tərəfdar etdi. Rus sərdarı qalanı mühasirəyə aldı. Müharibəyə gəlmiş olan şah özü də, məqsədə nail olmadan geri qayıtdı, lakin bir tərəfdən mühasirə müddətinin uzanması və yürüş ilə bir iş görülməməsi, digər tərəfdən də, azüqə azlığı və cürbəcür qorxulu xəstəliklərin baş göstərməsi, Rusiya sərdarını hicri 1219-cu (=1805) ildə, eylul (sentyabr) ayının 3-də Gürcüstana qayıtmağa məcbur etdi. Bu hadisədən sonra

ləzgilər, osetinlər və qabardinlər Aleksandr Mirzəni təhriklə üsyan edib Gürcüstana hücum etdilər. Beləliklə, Rusiyanın yolu bağlandı. Knyaz Sisiyanov mərdanə fütuhatla hamısını sakit etdi və Rusiyanın yolunu açdı. Həmin il Rus qoşunu dənizdən Rəşt üzərinə gəldi. Lakin müharibədən sonra məqsədə çatmadan Bakı bəndərinə qayıtdı. Hər iki tərəfdən top atışması başlandı. Nəhayət, ruslar sahilə çıxıb şəhəri mühasirəyə aldılar.

Qubalı Şeyx Əli xan və qaziqumlu II Surxay xanın oğlu Nuh bəy, bir dəstə İran qoşunu ilə Hüseynqulu xanın köməyinə gəldilər. Rus qoşunları gəmilərə oturub Talışın Sarı cəzirəsinə getdilər.

Bu zaman, Rüstəm xan üsmi vəfat etdi. Onun yerində Ustar xan oğlu Əli xan üsmi oldu. Araya ədavət düşdü. Mustafa xan Səlim xanı Qarabağdan gətirdib, Şəkinin üzərinə getdi. Məhəmmədhəsən xan qarşıya çıxaraq, vəziyyəti istədiyi kimi görməyib qoşunu azad etdi. Özü də Mustafa xanın yanına gəldi. Mustafa xan hər iki qardaşını Şirvana gətirib, əmisi oğlu Şeyx Əli bəyi Şəkidə naib təyin etdi. Lakin Şəki əhalisi üsyan qaldırdı. Onun qardaşı Məhəmmədhəsən xan tərəfindən kor edilən Fətəli ağanı xanlığa qəbul etdilər. Üç aydan sonra, Mustafa xan çarəsiz qalıb, Səlim xanı Şəkiyə hakim göndərdi və onun qızını özü üçün aldı. Məhəmmədhəsən xan Qubaya, Dərbəndə və buradan da Cara, axırda rusların yanına gedib, Hacı Tərxana göndərildi. O, cəsarətli, rəiyyətpərvər bir əmir olmaqla bərabər, mütəəssib və qan tökən bir adam idi.

Hicri 1220-ci (=1805) ildə, şahın vəliəhdi Abbas Mirzə, Naibüssəltənə ləqəbi ilə Azərbaycan hökmranlığına təyin edildi. O, qoşun və topxananı yenidən təşkil edərək, firəng (Avropa) üsulunda qalalar tikdirdi. Rus sərdarı Kürək çayı kənarında, qarabağlı İbrahim Xəlil xan ilə görüşdü. İbrahim Xəlil xan, bağlanan əhdnamə mucibincə, Rusiya dövlətinin himayəsinə daxil oldu və xərac olaraq hər il 10.000 əşrəfi verməyi öhdəsinə aldı. Özünü qorumaq üçün 50 saldat götürüb Şuşa qalasında yerləşdirdi. İmperator tərəfindən onun özünə general-leytenant rütbəsi, oğlanları Məhəmmədhəsən ağa və Mehdiqulu ağaya general mayorluq və Xanlar ağaya da polkovniklik rütbəsi verildi.

Digər tərəfdən, Naibüssəltənə (Abbas Mirzə) Qarabağı almaq qəsdilə, damğanlı İsmayıl bəyi və Şahsevən Əliqulu xanı 10.000 nəfər qoşunla Xudafərin körpüsündən göndərdi. Məhəmmədhəsən ağa rus qoşunu ilə onların qarşısına çıxdı. Cəbrayıllı bağlarında döyüşə başladı və Şuşaya qayıtdı.

Şah özü Qarabağın Təxti-Tavus adlı yerinə və Naibüssəltənə də Ağoğlan və Çanaxçı yolundan Əsgəranın aşağısına gəldi. Naibüssəltənə Gəncədən bir dəstə saldatla Şuşaya gedən polkovnik Karyagin ilə döyüşə başladı. Polkovnik qayıdıb Şah bulağı yanında olan Tərnaut qalasına gəldi. Buradan da gedib, Tərtər çayı kənarında yerləşmiş və 2000 saldatla şahın müharibəsinə gedən knyaz Sisiyanov ilə birləşdi.

Şahın oradan qayıtması xəbərilə əlaqədar olaraq rus sərdarı Şuşa qalasına gəldi. Naibüssəltənə də Gəncəyə getdi. Orada olan ruslar ermənilərin bir hissəsilə

qalaya çəkildilər. Naibüssəltənə, Gəncə əhalisini öz xahişlərinə görə köçürüb Qazağın Həsənsuyu yolu ilə Təbriz tərəfinə göndərdi. Özü də bir neçə gün Ağstafada qaldı. O, beləliklə, Qazaq, Bozçalı (Borçalı) mahallarını və Gürcüstanı öz tərəfinə çəkmək istəyirdi. Lakin məqsədinə çatmadan İrəvan tərəfinə qayıtdı. Qazaq əhalisi Dilican dərəsində onun qoşununun qabağını kəsib, qətl və qarətə başladılar. Knyaz Sisiyanov Şirvana gəlib zahirdə itaət göstərən Mustafa xan ilə görüşdükdən sonra Bakıya getdi. Sarıda olan ruslar da dəniz yolu ilə gəlib onunla birləşdilər.

Bəzi xidmətlər göstərmiş olan II Mirzə Məhəmməd xanın qardaşı Əbdürrəhim ağa, Qubadan Şirvana, sərdarın hüzuruna gəldi. O hərçənd Hüseynqulu xanın İran tərəfdarı olduğunu söyləyirdi, lakin sərdar onun sözünü qərəzsiz sanmayıb qəbul etmirdi.

Sərdar, hicri 1220-ci (=1806) ildə şübatın (fevralın) 2-də qalanın yanında, Hüseynqulu xan ilə təslim olmaq haqqında danışıq apardı. Bu zaman sülh və müsalimət qanunu xilafinə olaraq iranlıların təhriki və ya Hüseynqulu xanın tapşırığı ilə onun bibisi oğlu İbrahim bəy ibni Əli bəy ağa ibni-Məhəmmədhüseyn xan ibni-İmamqulu xan Dərbəndinin əlində öldürüldü. Başı qatilin atasilə, şahın hüzuruna göndərildi. Ruslar gəmilərə minib Sarı tərəfə getdilər. Sərdar öldürüləndən sonra, Tarxu şamxalından başqa bütün xanlar üsyan qaldırdılar. Həmişə İran dövlətindən qorxuda olan və Rusiyanın himayəsini istəyən Talış Mir Mustafa xan, Mirzə Büzürg Qaimməqam ilə görüşdükdən sonra, xatircəm olub ruslarla ziddiyyətə başladı. Şirvanlı Mustafa xan, ruslara tərəfdar olan Səlim xan ilə ədavət binasını qoydu. O, Gəncədən Şəkiyə, Səlim xana köməyə gedən bir dəstə rus qoşununa mane olmaq istədi, lakin məğlub olub geri qayıtdı.

Başaçıq (İmeretiya) valisi Rusiyanın düşmənlərilə dostluq etməyə başladı. İranlılar yenə Arazdan keçdilər. Osmanlılar da öz dövlətlərilə sülhün pozulduğunu görüb, Gürcüstana soxulmağa hazır oldular. General-anşef qraf Qudoviç sərdarlığa (baş komandanlığa) təyin edildi.

Qarabağlı İbrahim xan bir çox ərizə göndərməklə İran dövlətinə ixlas göstərdi. Onun xahişinə görə, oğlu Əbülfəth xan bir dəstə qoşunla Qapan yolundan Şuşa qalasının yanına gəldi. Naibüssəltənə özü də Xudafərin körpüsündən keçdi. Şuşada sakin olan rus qoşununun komandiri mayor Lisaneviç, hicri 1221-ci (=1806) ildə, həziran (iyun) ayının 2-də gecə yarısı qalanın xaricində köç və külfətilə yerləşən İbrahim xanın üzərinə basqın edib onu arvadı, oğlu, qızı və bir çox əyan və xadimlərilə bir yerdə öldürdü. İbrahim xan hünərli, ədalətli, bərk ürəkli və sadə rəftarlı bir əmir idi.

Həmin gün Əbülfəth xan geri qayıtdı. İbrahim xan nəvəsi Cəfərqulu ağa Məhəmmədhəsən ağa oğlu Ordubadın yaxınlığına qədər onu təqib edərək, çoxlu qətl və qarət etdi. Mehdiqulu ağa atasının yerinə Qarabağ hökumətinə təyin edildi. Neçə vaxtdan sonra, Əbülfəth xan Şahsevən Ətaulla xanın köməyilə cəbrayıllı tayfasını və Qarabağın sair elatını köçürüb Qapan ətrafına getdi. Bu zaman ruslar

və Cəfərqulu ağa cəbrayıllı elinin üsyan qaldırmasından istifadə edərək, iranlıları çətin keçilən və meşəlik yerlərdə məğlub etdilər. İranlılardan bir çoxu qarət edildi, elat da öz məskəninə qayıtdı.

Bu zaman, Naibüssəltənə Aslandüz və Qarabağ yolu ilə Şirvana hərəkət etdi. İran qoşununun keçməsinə mane olmaq üçün Mustafa xanın Kür çayı kənarında yerləşdiyi cəmiyyəti dağıtdı. 6000 ailəyə yaxın olan Şəryan, Muradxanlı və sair elatı Muğana köçürdü. Özü isə, Ağsu şəhəri xaricində düşdü. Mustafa xan şəhəri köçürüb, çətinliklə gedilən Fit dağına çəkildi. Şeyx Əli xan şahzadənin xas atlılarından bir dəstəni Pirqulu xan Qacarın komandası altında Qubaya apardı. Özü bakılı Hüseynqulu xanla Naibüssəltənənin hüzuruna gəldi və sonra geri qayıtdı. Naibüssəltənə Şirvanda məqsədinə nail olmayacağını görərək Qaimməqamın oğlu Mirzə Əbülqasımı, iranlılardan qorxan Şəki hakimi Səlim xanın yanına göndərdi. Onu öz tərəfinə çəkmək istədi. Sonra, Pirqulu xanı Qubadan gətirib, Muğanda qalmağa məmur etdi, özü də Azərbaycana qayıtdı.

Qraf Qudoviç Qafqazın hər iki tərəfindən dəfələrlə səfər edərək ləzgi, os (osetin) və mıçıqıçları (çeçenləri) sakit etdi. General Qlazenapi Qızlar tərəfindən Dərbənd, Quba və Bakını almağa göndərdi. O, özünə tabe olan şamxal Mehdi xanla bərabər Buynaqa gəldikdən sonra, dərbəndlilər Mirzə bəy nəvəsi Əlipənah bəy oğlu Bayatın başına toplaşıb, rəftar və hərəkətlərindən narazı olduqları Şeyx Əli xanı şəhərdən qovdular. Generalın istiqbalına adamlar göndərib, tabe olduqlarını bildirdilər. Hicri 1221-ci (=1806) ildə, həziran (iyun) ayının 21-də, Dərbənd Rusiya dövlətinin ixtiyarına keçdi. Ulus mahalı, səmimi xidmətlərinə görə, Dərbənd xanı ləqəbi alan general-leytenant Mehdi xan şamxala, şəhərin naibliyi isə mayorluq rütbəsi alan Əlipənah bəyə verildi.

Bir ay keçəndən sonra, general-anşef Bulqakov, qoşun sərdarı təyin edilib Qubaya gəldi. Buradan da o zaman Hüseynqulu xanla birləşməsinə görə qubalı Şeyx Əli xandan incik olan II Mirzə Məhəmməd xanla Bakıya yola düşdü. Bakı şəhərinin altı ağaclığına çatanda cəsarətli, lakin təbiətən iradəsiz və ürəyi saf əmir olan Hüseynqulu xan öz təbəəsilə İrana qaçdı. Bakı əhalisi səmimiyyətlə tabe oldu. Bulqakov Bakını Rusiya dövlətinin ixtiyarına keçirdi. Qubaya qayıtdığı zaman, uzaqdan zahiri itaət göstərən Şeyx Əli xandan girov aldı. Surxay xan tərəfindən elçi gəlib, ixlas və səmimiyyət izhar etdi. Təbərsəranlı Qırxlarqulu məsum, Məhəmməd qadi və Qaytaq üsmisi Əli xan də itaətdə idilər. Bundan sonra, Gəncədə olan ruslardan bir dəstə Şirvana gəldi. Mustafa xan çarəsiz onları qəbul etdi. İstədi ki, onların qüvvəsilə öz elini Muğandan geri qaytarsın. O gedib elatı Talışa aparan Pirqulu xan Qacar ilə müharibəyə girişdi və məğlub olaraq geri qayıtdı. Buradan öz camaatını ruslarla Səlyana göndərdi. Mir Mustafa xan Talışın qardaşı Mir Bağır bəy 300 nəfərlə orada idi. Səlyanlılardan bir hissəsi öz hakimləri Əli xandan narazı olduqları üçün şirvanlı Mir Mustafa xanla gizli əlaqə saxlayırdı. Səlyanlılar müharibədən üz çevirdilər. Əli xan da qaçdı. Mir Bağır bəy talışlarla bərabər əsir düşdü.

Bu zaman Şəki hakimi Səlim xan, İbrahim xanın arvadı olan öz bacısının öldürülməsi ədavətilə Rusiya dövlətilə çəkişməyə başladı. Bir müddət bundan əvvəl, Gəncədən özünə kömək gətirdiyi ruslardan bir neçə nəfərini öldürdü, qalanları Gəncəyə qayıtdılar. Bu hadisədən sonra general Nebolsin, sərdar Qudoviçin əmrilə Gəncədən Şəkiyə hərəkət etdi. Səlim xan, qabaqcadan Naibüssəltənədən çoxlu pul almışdı, Car və Avar ləzgilərini gətirib, mükəmməl qüvvə ilə, yerin çətinliyinə və lazımi hazırlığa arxalanaraq, müqavimətə girişdi. Müharibə zamanı ləzgilər qaçdı, o da naçar qalıb, ailə və əqrəbasilə vətənini buraxıb İrana getdi. Səlim xan xoşrəftar, kefcil və rəhmsiz bir əmir idi.

Hicri 1221-ci (=1806) ildə Şəki ölkəsi Rusiyanın ixtiyarına keçdi. Keçən il Koroğluya nisbət verilən Çənlibel adlı yerdə Rusiya dövlətinə pənah aparmış olan general-leytenant Cəfərqulu xan Dünbüli, Şəki hakimiyyətinə təyin edildi.

Qraf Qudoviç həziranın (iyunun) 18-də sərəskər Yusif paşanı Arpa çayı kənarında məğlub etdi. Sonra hicri 1223-cü (=1808) ildə İrəvanı almağa getdi. Ayrı bir dəstəni də, Qarabağ yolu ilə Naxçıvan üzərinə göndərdi. Nabüssəltənə də gəldi. Bu ətrafda arası kəsilməyən müharibələr oldu. Axırda qış zamanı, soyuğun şiddətindən Rusiya qoşunu məqsədə çatmadan geri qayıtdı. Həmin cəsarətli və zabitəli bir əmir olan Üsmi Əli xan vəfat etdi, qardaşı Adil xan yerinə keçdi.

Keçən il şirvanlılar gəlib Bərmək mahalının qoyunlarını qarət etmişdilər. Şeyx Əli xan bunun əvəzini almaq üçün Şirvan üzərinə gedib müharibə etdi və cüzi bir qarətdən sonra geri qayıtdı. Buna görə qədimdən bəri Fətəli xan sülaləsinə ədavət bəsləyən Mustafa xan, Şirvanda sakin olan rus sərkərdəsi podpolkovnik Tixanovski ilə Quba üzərinə hərəkət etdi. Bir neçə döyüşdən sonra, buduqlu Məlik Adi nəslindən olan Məlik bəy Hacı bəy oğlu, bəylər və əhalinin çoxu Şeyx Əli xandan üz çevirib Rusiya dövlətinin itaətinə keçdilər. Şeyx Əli xan eyş və işrətpərəst olub, ölkənin vəziyyətindən xəbərsiz idi. Lakin çox şücaətli, səxavətli və yüksək himmətə malik bir zat idi. O, bir çox bəy və sair tərəfdarları ilə bərabər Təbərsəran nahiyəsinə, öz damadı Abdulla getdi. Bura əhalisinin çoxu onun ehsan və iltifatına borclu və sülaləsinin tərəfdarı idilər.

Qırx gün keçdikdən sonra Şeyx Əli xan 5000 nəfər qoşunla yenə Qubaya gəldi. Qaladan başqa bütün ölkəni ələ keçirdi. Şabran qalası yanında, kömək üçün Bakıdan Qubaya gələn bir dəstə rusla müharibə edib, bir iş görə bilmədi. General-mayor Quriyev öz qoşunu ilə Bakıdan gəlib çatdı. Çərxi kəndində onu məğlub etdi. Şeyx Əli xan yenə Təbərsərana getdi. Quba ölkəsi daimi olaraq Rusiya dövlətinin ixtiyarına keçdi. Buranın ixtiyarı Bakı və Qubanın alınmasında bir çox xidmətlər göstərmiş olan bakılı II Mirzə Məhəmməd xana verildi.

Şeyx Əli xan Təbərsərana qayıdandan sonra Ersi kəndində sakin oldu. Rüstəm qadinin oğlu Abdulla bəy, qardaşları və əmisi Mirzə qadi ilə bərabər onunla müttəfiq idilər, Dərbənd və Quba ətrafında çapqınçılıq və müharibə edirdilər. Rusiya qoşunu da Təbərsəranın bəzi əmirləri və Dərbənd qoşunu ilə

Mehraqa kəndi üzərinə yürüdülər. Şeyx Əli xan və Rüstəm qadinin oğlanları, Mirzə qadinin köməyinə gəldilər, lakin məğlub olub geri döndülər...

Hicri 1224-cü (=1809) ildə, general-anşef Tormasov qraf Qudoviçin yerinə sərdarlığa keçdi. O da Başaçıq (İmeretiya) və Abxaziya asayiş yaratmaqda idi. Bu zaman İran şahının oğlu və Kirmanşahın fərmanfərması olan Məhəmmədəli Mirzə Gürcüstan səfərinə göndərildi. Ona kömək olaraq Naibüssəltənə İrəvanın Göycə yaylağına və Fərəculla xan Nəsəqçibaşı Muğan hüdudunun mühafizəsinə təyin edildi. Məhəmmədəli Mirzə, damqanlı İsmayıl bəyi bir dəstə Bəy kəndi və Hamamlı kəndlərindəki rusların üzərinə göndərdi. Bir neçə dəfə müharibə oldu. İrəvanın Pənbək və Şuragil sakini olan keçmiş elatı və xüsusən Nağı bəy İran dövlətinə bir çox yararlı xidmətlər göstərdilər. Bunun ardınca, Məhəmmədəli Mirzə gəlib Bozçalı (Borçalı) mahalını çalıb-çapdı. Sonra, Abbas Mirzə gizli olaraq onun işlərinə qarışdığı üçün, Qars hüdudundan İrəvana və buradan da Kirmanşahına getdi. Fərəculla xan Nəsəqçibaşı Ərdəbilə gəldikdən sonra şahsevən Nəzərli xandan (talışlara qarşı) qoşun toplamağı tələb etdi. Lakin o, Mir Mustafa xan Talışla qohum olduğundan işi ləngidirdi. Mir Mustafa xan məhşur adamlardan bir hissəsini və Talış qoşununu köçürüb Gamışvanda yerləşdi. Bura hər tərəfdən dəniz və mürdab ilə əhatə olunmuşdu, yalnız bir tərəfdən - qurudan Ləngərkünan (Lənkəran) ilə bitişirdi. O, kömək olaraq ruslardan da bir dəstə gətirdi. Bundan bir az əvvəl, Şirvanın möhtərəm adamlarından biri sayılan Ömər sultan Sədari, hər iki Mustafa xanı barışdırmaq və Şirvan elini geri köçürmək üçün Talışa gəlmişdi. Mir Mustafa xan Talışın oğlu Mir Həsən bəyin davasında qəflətən öldürülmüşdü. Buna baxmayaraq, Mir Mustafa xan yenə öz oğlu Mir Hidayət bəyi kömək istəmək üçün şirvanlı Mustafanın yanına göndərdi. Mustafa xan Şirvandan Gamışvana bir dəstə piyada qoşun yola saldı.

Mir Həsən bəy bir dəstə ilə, Ucarud hüdudunda olan bakılı Hüseynqulu xanın, şirvanlı Mustafa xanın qaçqın qardaşı Haşım xanın, rudbarlı Əli xanın, Bekdili Məhəmməd xanın üzərinə qəflətən hücum etdi. Əli xan və Məhəmməd xan əsir düşdülər, o birilər isə qaçıb qurtardılar. Nəsəqçibaşı vaxtın tələbinə görə əlində olan ixtiyara əsasən, şahsevən Nəzərli xanın və Fərəculla xanı həbsə aldı, Ləngərkünan (Lənkəran) şəhərini yandırdı, Gamışvanı mühasirə etməyə başladı, lakin bir iş görə bilmədi. Axırda, barışıq sözü araya düşdü, mirzə Büzürg Qaimməqam şah tərəfindən gəlib Mir Mustafa xanla görüşdü, əhdnamə və dostluğu möhkəmləndirdi.

Hicri 1225-ci (=1810) ildə, il yarımdan artıq Təbərsəranda qalmış Şeyx Əli xan, əcdadı səfəvilər dövründən Şeyx Cüneyd türbəsinin mütəvəllisi olan həzrəli Xan Butay bəy Hacı Şərif bəy oğlunun təhrikilə gəlib Quba əhalisinin çoxunu özünə müttəfiq etdi, ölkəni almaq və qalanı mühasirə etməklə dörd ay məşğul oldu. O, əhalinin bir hissəsini Qrız kəndinə köçürüb, yeni bir şəhər salmışdı. Bu zaman polkovnik Lisaneviç rus qoşunu, Şəki və Şirvan atlıları ilə gəlib Şeyx Əli xanı Çiçi kəndi yaxınlığında məğlub edərək ölkədən çıxardı. Şeyx Əli xan yenə Aqquşaya

gedib orada sakin oldu. Damadı Abdulla bəy də, Təbərsəranda qala bilməyib onunla birləşdi.

Bir zaman keçəndən sonra, Şeyx Əli xan Aqquşa əhalisindən və öz təbəələrindən üç minə yaxın bir cəmiyyətlə maniəsiz Üsmi mülkündən keçib Təbərsərana gəldi. Rüstəm Qadidən sonra qardaşı polkovnik Məhəmməd qadi hökumət başına keçmişdi. O, yalnız bir keçidi olan Xoçni kəndinin yarım ağaclığında bir yerdə səngər düzəldib müdafiəyə başladı. Ləzgilər yürüş etmədilər. Şeyx Əli xan öz nökərləri ilə hücum edib, səngəri aldı. Məhəmməd qadi qaçdı, Abdulla bəy isə Xoçnidə onun yerinə keçdi.

Şeyx Əli xanın qayıtmasından iki ay sonra, Məhəmməd qadi yenə gəlib Abdulla bəyi çıxartdı və öz yerində əyləşdi. Xülasə, bir müddət Rusiya, Rum (Türkiyə) və İran hüdudları döyüş meydanı və xüsusən Qarabağ ölkəsi qoşunkeşlik və elat gediş-gəlişinə məxsus bir sahə olmuşdu.

Hicri 1226-cı (=1811) ildə, general Tormasov Fransa ilə müharibə etmək üçün, Rusiyaya çağırıldı. General-leytenant markiz Pauluççi onun yerinə keçdi.

Şeyx Əli xan aqquşa qazisi Əbubəkrin köməyi və İran dövlətinə onun adına göndərilən vəsaitlə, Aqquşa əhalisini təkrar müharibəyə təhrik etdi. Aqquşa, Mehdili, Təbərsəran və Qaziqumuqdan topladığı səkkiz min nəfərə yaxın bir ordu və II Surxay xanın oğlu Nuh bəylə birlikdə Qubanın üstünə gəldi. Ləzgilər öz atlarını Kürə nahiyəsinin Samur çayı kənarındakı Məhərrəm kəndindən Təbərsərana qaytardılar. Özləri piyada olaraq Cibir kəndinə getdilər. Ertəsi gün general-mayor Quriyev onların üzərinə hərəkət etdi, lakin Quba bəylərinin ona göstərdikləri əlverişli qərb yolunu qoyub şərq tərəfdəki yoldan hücuma keçdi. Yolun çətinliyi üzündən məğlub olub Zeyxur kəndinə qayıtdı.

Şeyx Əli xan Rustov kəndinə gedib, ölkəni yenə öz itaəti altına keçirdi. Yalnız Quba qalası və Zeyxur kəndi rusların əlində qaldı.

İki aydan artıq keçəndən sonra, general-mayor Xatuntsev yeni bir qüvvə ilə yetişdi. Şeyx Əli xanı Rustov kəndində məğlub edib, ölkədən çıxardı. Ləzgilər çox tələfat verdilər. Aqquşa qazisi Əbubəkr də bu döyüşdə öldürüldü. General Xatuntsev, Surxay xanı cəzalandırmaq üçün Kürə nahiyəsinə hərəkət etdi. Surxay xanın qardaşı oğlu Aslan ağa Şahmərdan oğlunu öz yanına çağırdı. O, keçmişdə öz əmisi Surxay xanın yanından Rum (Türkiyə) ölkəsinə qaçmış, keçən il Tiflisə və oradan da Qaytağa, üsminin yanına gəlib orada sakin olmuşdu. General Xatuntsev Şeyxi kənddə səngər atmış Surxay xanın üzərinə yürüşə başladı. Surxay xan məğlub olub Qaziqumuğa qaçdı. Kürə nahiyəsi rusların əlinə keçdi. Aslan ağa polkovnik rütbəsi və xanlıq ləqəbilə buraya hakim təyin edildi. Onu qorumaq üçün də Qurahda bir batalyon saldat saxlanıldı. O, hünərli, zabitəli, bədməzac və içki sevən bir əmir idi.

Şeyx Əli xan Qubadan qaçdıqdan sonra, bir zaman Sunbat kəndində, onun yaxın adamları isə, Cümcüqat kəndində olurdular. O, Əbubəkr qazinin oğlu Bəhanın köməyi və sair vasitələrlə yenə Aqquşaya gedib orada məskən saldı.

Həmin ilin axırında, İrana tərəfdar olması qəti zənn edilən polkovnik Cəfərqulu ağa Məhəmmədhəsən ağa oğlu həbsə alınıb, ruslardan bir dəstə piyada və bir neçə nəfər kazakla Tiflisə göndərildi. Tərtər çayından keçərkən, Cəfərqulu ağa atının cilovunu saldatın əlindən qapdı, özü ilə bərabər atın sağrısında oturan o biri saldatı suya salaraq, Cəbrayıllı elinin arasına qaçdı. Bu xəbər Naibüssəltənəyə çatan kimi Qarabağa gəldi. Əmir xan Qacarı, Cəfərqulu ağa ilə Cəbrayıllı elini və Qarabağın sair elatını köçürməyə məmur etdi. Özü isə, topxana və sərbazla Sultan Bud səngəri üzərinə gəldi. Burada qarabağlı Mehdiqulu xanla bir rus batalyonu var idi. Bunları məğlub edib bir çoxunu öldürdü və sağ qalanlarını əsir aldı. Mehdiqulu xan isə qaçıb qurtardı.

Əmir xan və Cəfərqulu ağa beş-altı min ailəni Arazdan keçirib, Naibüssəltənə ilə birləşdilər. Naibüssəltənə Qarabağ elatını yerbəyer edib, Qaradağ kəndlərinin hökumətini xanlıq ləqəbilə Cəfərqulu ağaya verdi. Özü də Təbrizə qayıtdı.

Bu zaman qaziqumuqlu Surxay xan Kürə üzərinə gəldi. Aslan xan rus batalyonu ilə gedərək Qurahdan üç ağac yuxarıda Kərxən kəndində onu məğlub etdi. Surxay xan da Aslan xanın anasından olan öz oğlu Mürtəzaəli ağanı Qaziqumuq hakimliyinə təyin edib, özü İrana getdi. Aslan xan öz ana qardaşının yanına gedib orada sakin oldu. Surxay xan bir il sonra İrandan qayıtdı.

Mürtəzaəli xan, Aslan xanın qardaşı Fətəli ağanı götürüb, müharibə bəhanəsilə qarşıya çıxdı. Lakin o, yolda Fətəli ağanı öldürüb öz atası ilə birləşdi. Aslan xan Kürəyə qayıtdı. Surxay xan da yenə Qaziqumuğa sahib oldu. Surxay xan alim, rəiyyətpərvər və qantökən bir əmir idi.

Markiz Pauluççi Naibüssəltənənin gəlmək xəbərini eşidincə, tam sürətlə Qubadan Qarabağa gəldi. O, general Kotlyarovskini Qubada qoydu, özü isə ... Tiflisə getdi. Buradan da qulluqdan çıxarılaraq Rusiyaya qayıtdı. General-anşef Rtişşev onun yerinə sərdar göndərildi.

Hicri 1227-ci (=1812) ilin baharında, Naibüssəltənə şah tərəfindən göndərilmiş külli ləvazimat və qoşunla Mişkin qəsəbəsinə varid oldu. Əmir xan Qacar sərbaz və topxana ilə bu tərəfdən, sair əsgərlər də, onun ixtiyarında olaraq Ərkəvan, Zuvand və Astara səmtində Talış Mir Mustafa xanı cəzalandırmaq üçün göndərildi. O yenə İran dövlətindən üz çevirib, rusları öz köməyinə çağırmışdı. Əmir xan aqustos (avqust) ayının dördündə, Ləngərkünana (Lənkərana) çatdı. Ruslar döyüşdən sonra Mir Mustafa xanla bərabər Gamışvana çəkildilər. İranlılar Gamışvanın qarşısında səngər və burclar düzəltdilər. İki ay dənizdən və sahildən atışma davam etdi. Gamışvanı almaq mümkün olmadı. Naibüssəltənənin əmrilə Ləngərkünanda (Lənkəranda), Ərkəvanda və Astarada üç qala tikildi və bu qalalara mühafizlər, topxana və azuqə təyin olundu. Qalan qoşun isə, geri qayıtdı.

Bu zaman İngilis elçisi ser Qrozli vasitəsilə barışıq söhbəti araya atıldı. Rusiya sərdarı Naibüssəltənə ilə Arazın kənarında danışığa başladı. Lakin bu danışıq bir nəticə vermədi. Sərdar Rtişşev, Kotlyarovskini 2000 saldat və altı topla

Arazın kənarında qoyub özü Tiflisə qayıtdı. Naibüssəltənə Pirqulu xan və Mirzə Məhəmməd xan Qacarı və Əlimərdan xan Xəmsəni atlı dəstələrilə Sultanhasardan Şəki ölkəsinə göndərdi. Özü də sərbaz və topxana ilə Aslandüz adlı yerə gəldi. Sadıq xan Qacarı və Cəfərqulu ağanı, eli köçürtmək üçün Qarabağa göndərdi. Ağoğlanda dayanan general Kotlyarovski, gecə gizlicə Arazdan keçib, səhər çağı öz qoşunundan bir neçə qat artıq olan İran ordusu üzərinə hücum edib onları məğlub etdi. İranlıların bir hissəsi olduqca pərişan bir halda qaçdı. Naibüssəltənə isə, qalan qoşunla müharibəni davam etdirdi. General ertəsi gecə, təşrin-əvvəlin (oktyabrın) 20-də hücum edib, onları tamamilə dağıtdı. Bir çoxlarını öldürüb, külli qənimətlə geri qayıtdı. Şəki və Qarabağa təyin edilən qoşunlar da, bu xəbəri eşidincə, qayıdıb Naibüssəltənə ilə Mişkidə birləşdilər. Buradan da Təbrizə getdilər.

General Kotlyarovski Muğana gedib, burada olan Qarabağ elatını geri qaytardı və Ərkəvan qapasını yürüşlə aldı. Sonra Ləngərkünana (Lənkərana) gedərək, oranın qalasını mühasirə etdi. Hicri 1228-ci (=1813) ildə, kanuni saninin (yanvarın) birində, aşura axşamı yürüşə başladı. Hər iki tərəf şiddətli müqavimət göstərib, mərdanəliklə vuruşdu. Axırda rus generalının qorxu bilməz təbiətinin qüvvəti sayəsində qala alındı. Qala mühafizlərinin sərkərdələri olan sərhəng Sadıq bəy və Məhəmməd bəy Qacar Rus və müsəlmanlardan bir çox adamla bərabər öldürüldü. Kotlyakovski özü də üç ağır yara aldı.

Həmin ilin baharında, İran dövləti Ruslar tərəfindən alınan ölkələri geri qaytarmaqdan naümid oldu. Rum (Osmanlı) barışığı və Xorasanda baş verən iğtişaş nəticəsində, şah barışığa meyl göstərdi. Mirzə Əbülhəsən xan Şirazi, İran dövləti tərəfindən vəkil edildi. Sərdar Rtişşev də gəldi. Qarabağın Gülüstan adlı yerində, hicri 1228-ci (=1813) ildə, təşrin-əvvəl (oktyabr) ayının 12-də, Rusiya ilə İran dövlətləri arasında əhdnamə bağlandı. Bu əhdnaməyə görə İran dövləti Gəncə, Qarabağ, Talış, Şəki, Şirvan, Bakı, Quba, Dərbənd xanlıqlarını, bütün Dağıstanı, Gürcüstanı və ona həmhüdud olan ölkələri Rusiya dövlətinə tərk etdi. Onlar haqqında hər cür iddiadan əl çəkdi.

Rusiya imperatoru da öhdəsinə aldı ki, şah hansı bir övladını vəliəhd təyin etsə, ona yardım göstərsin və hüququnu müdafiə etsin.

# NƏTİCƏ

## *ŞİRVAN VƏ ONA QONŞU OLAN VİLAYƏTLƏRDƏN YETİŞMİŞ TƏLİFAT SAHİBİ VƏ YA BAŞQA BİR MƏZİYYƏTƏ MALİK ŞƏXSLƏRİN TƏRCÜMEYİ-HALLARI HAQQINDA*

Hər bir tayfanın kəmalat dərəcəsini, vəziyyət və hallarının gözəlliyini onların təlifatından və sair əsərlərindən gözəlcəsinə anlamaq olar. Bir çox şəhər və kənd xarabaları, Həzrət Şəmunun Aran şəhərində və yüksək dərəcəli üç imamzadənin Şamaxı, Gəncə və Bərdə şəhərlərində olan türbələri, Bülbülə kəndindəki imamzadə, imam Museyi-Kazımın qızı Həlimə xatunun Bakıda, Bibiheybətdəki türbəsi, Sufi Həmidin şirvan Qabıstandakı məzarı və bir çox başqa yerlərdə olan məşhur seyidlərin, şeyxlərin və hörmətli fazil kimsələrin qəbirləri göstərir ki, bu ölkə həmişə din böyüklərinin məskəni, arif və alimlərin vətəni olmuşdur. Başqa faydaları bir tərəfə dursun, bu ölkə mötədil iqlimli ən yaxşı yerlər sırasına daxildir. Öz dağlarında, çöllərində, meşələrində və vadilərində bütün dünyanın müxtəlif məhsulatını və vadilərində bütün dünyanın məhsulatını yetişdirməkdədir. Bu ölkədə yaşayanların nəsli bütün insan tayfalarından qarışıqdır. O tayfalardan hər birinin əxlaqı və asarı bunlarda görünməkdədir...

Əgər bu ölkə əhalisinin təbii istedadını inkişaf etdirmək üçün lazım gələn asayiş və tərbiyə üsulları yaradılsaydı, o zaman bunlar nə böyük tərəqqiyə nail olardılar!

Çoxlu qoşunkeşlik və mütəmadi müharibələrin yaratdığı xarabalıqlara baxmayaraq, onlardan bir çoxu özünün elm və hünəri ilə bütün dünyada şöhrət qazanmışdır. Onlar hər bir əsrdə, hər bir ölkədə hörmətli və inanılmış kimsələr olmuşlar. Lakin təəssüflər olsun ki, onların VI (XII) əsrdən əvvələ aid əsərlərindən bizə heç bir şey məlum deyildir. Həqiqətən böyük xaqan Mənuçehr və onun xəlifələrinin 400 illik səltənət dövrü, şirvanşahların ən gözəl əsri və Şirvanın abad zamanı olmuşdur. Səfəvilər dövrünün əvvəllərində olan osmanlı və qızılbaş döyüşləri bir neçə vaxt qarışıqlıq və iğtişaşa səbəb olmuşdu. Şah Abbasın zühurundan sonra bu ölkənin işləri nüfus və mənəviyatca dəyişikliyə üz tutub, etidal və müvazinət kəsb etdi. Hünər və mərifət bazarı başqa bir rövnəq tapdı. Şah Sultan Hüseyn dövrünün axırlarında isə fitnəkar fəsadçıların istilasından, müxtəlif orduların gediş-gəlişindən və Nadir şahın səfərlərindən tamamilə pərişan bir hala düşdü və bir çox yeri xarabazar oldu. Bundan sonra ölkənin vilayətlərini müstəqil surətdə öz ixtiyarlarına keçirmiş olan xanlar da mütəmadi müharibə nəticəsində maarifi inkişaf etdirməyə və rəiyyətlərinin halını yaxşılaşdırmağa müvəffəq ola bilmədilər. Hər halda, bu ölkənin alim və fazillərinin həyatı imkan daxilində hər birinin əsrinə müvafiq olaraq zikr edilir və azacıq da olsa onların əsərlərindən və fikirlərinin nəticələrindən qeyd olunur.

## *MÖVLANA ŞEYX ƏBUƏBDULLAH ƏLİ İBNİ-MƏHƏMMƏD BAKUYİ*

Bir çox tarixçilərin yazdığına görə, zahiri və batini elmlərdə kamil bir şəxs olmuşdur. O, ilk gənclik dövrlərindən başlayaraq böyük və məşhur simalarla söhbət etmiş və Şeyx Əbdullah Xəfif, Şeyx Əbülqasım Qəşiri və Şeyx Əbusəid Əbülxeyirlə görüşmüşdür. Şeyx Əbusəid ilə onun arasında bir çox elmi mübahisələr olmuşdur. Bir müddət də, Şeyx Əbülabbas Nəhavəndi ilə təhqiqata başlamış, həmin şeyx onun fəzilətini təsdiq və onu tərif etmişdir. Ömrünün axırlarında Şiraz şəhərinə yaxın bir dağın mağarasında guşənişinlik qəbul etmişdir. Ölkənin bir çox şeyləri və böyük alimlər onun söhbətinə yetişmişlər. O, hicri 442-ci (=1051) ildə həmin ölkədə vəfat etmişdir. Heyf ki, onun əsərlərindən əlimizdə heç bir şey yoxdur.

## *MƏŞHUR ŞAİRƏ MƏHSƏTİ GƏNCƏVİ*

«Məh» farsca «mah» sözünün yüngülləşdirilmiş şəkli və ya böyük mənasında olub, «səti» xanım deməkdir. Azər «Atəşkədə» kitabında yazır ki, Məhsəti Gəncə əşrafı xanədanından olub, Sultan Səncərin nədiməsi idi. Bu sayədə tam bir etibara və şövkətə malik olmuşdu. Onun divanından və coşqun təbindən nümunələr:

Rübai

O gözəlin üzü yasəmən və qızıl gül üçün həsəd və
qibtə mənbəidir.
Onun şux qəmzəsi kişilərlə qadınlar arasında
fitnə salmışdır.
Onu yolda gedərkən gördüm, o, axar su kimi lətif idi,
O, axar sudan indi də mənim gözümdə vardır.

Yenə onundur:

Hər gecə sənin qəmindən yeni bir əzab çəkirəm.
Gözümdə yuxu əvəzinə yaş görürəm.
Sənin nərgisin (gözlərin) kimi məni yuxu aparan zaman,
Sənin zülfündən daha qarışıq bir yuxu görürəm.

Yenə onundur:

Bizi qocaların yanında saxlamaq olmaz.
Bizi qəmgin adamların evində saxlamaq olmaz.

O kimsə ki, zülfün ona zəncir kimi ola,
Onu evdə zəncir ilə tutub saxlamaq olmaz.

Yenə onundur:

Əfsus ki, sənin çiçəyinin çevrəsini tikan bürüdü,
Qarğa gəldi, laləni dimdiyinə aldı,
Sənin çənənin civəsi qaraldı (üzünün qırmızılığı getdi),
Sənin ləl kimi olan dodağın paslandı (göyərdi).

## *HƏKİMİ-MƏNƏVİ ŞEYX NİZAMİ GƏNCƏVİ*

O cənabın künyəsi və adı Əbu Məhəmməd Nizaməddin İlyas ibni-Yusif ibni-Müəyyəd olub, doğulduğu və öldüyü yer Gəncədir. Onun böyüklüyü və fəzilətlərini söyləməkdən dil acizdir. Sözlərindən şairlik dərəcəsi və rəyi aşkardır. Zərifliyi, söz və söhbətilə məclis bəzəməkdə, ümumun rəyincə onun misli olmamışdır. Bütün şairlər onun ustalığını etiraf etmişlər.

Onundur:

Bu fənndən (şairlikdən) istəmə,
Bu (şöhrət) Nizami ilə bitmişdir.

İlk gənclik dövründə Vis və Ramin kitabını Sultan Mahmud Səlcuqi adına nəzm etmişdir. Bəziləri bu kitabı Nizami Əruziyə nisbət verirlər, lakin təlif dövrünü nəzərə aldıqda bu fikir doğru çıxmır. Cənab Şeyx, Əxi Fərəc Zəncaninin müridlərindən olub, ömrünün axırlarında guşənişinlik rəsmini qəbul edərək, batini saflaşdırmağa məşğul olmuşdur. Bu xüsusda özü deyir:

Rəna gül qönçə arasında həzin-həzin,
Mənim kimi guşənişinliyə (inzivayə) çəkilmişdir...

Şeyx hicri 576-cı (=1181)[69] ildə Tuğrul ibni-Arslan dövründə vəfat etmişdir. Gəncənin yaxınlığında gözəl bir türbəsi vardır. Xarabalığa üz tutmuş olan bu türbənin bəzi yerlərini, Qarabağda yaşayan qazaqlı Mirzə Adıgözəl indi təmir etdirməkdədir. Şeyxin Məxzənül'əsrar, Həft peykər, Leyli və Məcnun, Xosrov və Şirin və İskəndərnamədən ibarət olan beş mənzum dastanını vəfatından sonra alim adamlar toplayıb, «Xəmsə» adlandırmışlar. Bu əsər şer sənəti nöqteyi nəzərindən bütün dünyada məşhur olub, müəllifinin kəskin fikrinə və qüvvətli təbinə açıq

[69] Mətndə yanlışlıq var, qəbri üzərindəki kitabəyə əsasən Nizami 576-cı (=1181) ildə deyil, 605-ci (=1209) ildə vəfat etmişdir.

şahiddir. Onun «Xəmsə»dən başqa 20.000 beytdən ibarət bir divanı olmuşdur. Bu divanda onun sənətkaranə üçün yazılır:

Dünya qaranlıq və yol çətindir, atının cilovunu çək.
Bir müddət varlıq aləmindən ruhani aləmə çəkil.
Təbiət qarğalarını ünsiyyət bağından qov, çıxar.
Səadət quşlarını imtahan toruna çək.
Elə ki, mənəviyat aləminə aşina oldun...
Minlərcə mənəviyat şərbətini birnəfəsə bol-bol iç.
Onun hikmətilə sərməst olunca fələkin çadırını yıx, dağıt.
Ərşin sütununu sarsıt, göyün ipini çək.
Onun yolunu ayaqla getmə, onun camalına batini gözlə bax.
Onun sözünü dil ilə söyləmə, onun şərabını ağızla içmə.
Ey Nizami, bu nə əşardır ki, sənin təbindən büruzə gəlir!
Heç bir kəs sənin rəmzini bilmir, dilini saxla, dilini saxla!

## *USTADÜŞŞÜƏRA ƏBÜLÜLA GƏNCƏVİ*

Onun haqqında ancaq bu qədər məlumdur ki, o böyük xaqan Mənuçehrin dövründə Şirvanın məliküşşüərası olub, yüksək bir şən və iqtidara malik olmuşdur. Xaqani və Fələki onun şagirdlərindəndir. Həmdüllah Mustovfi Tarixi-küzidədə yazır ki, Əbül'üla öz qızını Xaqaniyə verdi. Əbül'ülanın qızını almaq istəyən Fələki bundan incidi və köçüb getmək istədi. Ustadı ona 20.000 dirhəm bağışlayıb dedi: Bu əlli türk kənizinin qiymətidir ki, hər biri mənim qızımdan daha gözəldir. Fələki buna razı oldu. Xaqani yüksək mövqe və şöhrətə malik olandan sonra, qürrələnib ustadının xatirini incidirdi. Əbül'üla bu xüsusda deyir:

Qit'ə

Sən ey Əfzələddin, əgər doğrusunu soruşsan,
Sənin əziz canına and olsun ki, səndən razı deyiləm.
Sənin adın Şirvanda dülgər oğlu idi,
Sənə Xaqani ləqəbini mən verdim,
Sənə çox yaxşılıq etdim.
Sənə oğul deyib, müəllimin oldum.
İndi nə üçün mənim hörmətimi saxlamırsan?
Sənə qız, mal və şöhrət verdim.
Mənə nə qədər deyəcəksən ki, bir çox sözlər söylədin!
Bu cür sözlər yadımda deyildir.
Söyləmədim-söylədim, söylədim-söyləmədim,
Verdim-vermədim.

## *HÜSSANÜL'ƏCƏM XAQANİ ŞİRVANİ*

Onun ləqəbi və adı Əfzələddin İbrahim ibni-Əli Nəccar olub, əsli Şamaxının yuxarısında Məlhəmli kəndindədir. Bir çox elm və fənlərdə mahir və şerdə ustad olmuşdur. Yüksək bir mövqeyə malik olub, barmaqla göstərilirdi. Fazil kimsələr onu Hüssanül'əcəm deyə adlandırmışlar...

Əvvəllərdə təxəllüsü Həqayiqi idi, sonralar isə, Xaqani-kəbir tərəfindən ona Xaqani ləqəbi verilmişdir. Onun lətifələrindən biri budur ki, o bir gün aşağıdakı beyti yazıb, xaqanın hüzuruna göndərdi:

Mənə bir kürk bağışla ki, məni qucağına alsın.
Yaxud bir gözəl sevgili ver ki, qucağıma alım.

Vəşəq, dəri kürkə deyilir, vişaq isə sevgilinin çöhrəsindən ibarətdir. Xaqan qəzəblənib, Xaqanini öldürməyə əmr verdi. Xaqanın qəzəbi ona görə idi ki, nə üçün hər ikisini birdən istəməmişdir. Xaqani bunu xəbər alınca, bir milçək tutub Xaqanın hüzuruna göndərdi. Milçək göndərmək ona işarə idi ki, milçək bir nöqtə əlavə etməklə «ba vişaqi» sözünü «ya vişaqi» halına salmışdır.

Əsirəddin Axsikəti Xaqani ilə müşaərə (şe'rləşmək) arzusu ilə Türkistandan Şirvana gəlmişdi. Yolda Arslan ibni-Tuğrulun iltifatına nail olub, Xaqani ilə yazışmağa başladı. Xaqani bu qəzəli yazıb ona göndərdi:

Qit'ə

Əql mənim barmaqlarım arasındakı qələmin xəritə çəkənidir.
Söz mənim bir bir ifadəmin sevimli edəkçisidir.
Dünyanı yaradan Allaha and olsun ki,
Dövr mənim dövrüm və zaman mənim zamanımdır.
Söz qəhətliyi ilində mən zəmanənin Yusifiyəm,
Mənim dilim ürəyi acların[70] mehmannəvazıdır.
Mən heç bir kəsin boşboğazlığından[71] qorxmaram, çünki,
Mənimlə bir taledə[72] olan kimsə hələ yoxdur.
Mən şairlərin bədiiyyat aləmində vəhy alan peyğəmbəriyəm,
Bu gün söz e'cazı mənim bəyanımdadır.

Axırda maddi və mənəvi olaraq asudə yaşamaq zövqü onun könlünə düşdü və xaqanın xidmətindən çəkilmək istədi. Xaqan onun söhbətinə vurğun

---

[70] Söz aclarının.
[71] Hərzəkarlığından.
[72] Mənim kimi xoşbəxt.

olduğundan, onun guşənişinliyə çəkilməsinə icazə vermədi. Xaqani bir vaxt fürsət tapıb Şirvandan qaçdı. Xaqanın məmurları onu Bəyləqanda tutub, Xaqanın hüzuruna göndərdilər. Xaqani yeddi ay Şirvan və sair qalalarda həbsdə qaldı. Bu xüsusda uzun və gözəl bir qəsidə yazmışdır. Həbsdən sonra fəqr təriqətini qəbul edərək, Şirvandan çıxdı və böyük kərəm sahibi olan Cəmaləddin Musili ilə Hicazə (Məkkəyə) səfər etdi. Onun tərifində bir qəsidədə belə deyir:

Beyt

Onun qəlbin sultanı və xəlifəsi adlandıraram,
Çünki sultan ona ata, xəlifə isə qardaş deyə yazırlar.

Töhfətül'iraqeyn adlı əsərini bu səfərində yazmış və öz fəsahətini orada göstərmişdir. Divanı çox bəzəkli olub, söz mətanəti, ibarə və cümlə yaraşığı etibarilə son dərəcə gözəldir. Onun mükəmməl və uzun bir qitəsindən bir neçə beyt qeyd olunur:

Ey ibrətbin olan könül, gözünlə yaxşı bax!
Mədayin sarayını bir ibrət güzgüsü bil.
Bu həmin saraydır ki, xalqın üzünün nəqşindən,
Qapısının torpağı nigaristan divarına dönmüşdü.
Bu həmin dərgahdır ki, buraya Diləm,
Babilistan, Hindistan və Türküstan şahları gələrdilər.
Elə zənn et ki, həmin dövrdür, təfəkkür gözilə,
Sarayın dərgahının silsiləsinə və eyvanının dəbdəbəsinə bax.
Yer kürəsi sərxoşdur, çünki şərab əvəzinə,
Hürmüzün qafa tasında Nuşirəvanın ürəyinin qanını içmişdir.
Üzüm tənəyinin verdiyi şərab, Şirinin dodağının qanıdır.
Kəndlinin qoyduğu şərab küpü də,
Pərvizin su və palçığı ilə yoğrulmuşdur.
Burada nə üçün ağlayırsan deyə mənim gözlərimə gülürsən,
Burada ağlamayan gözlərə gülürlər.
Sən bilmirsən, Mədayini Kufə ilə bərabər tut.
Sinəndən təndir[73] və gözlərindən tufan tələb et.
Bu bəsirət dəryasına gör, buna iştirak etmədən keçib getmə.
Belə bir dəniz kənarından susuz keçmək olmaz.
Ey Xaqani! Bu dərgahdan[74] ibrət dilənçiliyi et,
Tainki bundan sonra sənin qapından də xaqan dilənçilik etsin.

[73] Od
[74] Mədayindən.

Səyahətdən gələnlərin dostlara hədiyyə gətirməsi adətdir,
Mənim bu mənzuməm də, dostların xatirəsi üçün bir hədiyyədir.

Müxtəlif rəvayətlərə görə, Xaqani hicri 590-cı (=1194) və yaxud 595-ci (=1198/9) ildə vəfat etmişdir. O, Təbrizin Sürxab adlı məhəlləsində, Məqbərətüşşüərada[75] basdırılmışdır.

## *FƏLƏKİ ŞİRVANİ*

Məşhur alimlərdən və fəsahətli şairlərdən biri olmuşdur. Adı Məhəmməd, doğulduğu və öldüyü yer Şamaxıdır. Fələki gəncliyindən nücum elmini təhsil etməyə başlamışdır. Fitri istedad və qabiliyyətinə görə, bu elmi mükəmməl bir surətdə öyrənmiş və şer söyləməyə də rəğbət göstərmişdir. İxtisasına uyğun olaraq «Fələki» təxəllüsünü qəbul etmişdir.

Şirvanşahın mədhində yazdığı bir qəsidədə deyir.

Sən yüksəklik və alicənablığın səması, dünya nöqtəsinin
mühitisən,
Sən gözəl xalq və səxavət dünyası, bəşər ailəsinin çırağısan.
Sən beşinci iqlimin padişahı, yeddi səyarənin fövqündə
səkkizinci yeganə bir ulduzsan,
Sən böyüklükdə ikinci Cəmşid, əzəmətdə padişahlar padişahısan.
Sən Zühəd dərəcəli, qəza əlli, qədər muradlı və fələk kinəlisən.
Sən şimal təbiətli, sübh qədər parlaq, Məsihə təsirli və mələk
nəfəslisən.
Sən Arəş kimi rəyi bəyənilmiş, Bəhmən kimi səxavətlisən,
Sən Rüstəm kimi cahangir, Neyrəm kimi hünərlisən.
Günəş üzlü Mənuçehr səmanın günəşidir,
O, qaranlıq aləmin üzündən zülm tüstüsünü sildi.

## *İZZƏDDİN ŞİRVANİ*

Öz əsrinin böyük fəzl və kəmal sahiblərindən biridir. O, fazil kimsələrin hamisi və əhli-hal adamların mürəbbisi olub, Xaqani ilə müasir idi.

Bu hissə onun şerlər məcmuəsindədir:

[75] Şairlər qəbristanında.

Qəsidə

Səba eli çiçəklikdən ətir saçdığı halda keçərkən,
Mən reyhanların qorxusilə şirin yuxudan ayıldım
Sevgilim yüz min bəzəklə bir çəmən guşəsindən,
Əlində şərabla dolu bir piyalə ilə keçib gedirdi.
Sübh kimi yaxasının düyməsini açmış,
Yanağına göy rəngli məxmurluq dağı çəkilmişdi.
Şəbnəm damlası altında gülnar yarpağı kimi,
Onun yanaqları şərab hərarətindən tərləmişdi.
Bağçada ruzgarın əsməsilə qızıl gül budağı kimi,
Onun gözəl qaməti badənin təsirindən əyilmiş kimi idi.
Onun gümüş kimi olan sinəsində köynəyin izi qalmışdı,
Onun lətif dodaqları nəfəs çəkmədən pörtülmüşdü.
O, güldüyü zaman ləl kimi olan dodaqlarının şəkli,
Yüksək dərəcəli Cəmşidin üzüyünə bənzəyir.
Onun ədaləti sayəsində məzlumların qapıları,
Əmin və amanlıqdan arxalarını fəraqət divarına söykəmişdir[76].

Yenə onundur:

Dünən gecə fələk məni sənin məhəllənə düşmüş görüb dedi:
- Soruşmursan, səni bu günə salan kimdir?
Dedim: - Onun gözəl gözləridir, dedi: - Heyhat!
Onlar (gözlər) sərxoşdurlar, çıx, get, ta səni öldürməsinlər.

## *MÜCİRƏDDİN BƏYLƏQANİ*

O, gənclik zamanında Şirvana gedib, Xaqaninin xidmətində olmuş və onun əfkarını qələmə almaqla məşğul olmuşdur. Xaqaninin yaxın qohumlarından birinə aşiq olmuş Mücirəddin rədd cavabı alınca, naümüd bir halda Şirvanı tərk etmişdir. Sultan Məsud zamanında və ondan sonra da Tuğrul ibni-Arslanın anasını alıb, illərcə Səlcuqilər dövlətinin vəkili olan və bir padşah kimi hökm sürən səxavətli, hünərli və elmi sevən Atabək Eldəgəzin hüzuruna getmişdir. O, atabək Eldəgəzin ən yaxın adamlarından olub, cəh və cəlal ilə yaşamışdır. Atabək Eldəgəz və Qızıl Arslan haqqında gözəl qəsidələri vardır.

Mucirəddin bir vaxt hökumət vergilərini toplamaq üçün İsfahana getmişdi. Buranın fazilləri onu istədiyi kimi qarşılamamışdılar. O, bu xüsusda belə yazır:

[76] Açıq qalmışdır.

Rübai

Elə xəyal etdim ki, İsfahandan ruha qida olur.
Mürüvvət və insaf mədəndən çıxarılmaz bir ləldir.
Nə bilim ki, İsfahandan sürmə çıxarıldığı halda
Bütün İsfahan xalqı kordur.

Onun divanındandır:

Qit'ə

Susən çiçəyinin ağzından ona görə süd qoxusu gəlir ki,
Hələ səba ruzgarının məməsi onun ağzındadır.
Onun dili vardır, (bununla belə) danışmır. O haqlıdır.
Belə bir ömür ki, onun vardır, daha nə söz ola bilər.

Yenə onundur:

Demişsən ki, sənin üzərindən kölgəmi[77] götürərəm,
Torpaq (yer) üzərindən kölgəni necə götürmək olar?
Sən məni gözdən saldın, lakin,
Əzəmətli şahın kərəmi məni yüksəltdi.
Qızıl Arslan şahın səxavət əli və ürəyi,
Dünyada dəniz və mədənin vüsətini heçə endirmişdir.

Rübai

Saqi piyalədən gül rəngli şərab tökürdü,
Çalğıçı mizrab ilə qiymətli incilər saçırdı,
Bunlardan bir fəssad[78], digəri isə təbib kəsilmişdi,
Biri nəbz tuturdu, o biri qan tökürdü.

## ***SEYİD ZÜLFÜQAR ŞİRVANİ***

Adı Qivamüddin Hüseyn ibni-Sədrəddin Əlidir. Qiymətli bir alim və yüksək dərəcəli bir şair olmuşdur. Şirvanşahın vəziri sədr Səidülmastri haqqında uzun və mükəmməl bir qəsidə yazmışdır. Bunun müqabilində mükafat olaraq yeddi xalvar ipək almışdır. Axırda İraqa gedib, Sultan Məhəmməd Xarəzmşahın tarixini nəzmə

[77] Himayəmi.
[78] Qanalan

çəkmiş və ondan iltifat götürüb, bir çox hədiyyə almışdır. Moğol dövləti zamanında da, Abaqa xanın vəziri atabək Yusif ona hədsiz iltifat göstərmişdir. Abaqa xanın əsrində vəfat edib, Təbrizin Sürxab qəbristanında basdırılmışdır. Onun qəsidələrindən aşağıda bir neçə beyt verilmişdir:

Tərifində yazılan kitab yığıncaqlar yaraşığıdır,
Adına oxunan xütbə məclislər bəzəyidir.
Sən şərafət məclisinin sədrisən, buna yüz bürhan və dəlil vardır.
Sənin kərəm və səxavətin yüz dəlil ilə isbat edilmişdir.
Qüvvət və qüdrət sənin əlinə, yüksəklik də sənin
dərəcənə məxsusdur,
Gözəl xasiyyətlər təbiətinə, fəzilətlər isə zatinə məxsusdur.
Siz Cəmşid dövlətli və Cəmşid bəxtlisiniz,
Sizin ədalətiniz sayəsində, qafilədən geri qalanlar yol
kəsənlərdən bac alırlar.

Yenə onundur:

Sənin yaqut kimi olan dodağının qarşısında Bədəxşan
lə'li rəngsizdir.
Sənin ay kimi olan rüxsarının üzərini hilal kimi qara bir zülf
tutmuşdur.
Ey Cəmşid rütbəli və Dara kimi cahangir olan Yusif şah!
Ulduzların padişahı sənin qapında bir sərhəngdir.
Sənin xeyrxahlarının hərəkəti insana fəxr gətirir,
Sənin bədxahlarının adı insanə ar gətirir.

## *ƏBUSƏİD ABDAL BAKUYİ*

Yoxsul olmasına baxmayaraq, kəramətlə tanınmış və son dərəcə əliaçıq bir dərviş olmuşdur. Bakı şəhərinin xaricində bir sovməədə oturub ibadətlə məşğul idi. Azacıq olan mədaxili ilə yanına gələnləri qonaq edərdi. Sultanların fərmanları mucibincə Şibani nefti və əkinləri onun türbəsinin məsarifinə məxsus idi. Axırda bu ölkənin vəziyyətində əmələ gələn iğtişaş nəticəsində, onun məscid və mehmanxanası xarab olub, qəbri və ibadət etdiyi yer torpaq altında qalmışdır. Bu yerdə olan bir neçə ev «Xəlifə damı» adı ilə məşhurdur.

Hicri 1232-ci (=1817) ildə, bakılı Hacı Qasım bəy Mənsurxan bəy oğlu onu qəbrini və məscidini təmir etdirmişdir. İşlərin vəziyyətindən, Bakı şəhərinin kənarından neft quyusundan və onun mehmanpərvərliyindən məlum olur ki, cənab Əbusəid həmin dərvişdir ki, Məhəmməd ibni - Mahmud Amili Nəfayisülfünun adlı

kitabında Sultan Ulçaytu Məhəmməd Xudabəndədən bəhs edərkən onun haqqında belə yazmışdır:

Dərvişlərdən bir nəfər Bakı hüdudunda özü üçün bir neft quyusu qazmışdı. O, öz həyatı və gəlib-gedənlərin (müsafirlərin) xərcini bir quyunun mədaxili ilə təmin edirdi. Bir gün sultan buraya gəldi. Dərviş adəti üzrə ona xidmət etmək üçün ayağa qalxdı. Sultan ona bəxşiş vermək istədi, dərviş razı olmayıb dedi: Bu miqdar ilə ruzigarım keçir, bundan artığına ehtiyacım yoxdur. Onun sözü sultana xoş gəlib, necə yaşadığını bilmək istədi. Onun hal və əhvalı sultana məlum olunca: «Sənin səltənətinə afərin olsun» dedi. O, dərviş ilə qardaşlıq əli tutub buyurdu: məni yaddan çıxartma. Dərviş sultanın xatirini saxlayıb, hər il onun üçün hədiyyə göndərirdi. Sultan da hədiyyələri öz böyük xidmətkarlarından Qara Məhəmməd adlı birinə tapşırırdı ki, onları satsın və gələn mədaxili onun üçün kəfən pulu saxlasın.

## *MÖVLANA SEYYİD YƏHYA BAKUYİ*

Onun haqqında ancaq bu qədər məlumdur ki, adı hicri səkkizinci əsrin ortalarında təriqət böyükləri sırasında çəkilir. Onun fəzilətləri və gözəl xasiyyətləri məşhurdur. Bakı şəhərində ona mənsub olan məscidin yanına sovməəsi, mədrəsəsi və qəbri indi də durur.

## *MÖVLANA ŞEYX MOLLA YUSİF MÜSKÜRÜ*

Onun ulu babaları ... Qubanın Müskür nahiyəsinə Qarabağdan gəlmişlər. Şeyx cənabları hicri səkkizinci əsrin ortalarında dünyaya gəlmişdir. Təriqət mərasimini təkmil etdikdən sonra, Seyid Yəhya Bakuyidən irşad xirqəsi almış və təriqət saliklərinin üzünə feyz və təbliğ qapılarını açmışdır.

Onun nəvələri sultanların və əmirlərin yanında əziz olub, rüsumat sahibi idilər. Şeyxin məzarı və onların yurdu olan kənd Şeyxlər adı ilə adlanmışdır. Onun əsərlərindən ancaq Bəyanül'əsrar adlı ərəbcə kitabı bizə gəlib çatmışdır. Bir müqəddəmə və 24 fəsildən ibarət olan bu kitab, əşyanın maddi və mənəvi xüsusiyyətlərinə, təriqət sahibləri və füqəranın adət və adabına aid olan geniş mövzuları müxtəsər bir surətdə izah edir. Hicri səkkizinci əsrin axırında vəfat etmişdir.

## **ƏBUTAHİR ŞİRVANİ**

Şirvanın gözəl təbli şairlərindən biridir. Elm və fəzilət cəhətdən müasirləri arasında görkəmli yer tutur. Onun haqqında aşağıdakı iki beytdən başqa heç bir şey məlum deyildir.

Mən yaşlı adamlara təəccüb edirəm
Ki, saçlarını nə üçün boyayırlar.
Madam ki, boya ilə heç kəs əcəldən canını qurtara bilməz,
Onlar özlərini nə üçün incidirlər?

## *SEYİD HƏSƏN ŞİRVANİ*

Çox fəzilətli bir vaiz olmuşdur. Xətlərini bir çoxunu son dərəcə gözəl yazardı. Onun gözəl sözlərindəndir:

Deyirsən, o mehriban sevgiliyə yetişmək olarmı?
Əgər öz mənliyindən keçərsənsə, Allaha and olsun yetişmək olar.

## *BƏDR ŞİRVANİ*

Onun haqqında ancaq bu qədər məlumdur ki, mətanətli təbi və gözəl şerləri olmuşdur. Ömrünün bir çox illərini eyş-işrət və gözəl şer söyləməklə keçirmişdir. Bu mətlə onun şer məcmuəsindədir:

Beyt

Sərxoşcasına, könlümün quşundan kabab hazırla,
Göz yaşımdan ona duzlu su səp.

Dövlətşah Təzkirətüşşüərasında yazır: Mövlana Katibi Tərşizi, Əmir İbrahim zamanında Şirvana gəldi və onunla Bədr arasında bir çox şerləşmə və elm mübahisələr oldu. Deyirlər ki, Əmir İbrahim Katibiyə son dərəcə nəvaziş göstərirdi. Bir qəsidəyə mükafat olaraq ona on min dinar qızıl bağışladı. Katibi bu qədər böyük pulu bir ayın ərzində Şamaxı karvansarasında xərclədi. O, bu pulun bir hissəsini fazillərə, şairlərə və həqiqət əhllərinə payladı və bir qədərini ondan oğurladılar. Belə ki, bir gün mətbəxində bir batman un tapılmadı. O zaman bu qitəni yazıb əmirin hüzuruna göndərdi:

Dünən aşpazdan bir az şorba bişirməyi tələb etdim,
Ta bu şorbadan bizim və qonağın işi düzəlsin.
Dedi: - Tutaq ki, ət və quyruq tapdım, bəs onun ununu kim verər?
Dedim: - Fələkin dəyirmanını fırladan kimsə verər.

## *MÖVLANA ƏBDÜRRƏŞİD İBNİ-MALEH BAKUYİ*

Fəzilətlərilə şöhrət tapmış bir müəllifdir. Hicri 805-ci (=1403) ildə anadan olmuşdur. «Təlxisülasar və əcaibül-məlikül-qəhhar» adlı ərəbcə bir coğrafiya kitabı yazmışdır. O, bu əsərində ruslar, slavyanlar, varyaqlar və peçeneqlər haqqında gözəl izahat vermişdir. Avropanın məşhur alimlərindən akademik Fren bu əsərdən bir çox şey iqtibas edərək, çap olunmuş «İbn-Fədlan» adlı əsərində dərc etmişdir.

## *MÖVLANA KƏMALƏDDİN MƏSUD ŞİRVANİ*

Dövrünün ən böyük alimlərindən biri olub, Sultan Hüseyn Bayqara zamanında uzun illər boyu Heratda Gövhərşad bəyim və Əmir Əlişir mədrəsələrində dərs verməklə məşğul olmuşdur. Bütün Xorasan fazilləri yanında yüksək kamalatı ilə şöhrət qazanmış və Şəhri-hikmətül'eyn kitabına bir haşiyə yazmışdır. Hicri 905-ci (=1500) ildə vəfat etmişdir.

## *MÖVLANA MƏSUD ŞİRVANİ*

Əbülqazi Sultan Hüseynin şairlərindəndir. Səlis şerlər söyləmişdir. Onun əsərlərindəndir:

Saf şərabın təsirilə sərxoşların sinəsini yandır,
Çünki şərabdan başqa heç bir şey mənimlə saziş etmir.

## *ƏBƏDİ ŞİRVANİ*

Pak etiqadlı zərif bir kişi olmuşdur. Xəttat və gözəl bir təbə malik olmaqla bərabər, şətrənc oyununu da yaxşı oynarmış. Onun şerlərindəndir:

Ürək yanğısından dilim ağzımda atəş kəsildi,
Ey müddəi, elə bir iş görmə ki, mənim dilimə-ağzıma düşəsən.

## *MÜSAHİB GƏNCƏVİ*

Onun ism və rəsmi Gəncə və Qarabağ bəylərbəyisi Ziyad oğlu Kəlbəli xandır. II Şah Abbasa çox yaxın olub, onun həmsöhbətlərindən olduğu üçün, Müsahib təxəllüsünü qəbul etmişdir. O, cəhü-cəlal sahibi və siyasət işlərində sabitqədəm olmaqla bərabər, elmli və gözəl təbə malik bir zat olmuşdur. Divanı ələ keçməmiş olsa da, bu bir neçə beyt ondandır:

Ey saqi, piyaləni gəzdir və onu içirt,
Çünki müşkül işlərimiz piyalənin gəzdirilməsilə həll olundu.
Ey saqi, şərab piyaləsinin batinindən saflıq kəsb et,
Çünki müşkül işlərimiz piyalənin gəzdirilməsilə həll olmuşdur.

Yenə onundur:

Ey Müsahib! Dünyanı yandıran eşq yolunda
Məhəbbəti o uşaqdan öyrən ki,
Anası onu döymək istədikdə
O, anasının ətəyinə sığınar.

Yenə onundur:

Onun iki qaşı bir-birinə çatılmışdır,
Çünki o, mənimlə dilxahdan cinaq çəkmişdir.

## *MÖVLANA MOLLA MİRZƏ ŞİRVANİ*

Əqli və nəqli elmlərdə əsrinin yeganəsi olmuşdur... Şah Süleyman əsrində İsfahanda dərs və xitabətlə məşğul olmuşdur. Özündən sonra gözəl əsərlər qoyub getmişdir. Alimlərlə bir çox elmi söhbətləri olmuş, hamı onun fəzl və kamalını etiraf etmişdir... Şah Sultan Hüseyn dövründə vəfat etmişdir.

## *MOLLA MƏHƏMMƏD İBN-MOLLA NƏCƏFQULU BAKUYİ*

Təlifat işləri və elmi dərəcə etibarilə əsrinin mümtaz simalarından olmuşdur. Ondan bir çox gözəl asar yadigar qalmışdır. II Mirzə Məhəmməd xanın müəllimi olmuşdur. Şeyx Bəhaəddin Məhəmməd Amilinin «Kəşkül» adlı kitabını, Fətəli xan cənablarının xahişinə, o gözəl əsərə layiq bir tərzdə, ərəbcədən farscaya tərcümə etmişdir. Onunla Hacı Məhəmməd Çələbi Əlici, şiə və sünni məzhəblərini birləşdirmək haqqında təhqiqat aparmışlar. Əlican cənabları bu xüsusda ərəbcə gözəl bir kitabça yazmışdır.

## *HACI MƏHƏMMƏD ÇƏLƏBİ ƏLİCİ QÜLHANİ*

Bir çox elmlərdə və xüsusən fith elmində zamanının ən məşhur adamlarından olmuşdur. Tədvinül-Əlici adlı kitab onun əsərlərindəndir. Fiqh qanunlarını gözəl bir tərtiblə izah edən bu əsəri ölkə alimləri çox bəyənmişlər. Yeddi dəfə Məkkə ziyarətinə getmişdir. Hicri 1223 (=1808) ildə vəfat etmişdir. Rus qoşunu ilə şirvanlı Mustafa xanın əsgərləri birlikdə Qudyal (Quba) şəhərindən,

Quba əhalisi də xaricdən bir-birilə müharibə etməkdə idilər. Bu zaman Əlicinin cənazəsini qəbiristana gətirdilər. Namaz üçün səlat çəkildikdə cənazəyə hörmət üçün hər iki tərəfin əsgərləri müharibəni dayandırıb, bir sırada durdular.

## *MƏSTƏLİ HACI ZEYNƏLABDİN ŞİRVANİ*

Hicri 1194-cü (=1779) ildə, şəban ayının 15-də Şamaxı şəhərində anadan olmuşdur. Onun anadan olmasından altı ay keçəndən sonra, atası axund İskəndər köç-külfətilə tərki-vətən edərək, Kərbalaya getmişdir... O cənab on yeddi yaşına qədər rəsmi elmlərlə məşğul olmuşdur. O, batini cazibələrlə zahiri həyatdan uzaqlaşmışdır. Əvvəl hindli Məsuməli şahın xidmətinə yetişib, sonra Bağdadda İsfahanlı Nurəli şahın xidmətini ixtiyar etmişdir. Bir müddət İraqi-Əcəm, Gilan, Şirvan, Muğan və Azərbaycanda olmuşdur. Buradan Təbəristan, Xorasan, Quhistan, Zabilistan və Kabilə səyahət edərək, bir çox məşhur alimlərin və möhtərəm şəxslərin söhbətlərindən istifadə etmişdir. Uzun bir zaman Həsənli şahın xidmətində olmuşdur. Həsənli şah hicri 1216-cı (=1802) ildə Pişavər şəhərində vəfat etdikdən sonra o, Pəncab, Dehli, Ud, Allahabad, Bengalə, Gücərat və Dəkən vilayətlərinə getmişdir. Cukilər, sinasilər, birakilər və nankaşahilər, bütpərəstlər və zərdüştilərlə ünsiyyət etmişdir. Cəlallilər, mədarilər, qadirilər, dəhrilər, hüluiclər və mübahilər ilə oturub-durmağı lazım bilmişdir. Raylar, raclar, bərəhmənlər və rəgirlər firqələrilə müsahib olmuşdur. Hindistan cəzirələrinə, Sudan, Maçin və Bənadiran ölkələrinə keçib, axırda Sind vilayətinə və Multan yolu ilə, çox çətinliklə Kişmirə gəlib çıxmışdır. Bir zaman da Pənc-piran, Siyah-puşan firqələri və Binəvayan, Xakəsaran və Nankaşahiyan tayfaları ilə durub oturmuşdur. Müzəffərabad və Kabil yolu ilə Təyaristan, Türküstan, Bədəxşan dağlarına getmişdir. Nəqşbəndilər, çəşkilər və sifidcaməganların söhbətinə könül vermişdir. Məzdəkilər, xürrəmilər və uyğurilərlə söhbət etmişdir. Yenə Xorasan və İraq yolu ilə Farsistana qayıtmışdır. Bu ölkənin məşhur və məruf adamlarını görmüş, zəhəbilər, nurbəxşilər və sair böyük adamların təriqətindən xəbərdar olmuşdur. Hicaz səfəri həvəsilə Darab və Hürmüz yolu ilə Ümmana və Həzrəmovta gəlmişdir. Yəmən bəndərlərini və Həbəşistan çölünü gəzib əbaxilər, zeydilər, təbərilər və kəysanilərin etiqadlarını dinləmişdir. Həcc mərasimini yerinə yetirdikdən sonra, vəhabilər və dörd məzhəb sahiblərilə həmsöhbət olaraq Səid və Misir ölkələrinə getmişdir. Qibtilər, mülhidlər təriqətindən ibrət alıb, bu ölkənin bir çox alim və şeyxləri ilə görüşüb, Şam və Ərz-müqəddəs ölkələrinə gəlmişdir... Əməvilər, şeytanpərəstlər, cəbrilər, qədrilər, samirilər, yəhudilər və rahiblərlə ünsiyyət etmişdir. Ruma, Qaramana, Yunanıstana, Qostəntiniyyəyə, Aydına, Məğrib-zəminə, Bərbəristan və Cəzair ölkələrinə səfər etmişdir. Padişahlar və bəktaşilər, rifailər, üşşaqilər və həmzadilərin təriqətçilərilə həmsöhbət olmuşdur. Nəsrilər, safilər, mövləvilər, xəlvətilər və fəramuşilərlə ülfət etmişdir. Firənglər, ermənilər və gürcülərlə oturub-duraraq, Diyarbəkir, Kiçik Ermənistan və

Azərbaycan yolu ilə Tehrana getmişdir. Hüseynəli şah və Kovsərəli şahın müsahibi olmaq şərəfinə nail olmuşdur. Bir müddət həmədanlı Məczubəli şahın xidmətində qalıb, onun rəmzlərini öyrənməklə məşğul olmuşdur. Nemətullahi təriqətində təsviri məvad edərək, irşad və təbliğatını kamala çatdırmışdır.

Zahirpərəstlərdən bəzisi onu kafir hesab etdilər. İran padişahının rəyini onun əleyhinə çevirməklə dəfi xəyalına düşdülər. O, Qələmröv yolu ilə Şiraza gəlib, oradan Kirmana getdi. Kirman hakimi İbrahim xandan çox əziyyət görüb yenə Şiraza qayıtdı. Hicri 1236-cı (=1821) ildə, evlənmişdir. Oranın alimlərindən - müctəhid və təqlidçilərindən bəzisi onun əleyhinə, bəzisi də lehinə hərəkət etmişdir. Onlar öz mənfəətlərini özgənin zərərində görürdülər. Fars fərmanfərması Hüseynəli Mirzə onun Fars əyalətindən çıxması haqqında hökm verdi. Hicri 1237-ci (=1822) ildə, ümumi vəba ilində öz ailəsilə bərabər İsfahana üz qoydu. Oradan da Qumişəyə gedib orada sakin oldu və riyazüssəyahə kitabını orada təlif etdi. Bu kitabda, adı çəkilən məmləkətlərin vəziyyətini və əcibə hallarını, sultanların və məşhur alimlərin əhval və vaqiələrini şərh və izah edərək, müxtəlif din sahiblərini və bu dinlərə mənsub bir çox firqələrin əqidələrini gözəl bir tərzdə bəyan etmişdir.

Bu xüsusda özü belə deyir:

Kim asanlıqla səyahət etmək istəyirsə,
Ona de, riyazüssəyahə kitabını oxusun.

Həqiqətən bu kitab zəngin faydalar xəzinəsidir. Nəzəri və əməli cəhətdən müəllifinin fəzl və kamalına möhkəm bir dəlildir. Eşitdiyimizə görə, indi də o cənab Fars ölkəsində irşad büsatını açıb, vücudundun cürbəcür fəzilətlər meydana gəlməklə və batini kamalatından saysız mənfəətlər görülməkdədir.

Elm aləmində görkəmli yer tutan və həqiqət günəşinə nisbətən şaxis (günəş saatı) sayılan bu şəxslərdən başqa daha bir çox fəzilət sahibləri yetişmişdir. Şeyxlərdən: rudbarlı əbuəli, şabranlı Şeyx Yaqub Çərxi, qubalı Şeyx Əbdülkərim və şirvanlı Baba rüknəddin, üləma sinfindən: bərdəli Sədulla, qarabağlı Hənəfi, ərəşli İbrahim, ağdaşlı Bürhanəddin, şəkili Əbdürrəhim, Məhəmmədəmin, Hacı Əyyub əfəndi, şirvanlı Hacı axund Şərif, bakılı Axund Nəcəfqulu və dərbəndli Molla Ağa elm və təqrirdə çox tanınmış simalardandırlar. Şairlərdən: Nişat, Məsih, mirzə Əsgər, şirvanlı Zülali, Kosa Yusif, ləmbəranlı Asəf, Molla Pənah Vaqif, qarabağlı mirzə Məhərrəm Məriz və gəncəli Ziyad oğlu Fətəli bəy Hali təblərinin gözəlliyilə məşhur olmuşlar. Dağıstanda da ərəb dilində olan elmləri dərindən bilən və müxtəlif dövrlərdə yüksək şöhrətə malik bir neçə şəxs yetişmişdir. Məsələn Məhəmməd Qədəqi, Hacı İbrahim Ürəvi, Fazil Eyməki, Yusif Zərir Qumuqi, Davud Üsüşi, Səid Şünasi və başqaları.

Kitabın sonunda, bu həqir müəllif, fəzilət və şöhrət iddiası ilə deyil, bəlkə bu ölkəyə mənsubiyyəti etibarilə fəxr etmək üzündən öz tərcümeyi-halını da, qısaca olaraq bəyan edir:

Beyt

Başqaları qızıl gül və yasəmən, biz isə tikan olsaq da,
bir gülzarın pərvərdəsiyik.

Bu kəmmaya, günahkar Abbasqulu Qüdsi mirzə Məhəmməd xan Sani oğlu, hicri 1208-ci ildə, zilhiccə ayının 4-də, pəncşənbə günü, 1-ci saatda (=1794-cü ildə iyun ayının 10-da) Bakının Əmir Haçan kəndində anadan olmuşdur.

Məni 7 yaşından oxumağa qoydular, lakin vəziyyətin qarışıqlığı və müharibələr nəticəsində olan dəyişikliklər, məqsədin lazımi qədər əldə edilməsinə mane oldu. 10 il içərisində farsca azacıq savaddan başqa heç bir şey qazanmadım. Bundan sonra, Qubada 10 il ərəb dili və sair fənləri təhsil etməklə məşğul oldum. Vəsaitin azlığı və sair maniə və əngəllərə baxmayaraq, mən yenə bir qədər təhsil almağa müvəffəq olmuşdum. Bu zaman, Qafqaz ordusu və vilayətlərinin fərmanfərması (baş komandanı) general Yermolov hicri 1235-ci (=1820) ildə, məni dəvət edib, dövləti vəzifələrdə işə təyin etdi. Tiflisdə rus dili və yazısını öyrəndim, bu dildə tərcümə edilmiş kitablar vasitəsilə cürbəcür elmlər və müxtəlif tayfaların əhvalı ilə tanış oldum. Vəzifə işlərilə əlaqədar olaraq və bu dövlət böyüklərinin hüzurunda olmaq münasibətilə Şirvan, Ermənistan, Dağıstan, Çərkəzistan və Gürcüstan vilayətlərinin bir çox yerlərini dolandım. Anadolu və Azərbaycan şəhərlərinə də gedib böyük şəxslər və əhalinin müxtəlif təbəqələrinə mənsub adamlarla görüşdüm. İran və Rum (Osmanlı) dövlətlərilə olan müharibə və barışıq işlərində rus əsgərlərinin fərmanfərması (baş komandanı) böyük əmir Paskeviçin yaxın adamlarından biri oldum. Hiçri 1248-ci (=1833) ildə, səyahət qəsdilə səfərə çıxıb, iki il Don ölkəsini, Malorossiyanı, Velikorossiyanı, Lifliyandiyanı, Litvanı və Lehistanı (Polşanı) gəzdim. Avropa ölkələrinin təcrübəli dövlət adamları, məşhur alimləri və bilici sənətkarları ilə görüşdüm. Bir çox qəribə işlər və saysız təəccüblü əsərlər gördüm. Hər bir ölkədə, hər bir işdən və təcrübəmi artırdım. Get-gedə cəhalətim azaldı. Yavaş-yavaş xəyalat və təsəvvüratımın puçluğu aydınlaşdı və gördüm ki, dünyanın yüksək mənsəbləri çox alçaqdır və bizim əziz saydığımız tədbirlər bir sərxoşun ağıl sınmasına bənzər; çünki mal və dövlət hər halda puç olacaq, ixtiyar və iqtidar əldən gedəcəkdir. Sənaye cürbəcür alətlərə və bədən qüvvəsinə möhtacdır. Şəxsi ləyaqət olmadan, nəsəb və sülalə şərafəti qürbətdə naməlum, vətəndə isə məzəmmətə məruzdur. Bunlara təkyə etmək mənasızdır, etibar ediləcək və arxalanacaq bir dövlət varsa, o da hər bir halda elm və adabdan ibarətdir... Bu elm və adab da zahirpərəst adamların boşboğazlıq edib, özləri üçün fəzilət sandıqları mənzum kəlmələrdən və mövhumi (xəyali) qaydalardan ibarət deyildir.

Beyt

Ağlasığmaz şeyləri deyərlər,
Hiss olunan (ağlasığan) şeyləri isə, axtarmazlar.

Bəlkə bu elm və adab, sərf olunan mərifəəti, sülh və asayiş üçün yararlıdır. Əsərləri vasitəsilə bir çox əsrlər boyu öz xeyir və mənfəətini saxlar...

Dünyada əsərlərin ən möhkəmi və dayanıqlısı təlifdir. Bunun fəziləti tərifə möhtac deyildir. Bunsuz nə məişətin səpk və qaydaları qala bilər, nə də, şəriət işləri davam edə bilər.

Rübai

Gözəl əsərlər yazan sənətkarın qələmi,
Əski rəsm və ayindən yeni bir tərh yaratmazsa,
Keçmişlərdən kim bir nişan və xəbər verə bilər,
Və kim gələcək nəslə yadigar olaraq bir töhfə qoya bilər?

Yuxarıda söylənənlərə nəzərən, bu kəmmaya (müəllif) fürsət zamanı vaxtlarımı cürbəcür təlifat və təsnifata sərf edərək, cüziyatdan başqa bir neçə nüsxə əsər yazmışam. Doğrudur bunlardan əsl məqsəd ələ gəlməmişdir, lakin bu qədər kifayətdir ki, şərafətli bir işdə və xeyir arzusunda olmuşam.

Beyt

Hər kəs öz mətaını bazara aparar,
Birisi ipək aparar, birisi iplik.

1) Riyazülqüdsdür. Azərbaycanca olub, 14 fəsildən ibarətdir...

2) Qanuni Qüdsidir. Fars dilinin sərf və nəhvinə aiddir. Bu əsər elə bir yoldur ki, təhsil ölkəsinin müsafirləri bunun üç mənzilini keçməklə fars dilinin danışmaq və yazmaq sərhəddinə çata bilərlər.

Birinci mənzil - hərflərin bəyanındadır. Hərflərin ayrılması, tərkibi və bunlara məxsus nişan və əlamətləri üç fəsildə bəyan edir.

İkinci mənzil - kəlmələrin bəyanındadır. Farsca və ərəbcə sözlərin itiraqını - əsl kökdən ayrılmasını iki fəsildə göstərir.

Üçüncü mənzil - cümlələr haqqındadır. Cümlələrin tərkibini və tərtibini iki fəsildə sona çatdırır. Asan anlamaq və yadda saxlamaq üçün, onun bir çox qayda və misallarını nəzmə çəkdim. Rus məktəblərində işlənmək üçün, həmin kitabı imperatorun əmrilə rus dilinə də tərcümə etdim. Bu kitab hər iki dildə Tiflisdə çap edilmişdir.

3) Kəşfülqəraibdir. Bu kitab farsca olub, Amerikanın, yəni yer kürəsinin yarım qərbi hissəsi olan Yeni Dünyanın kəşfini və vəziyyətini iki məqalədə bildirir.

4) Təhzibi-əxlaqdır. Əxlaqi fəlsəfəni asimani kitabların bəyanatına və islam, yunan və frəng hükəmasının təyininə görə, bir müqəddəmə, on iki fəsil və bir xatəmədə izah edilir.

5) Eynülmizandır. Bu əsər ərəb dilində, bir müqəddəmə, iki fəsil və bir xatəmədən ibarət olub, məntiq elmini təşkil edən ləfzin təqsimatından, kəlmənin dəlalət yollarından, təsəvvür və təsdiqin başlanğıc və məqsədlərindən bəhs edir. Münazərə elmi və onun adabını izah edir.

6) Əsrarülmələkovtudur. Heyət elminə dair farsca bir əsər olub, əski qaydaları yeni üsul və qanunlara tətbiq və əqli dəlilləri nəqli rəvayətlərlə təsdiq edərək, yer kürəsinin və sair əcramın[79] imkan sahəsində əhvalını, vəziyyətlərini və onların intizamına səbəb olan qanunları söyləməklə bərabər təhqiq edir. Bu kitabı ərəbcəyə də tərcümə etmişəm.

7) Coğrafi kitabdır. Bu əsər farsca olub, dünyanın riyazi, təbii və siyasi əhvalından, əcramın vəziyyətlərindən, ünsürlərin xassələrindən, məvalidin (camadat, nəbatat və heyvanatın) məhsulatından, iqlimlərin hüdudunu təyin etmək və yer kurəsi əhalisinin siniflərini müəyyən etməkdən və hər bir ölkənin yaşayış tərzindən bəhs edir. Bu kitabı sona çatdırmaq dövləti, allahın yardımından asılıdır.

8) Mişkatül'ənvardır. Farsca olan bu əsərdə cürbəcür sirlər, gözəl hal və hərəkətlər, şer və hekayələr şəklində ifadə edilir. Başlanğıcı belədir:

Ey zöhd və təqva sahibləri, eşqi məzəmmət etməyin!
Zahidlikdə nicat asari görmədim.
Küfr ilə din kimin sərgəştəsi və heyranıdır?
Daraq kimin müşk saçan zülflərindəndir?
Dimağıma canan qoxusu gəlir,
Ruh aləmindən gözəl qoxu hiss edirəm.
Bir camdan bir udum şərab içmişəm,
Bu kitabı bir adla bəzəmişəm.
O pak ruhun himməti feyzindən,
Qara torpaqdan günəş tülu' etdi,
Onun vəsfələrindən nə qədər söyləsəm yenə azdır,
O, insana bilmədiklərini öyrədəndir.
O şadlıq günəşi öz zərrələrilə məni işıqlandırdı,
Hər bir zərrəmdən yüz nur şöləsi parladı.
Mənim canım onun nurlarının çırağıdır,
Ürək xəzinəsi sirrlərinin dəfinəsidir.
Bu kitabda onun sirrlərindən yazmaq istəyirəm,

[79] Planetlərin

Onun nurlarının çırağını təsvir etmək olurmu?

Bunlardan başqa bir də, müxtəlif şerlər məcmuəsi vardır ki, hələ dağınıq bir şəkildə olduğundan «Divan» adı ilə adlanır. Bundan nümunə olaraq bir neçə şer yazılır:

Qəzəliyyatdan

O könülə mərhaba olsun ki, onun sövdasına eşq rəhbərdir.
Eşq özü vəhy, Cəbrail, kitab[80] və peyğəmbərdir.
Bütün aləm aşiqin küfrünə fitva verir.
Bu macəra Səlman ilə Əbuzərin hekayəsidir.
Həqiqət aləmində xas və avam yoxdur.
Rəhm ilə cövr[81], küfr ilə iman arasında fərq yoxdur.
Bu nüktə əql tərəfindən həll edilə bilməz,
Saqi, şərab gətir!
Tainki onu sənə şərh edim, əgər mənə inanırsan.
Əməli özündən bilməyən kimsə mömin deyildir,
Əməli allaha nisbət verməyən də kafirdir.
Qüvvəsiz heç bir iş üçün aləmdə varlıq yoxdur,
Əməl bizim ixtiyarımızda olmaqla bərabər müqəddərdir[82].
Qüdsi, cənab dostdan[83] hər nə gəlsə gözəldir, yaxşıdır,
Hər bir fəsad içərisində bir səlah[84] qoyulmuşdur.

Yenə onundur:

Onun zülfünün qıvrımına yol tapdım, çünki könül ələ
almaq gözəldir.
Onun üzündə gördüm ki, hər şeydən yaxşılıq gözəldir.
Mənim sevgilimin üz və zülfünü bəzəmək üçün məşşatəyə
ehtiyac yoxdur,
Çünki təbii gül daha gözəldir.
Onun boy və buxununun mənim gözümdə başqa bir cilvəsi
vardır,
Doğrusunu söyləyim, gözəl sərv bir arxın kənarında olsa daha

---

[80] Qur'an
[81] Zülm.
[82] Qabaqcadan müəyyən edilmişdir.
[83] Allahdan.
[84] Xeyir iş.

gözəldir.
Sənin can bəsləyici dodağından acı söyüş şirin olar.
Allah, allah! Bu nə lütf və iltifatdır ki, hər nə desən gözəldir!
Divanənin könlünə zəncir rahətlik verər,
Bu cəhətdən dəli könül bir zülfün qeydində olsa daha gözəldir.
Onun dodağı üzərində olan müşk rəngində qara xal bir ulduzun təsviridir,
Yaxud günəşə səcdə etmiş olan bir hidudür,
Bu hal daha gözəldir.
Tusli Qüdsi pak torpaqdan müqəddəslik feyzini aldı,
Bizim bakılı Qüdsini də bakılı olması daha gözəldir.

Müqəttəatdan
(Beytlərdən)

Mən o şəxsəm ki, hər bir an hərbdən dəm vururam.
Düşmənin qəsdində belimi bağlayıb, əldə qılınc durmuşam.
Ey düşmən, mən sənin ölmünün ayinəsiyəm.
Əgər inanmırsansa, gəl gör!

Rübaiyyatdan

Ey könül, yanmaqdan qorxmursan!
Məgər pərvanə xasiyyətindəsən?
Ey can quşu, sənin qanadını hansı daş sındırdı ki,
Öz aşiyanənə doğru gəlmək fikrində deyilsən.

Qəzəliyyatdan

Gün üzrə ay tüluimi ya gün kamanıdır,
Ya qaşdürər, bu cümləsi aşiq kamanıdır.
Cami-cahannümayə düşüb əksi-asiman,
Xaki-səvadı əxtəri-bəxtin nişanıdır.
Göstərsə yox əcəb yədi-beyza Kəlimi-təb.
Hala ki, şaxi-güldə təcəlla zəmanıdır.
Badi-səba əbir fişani-çəmənmidir?
Ya bustani-hüsnü rüxün bustanıdır?
Şövqi-təranə qüvvəti-pərvaz olurmu hiç,
Ol əndəlib üçün ki, qəfəs aşiyanıdır?
Dilbər bəyani-halım eşitməzsə, yox əcəb,
Pərva qılırmı əhli-cünun dasitanıdır.

Qüdsi, üzari-zərdimi əşk etdi laləgun,
Bu günəşin baharı zamani-xəzandır.

Rübaiyyatdan

Güldür bu deyil, gül belə xandan olmaz.
Gündürmü deyil, gün gecə rəxşan olmaz.
Dirdim məlik-ü-mələk məhəbbət bilməz,
Kimdir ki, bu təşbihinə imkan olmaz.

## *ŞƏXSİ ADLAR*[85]


Abaqa xan
Abbas
Abbas ibni-Əbdülmüttəlib
Abbasqulu ağa Bakıxanov - bax Bakıxanov.
Abbasqulu Qüdsi - bax Bakıxanov.
Abbasqulu ibni - Mirzə Məhəmməd xan Sani bakuyi - bax Bakıxanov.
Abbasilər
Abbas Mirzə (Naibüssəltənə)
Abdallı Əhməd xan
Abdal xan Ustacallı
Abdulla bəy Rüstəm qadi oğlu
Abdulla bəy Hacı Səlim bəy oğlu
Abdulla paşa, sərəskər
Abdulla xan Ustacallı, Şirvan hakimi
Avraamov
Aqşın, Heydər ibni-Kavui
Ağakişi bəy, Hacı Çələbi xanın oğlu
Ağa Məhəmməd xan Qacar
Ağa Rəzi bəy, Əsgər bəyin oğlu
Ağası xan, Əsgər bəyin oğlu
Ağ Buğa ibni - Elxan ibni - Cəlayir
Adəm
Adil Gəray Sultan, Krım valisi, Məhəmməd Gəray xanın qardaşı
Adil Gəray xan
Adil xan, Üsmi Əli xanın qardaşı
Adsız, qütbəddin Məhəmmədin oğlu
Azad xan Əfğan
Azər, «Atəşgədə» kitabının müəllifi
Ayda bəy
Aytəmur
Aleksandr (I), I Pavelin oğlu
Aleksandr Mirzə, İraqlı xanın oğlu
Aleksandr xan, Gürcüstan valisi
Aleksey, Böyük Pyotrun oğlu
Aleksey Mixaloviç, Rusiya padişahı
Ali-Sərkar
Allahverdi xan


---

[85] Şəxsi, coğrafi, tayfa və kitab adları siyahisini S.Kərimzadə, S.Əliyeva və Ə. Novruzov tərtib etmişlər.

Alp Arslan
Alxas bəy
Ammian Martselli - Roma tarixçilərindən
Anak
Andiya, çoban Şamxalın oğlu
Anna İvanovna, Böyük Pyotrun qardaşı qızı
Apraksin, general-admiral qraf
Arasxan
Arqun xan, Abaqa xanın oğlu
Arəş
Arpa xan
Arslan ibni Tuğrul
Artaban, Parfyan padişahı
Artavazd, ermənistan əmiri
Artanış
Artaşes Sanatruk, Ermənistan padişahı
Asəf, ləmbəranlı, şair
Aslan ağa Şahmərdan oğlu
Atilla
Axund İsgəndər, Məstəli Hacı Zeynəlabidin Şirvaninin atası
Axund Molla Məhəmməd
Axund Nəcəfqulu
Axıcıq
Aşur xan
Aşur xan Əfşar
Babaəli bəy Kosa Əhmədli
Baba Rüknəddin
Baba xəlifə
Babək
Bağdad xatun, Sultan Əbusəidin arvadı
Badpay
Baydu ibni-Taraqay ibni-Hülaku xan
Bayəzid Sultan - bax Şamlı Bəyazid Sultan.
Baysunqar Mirzə
Bakuyi - bax Əbdurrəşid ibni - Saleh Bakuyi.
Bakuyi - bax Şeyx Əbuəbdullah Əli ibni-Məhəmməd Bakuyi.
Bakıxanov, Abbasqulu ağa
Bardoğdu xəlifə
Baric, Yafəsin oğlu
Batı - Cüci oğlu
Bayan, Avar xanı

Bayar Süraqə oğlu, Avar əmiri
Beyğur
Beyzavi - bax Qazi Beyzavi.
Bekdili xan, qorçibaşı
Bədr Şirvani
Bəkr ibni-Əbdüllah
Bəktaş Sultan, Muslu Məhəmməd xanın oğlu
Bəni-Abbas - bax Abbasilər.
Bərdi bəy, Cani bəyin oğlu
Bərəkə xan, Qıpçaq padişahı Cağatay xanın oğlu
Bətləmyüs (Ptolomey)
Bəhan Əbubəkr oğlu
Bəhmən İsfəndiyar oğlu
Bəhram bəy Fərrux Yəsar oğlu
Bəhrami-Gur
Bəhrami-Çubin
Bicən oğlu Süleyman bəy
Bolqar
Bonak - Fransa səfiri
Böyük Pyotr - bax Pyotr.
Börküyarıq, Məlikşahın böyük oğlu
Buğa
Bula, Xəzər xaqanı
Bulac, Avar xanzadəsi
Bulqakov, general anşef
Bülğar
Bürhanəddin, ağdaşlı
Bürhanəli ibn-Keyqubad - bax Bürhan Mirzə
Bürhanəli Mirzə
Bürhan Mirzə
Bütünşah, Massaget əmirlərinin ləqəbi
Vaqarş, Ermənistan padişahı
Vasiq-Billah, abbasilərdən 9-cu xəlifə
Veteranin
Vəlid ibni-Əbdülməlik, əməvilərdən 6-cı xəlifə
Qadı, Təbərsəran hakimi
Qazanalb Sultan Bud oğlu
Qazan ibni-Arqun xan
Qazan xan - bax Qazan ibni-Arqun xan.
Qazi Beyzavi
Qazi bəy, Fərrux Yəsarın oğlu

Qazi Əhmədi-Qəffari
Qazi Gəray Sultan
Qazi Mühiyyəddin, bərdəli
Qaim bi-əmrillah, abbasilərdən 26-cı xəlifə
Qaim li-əmrillah - bax Qaim bi-əmrillah.
Qaytas paşa, Ərəş hakimi
Qara Məhəmməd
Qara Məhəmməd, qaraqoyunlu
Qara Osman
Qarapiri
Qarat, Suray xanın qulamı
Qaraxan
Qaracar noyan, Çingiz xanın əmirlərindən
Qara Yusif ibni-Qara Məhəmməd
Qarçaqçy bəy
Qasım bəy Mənsurxan bəy oğlu
Qasım bəy, Məhəmmədsəid xanın oğlu
Qasım Mirzə
Qatterer, alman tarixçisi
Qacar, Arqun xanın oğlu
Qəbilə xanım
Qəbuli xanım
Qəzvin Həmdullah - bax Həmdullah Qəzvini.
Qəzənfər, Qaytaq əmiri
Qəni xan
Qərrə
Qivamüddin Hüseyn - bax Seyyid Zülfüqar Şirvani.
Qlazenap, general
Qmelin
Qodunov, Boris Fyodoroviç, Rusiya padişahı
Qoyzıcan Urus xan oğlu
Qolikov, İvan İvanoviç, rus tarixçisi
Qonstantin Mirzə, Gürcüstan valisi Aleksandr xanın oğlu
Qostəntin, qeysər Levin oğlu
Qrozli, İngilis elçisi
Qubad ibni-İskəndər
Qubad ibni-Firuz Sasani
Qubaz, lazların padişahı
Qudoviç, general anşef, qraş
Qulyakov, general-mayor
Qurbanəli Mirzə

Quriyev, general-mayor
Qudsi - bax Bakıxanov.
Qütbəddin Məhəmməd, xarəzmşah
Qızıl Arslan
Qırxlarqulu məsum
Qrim Şamxal
Davud Üsüşi
D'Anvil
Dara
Degin, fransız şərqşünası
De-Medem, general-mayor
Dəmirçi Gavə
Dərvişai
Dərviş Məhəmməd xan, Şəki hakimi
Dərgahqulu bəy (Dərgahqulu xan)
Dizavul, Avar xanı
Dilşad xatun
Dişsiz Məhəmməd
Dövlətşah Səmərqəndi
Yekatrina (I)
Yekatrina (II)
Yelizaveta
Yelisa
Yermolov, general
Yeronim
Yeşmut, Abaqa xanın qardaşı
Əbdi Şirvani
Əbdülbaqi xan Zəngənə
Əbdüləziz Bahili
Əbdülməlik
Əbdülfəttah Fümeni
Əbdürrəzzaq bəy ibni-Nəcəfqulu
Əbdürrəhim
Əbdürrəhim, şəkili
Əbdürrəhim ağa, II Mirzə Məhəmməd qardaşı
Əbdürrəhman ibni-Rəbiə
Əbdürrəhman Cami
Əbdürrəşid ibni-Saleh Bakuyi
Əbih Sultan
Əbubəkr, Aqquşa qazısı
Əbubəkr Mirzə ibni - Bürhan Mirzə

Əbubəkr Mirzə Əmir Teymurun nəvəsi
Əbuəli, rudbarlı
Əbuzər
Əbu Müslim
Əbu Məhəmməd Nizaməddin İlyas - bax Nizami Gəncəvi.
Əbusəid Abdal Bakuyi
Əbutahir Şirvani
Əbu Übeydeyi-Cərrah
Əbu Hamid
Əbucəfər Mənsur
Əbülabbas Səffah, abbasilərdən birinci xəlifə
Əbülqazi Sultan Hüseyn
Əbülqasim Yusif ibni-Əbüssac
Əbül'üla Gəncəvi
Əbulfəth xan, İsfahan hakimi
Əbülfəth, Vəkil Kərim xanın oğlu
Əbülfəttah ağa, İbrahim xanın oğlu
Əbülfida
Əlaüddövlə Zülqədər
Əlvənd Mirzə
Əlqas Mirzə, Şah Təhmasibin qardaşı
Əlqas Mirzə, Surxay Mirzənin qardaşı
Əli bəy
Əli bəy, Qara Osmanın oğlu
Əli bəy, Əmir Həmzə Üsminin oğlu
Əli bəy, zaxurlu
Əli bəy Cavanşir
Əli ibni-Heyşəm
Əliqulu Sail oğlu
Əliqulu xan (Əlişah), Nadir şahın qardaşı oğlu
Əliqulu məsum - bax Əliqulu Sail oğlu.
Əliqulu xan, Şirvan bəylərbəyisi
Əliqulu xan Sərdar
Əli Yəzid - bax Şərəfəddin Əli Yəzdi.
Əlimərdan xan Bəxtiyari
Əlimərdan xan Xəmsə Əli mirzə, imamqulu xanın oğlu
Əli paşa
Əlipənah bəy Əhməd bəy oğlu Bayat
Əliskəndər bəy Əhməd bəy oğlu Bayat
Əli sultan, Ərəşli
Əli sultan bəy

